*Bu kitab "**Seyid Əzim Şirvani.** Əsərləri. Üç cilddə. II cild"* (*Bakı, Elm, 1969*) *nəşri əsasında tərtib olunmuş və təkrar nəşrə hazırlanmışdır*

Tərtib edəni: **Süleyman Rüstəmov**

Redaktorlar: **Qara Namazov**
**Sənan İbrahimov**

**894.3611-dc 21**
**AZE**
**Şirvani Seyid Əzim. Seçilmiş əsərləri.** Üç cilddə. III cild. Bakı, "AVRASİYA PRESS", 2005, 288 səh.

Klassik Azərbaycan ədəbiyyatının böyük nümayəndəsi Seyid Əzim Şirvani bir müddət Şamaxıda açılmış məktəbdə müəllim olmuşdur. Böyük mütəfəkkirin müəllimlik fəaliyyəti onu yeni səpkidə əsərlər yazmağa sövq etmişdir. Seyid Əzimədək Azərbaycanda açılmış məktəblərdə fars şairi Sədi Şirazinin "Gülüstan" kitabını dərslik kimi keçirdilər. Təəssübkeş şairimiz təhsilimizi milliləşdirmək məqsədilə həmin kitabın müqabilində orta məktəb şagirdləri üçün "Rəbiül-ətfal" ("Uşaqların fəsli") adlı kitabını yazıb, orta məktəblərə dərslik kimi təqdim etmişdir. Şairin bu cildinə məhz həmin kitabı daxil edilmişdir. Bu kitab milli mövzular əsasında yazılmış son dərəcə yüksək tərbiyəvi əhəmiyyətə malik bir dərs vəsaitidir. Kitab həm də Azərbaycan pedaqogika, dərslikyazma tarixi üçün mühüm əhəmiyyət kəsb edir.

**ISBN 9952-421-01-8**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



# DİBAÇƏ

[...] Bəndeyi-bimiqdar, Seyyidi-xaksar ərbabi-fəhm və fərasətə və əshabi-kiyasətə ərz edir ki, bəzi mətalibi-aliyələr ki, idrakı cəmi bəni-növi-bəşərə azımdır, alimiqdar olan müsənniflər bəzi kitablarda əlfazi-qəlizeyi-şədidə ilə bəyan ediblər, ətfali-dəbistanın zehni dərkindən aciz və qasirdir. Və müşəxxəs və məlumdur ki, bizim diyarın əhli hər nə elm ki, kəsb edərlər – əyyami-tüfuliyyətdə kəsb edərlər. Fəlihaza, bu kitabi-müstətab ki, mərifətnameyi-müxtəsərdir, öz türki lisanımızda aşkar olan əlfaz və əshəl olan ibarətlər ilə səbt və rəbt olundu ki, ali olan mətalibdən tüllabi-dəbistan bəhrəmənd və feyziyab olsunlar. Çünki hicrətin 1294-cü ilinin rəbiül-əvvəl ayında ibtida olundu – "Rəbiül-ətfal" ismi ilə müsəmma qıldım.

## BAŞLANĞIC

Həmdi-bihəd xudayi-sübhanə –
Ki, çatıb feyzi kövnü imkanə!
"Mübdii kainatü müzhirihu,
Vəhdəhu lailahə illa hu*
Kənzi-məxfikən ol ülüvvməkan
İstədi zati olmağını əyan.
Qıldı məxluq xəlqi-imkani,
Ta ola zahir aləmə şani.
Küreyi-ərzi eylədi icad,
Gəldi ondan əyanə səbü şidad.
Oldu əncümlər, ey ülül-əbsar,
Didəbanani-nöh kəbudi-həsar.
Qəmərü tirə Zöhrə tapdı məhəl.
Şəmsü Mərrixü Müştərivü Zühəl
Hər birin bir fələkdə qıldı müqim,
Ta çata kainatə feyzi-əmim.
Fələki-həştüm oldu zati-biruc,
Ondadır heyətü sifati-büruc.
O fələk mənbəyi-səvabitdir,
Hükəmayə mədarı sabitdir.
Fələki-nöhhüm ərşi-əzəmdir,
Ərşdən fövqü sirri-mübhəmdir.
Neçə yüz min həkimi-danişvər
Bilməyib ərşdən o yanə xəbər.
Hükəmadən olubdu bil axir,
"La xəlau vəl aməla"** sadir,
Altı gün müddətində ol dana
Eylədi cümlə aləmi peyda.
Feyzini qıldı aləmə
Qüdrətin zahir oldu asari.
Qıldı bihərfü ləfzü sövtü nida,
Ta ola cümlə masiva peyda.

---

* Allah kainatı yaradandır, zahirə çıxarandır. O təkdir, ondan başqa Allah yoxdur (*ayə*).
** Nə boşdur, nə dolu.

Kafi-kon nunə olmamış vasil,
Oldu bu ərzü asiman hasil.
Xəlq edib aləmi məşiyyətlə,
Yoğurub xaki dəsti-qüdrətlə.
Xakə öz surətin əta qıldı,
Onu soltani-masiva qıldı.
Ona təlim qıldı əsmanı,
Bildi hər ismdən müsəmmanı.
Qılmış ikən onu xəlifeyi-ərz,
Cənnətin sirrin eylədi ona fərz.
Ona qıldı ənis Həvvani,
Qıldılar izdivaci-ruhani.
Gərçi zahirdə ol bir adəm idi,
Leyk batində çox müəzzəm idi.
Nuri-paki-Məhəmmədü Heydər
Olmuş idi o xakdə müzmər.
Zahiri xakü batiniydi nur,
Zərrə idi o nurə şöleyi-Tur.
Əsl odur, fər Həzrəti-Adəm,
Odu Musayədü Məsihadəm.
Nuru ol şahi-ənbiyanın əgər
Olmasaydı o xakdə müzmər,
Səcdə etməzdilər güruhi-mələk
Əmrinə tabe olmaz idi fələk.
Görsə idi o nuru gər şeytan,
Səcdə eylərdi Adəmə hər an.

## PEYĞƏMBƏRİN TƏRİFİ

Dəxi yüz töhfeyi-səlatü səlam,
Nə qədər var bu gərdişi-əcram,
Olsun ol şəxsə kim, müəyyəddir,
Ənbiya sərvəri Məhəmmədir.
“Qabəqövseyn” bəzminin şahi,
“Fətədəlla” süpehrinin mahi.
“Vəzzüha” vəsfi-mahi-rüxsari,
Rəmzi-”Vəlleyl” zülfünün tari.
Ol ki, nəleyni vermiş ərşə rəvac,
Ənbiya cümlə feyzinə möhtac.
Zatına yox zəmanə içrə nəzir,
Mehdiyü hadiyü bəşirü nəzir –
Kim, odur şəmsi-Yəsribü Bətha,
Şəbi-dacə cəmalı verdi ziya.
Münkəşəf ondan oldu sübhi-əzəl,
Münxəsəf ondan oldu Latü Cəsəl.
Odur ecazə mənbəyi-mütləq,
Barmağından qəmər olub münşəq.
Ona Quranı möcüzi-baqi –
Ki, qoyub aciz əhli-afaqi.
Gərçi ümmidi zahir ol mövla,
Leyk oldu müəllimi-əsma.
İlləti-mayəkunü məniyi-kün,
Mənbəyi-çeşməsari-elmi-lədün.
Sirri-tövhidü nəfsi-sərməddir,
Əhədü Əhmədü Məhəmmədir.
Xassə ol şahə kim, odur canım,
Dedi həq Mürtəzadır aslanım.
Harda kim, şiri-pürşücaətdir,
Özgələr mədhəti nə haçətdir.
Mürtəza vəsfinə yazıldı vərəq,
“Zəhəqəl-batilü və caəl-həqq”*
Ey xuda, xeyrətün-nisa həqqi,
O düri-bəhri-Müstəfa həqqi,

---

* “İza cəəl həqq zəhəqəl batil” haqq aralığa gələn zaman batil aradan çıxar (*ayə*).

Ciyəri-çaki-Müctəbayə qəsəm,
Xuni-məzlumi-Kərbəlayə qəsəm.
Mənə rahi-hidayət eylə əta,
Eylə mədhündə nitqimi guya.
Sənə layiq əgərçi yox əməlim,
Üzmə damani-Mürtəzadən əlim.
Bir də qismət elə ziyarətini,
Həm görüm həşrdə şəfaətini.
On bir övladına qulaməm mən,
Talibi-həzrəti-imaməm mən.
Ey xudavəndi-sahibi-qüdrət,
Qıl zamani-zühurini qismət.
Tez fərəc zahir eylə islamə,
Tez yetir işləri sərənçamə.
Zülmü cövr ilə kim, dolubdu cahan,
Tez elə ədlü qistini ehsan.
Gətirib zülmü cövr canə bizi!
Varis et ərzü asimanə bizi!

## NAZİMİN İFADƏSİ

Ol zamandan ki, etdi həft aba
Ümməhat izdivacini peyda,
Gəldi ondan vüc udə çox fərzənd.
Bəzi biəqlü bəzi danişmənd.
Mən dəxi bir yeganə fərzəndəm,
Deyiləm naxələf, xirədməndəm.
İki yüz əlli birdə bədi-həzar,
Əsri-Sultan Məhəmmədi-Qacar,
Rumə Əbdülməcid idi sultan,
Oldu darül-viladətim Şirvan.
Hansı Şirvan, o gülsitani-qədim –
Konda* Şirvanşəhilər oldu müqim.
Nə Şəmaxi ki, onda İzzəddin
Nəzmdən zahir etdi sehri-mübin.
Məsqətür-rəsi-paki-Xaqani,
Hünərin Zülfüqari-bürrani.
Nə Şəmaxi ki, onda sübhü məsa
Verdi rüxsari-şeri-Bədr ziya,
Nə Şəmaxi ki, onda təbi-Bahar
Etdi yüz min baharlər izhar.
Qıldı Rusiyyə çün onu təsxir,
Oldu rövnəqdə saniyi-Kəşmir.
Olmuş ikən səfadə rəşki-cinan,
Tapdı eynül-kəmaldən nöqsan.
Etdi Şirvanı payimali-məlal,
Rəcfətül-ərzü sədmeyi-zilzal.
Xəlqi-Şirvan olub pərakəndə,
Hər biri bir qəribə məskəndə.
Dağılıb, şəhri qoydular bərbad,
Etdilər Badkubəni abad.
Qaldı bir parə bisərü saman –
Ki, yoxuydu fərarə tabü təvan.
İmperaturi-Rusi-valaşan
Əhli-Şirvanə qıldı çox ehsan.

---
* Ki onda

Qıldı çox xanə xəlq üçün təmir,
Leyk təqdirə olmadı tədbir.
Əhli-Şirvan hənuz edəllər hesab
Küreyi-ərzi qətreyi-simab.
Müddəti-ömrdə məni-dilgir
Neçə yol xanə etmişəm təmir.
Eyləyib axirət evin bərbad,
Eylədim xanimanımı abad.
Vəzi-həml etdi çün məni madər,
Pədərim dari-xüldə etdi səfər.
Adımı qoydular çü Seyyid Əzim,
Düşdü bəhri-qəmə bu dürri-yetim.
Oldum ol gün ki, çardəh salə,
Düşmədim fikri-dövlətü malə.
Eylədim arifanə kəsbi-ülum,
Gah Bəğdad məskənim, gah Rum,
Eylədim Misrü Şamdə məva,
Gah yerim Yəsrib oldu, gah Bətha.
Oxudum nəhvü sərfü fiqhü üsul,
Hikmətü heyət eylədim məhsul.
Ta ki müstəcmii-ülum oldum,
Nəzəri-əhli-əsrə şum oldum.
Olmadı çünki məndə malü mənal,
Mənə öz elmim oldu vizrü vəbal.
Eylədim ta ki hər büsatə güzər,
Məni gördükdə xəlq söylədilər:
Budu gəldi səfahətin kani,
Hacı Seyyid Əzim Şirvani!
Küreyi-ərzi fərz edər səyyar,
Zəlzələ baisin bilibdi buxar.
Söyləyir şəms qütbi-aləmdir,
Fələki-nöhhüm ərşi-əzəmdir.
Bir görün ki, olubdu bu cahil
İnqilabi-ənasirə qail.
Söyləyir gah su həvayə dönər,
Gah həva su olub səmadən enər.

Ab olur atəşü həm atəş ab,
“İnnə hazəl məqalə şeyün ücab”*
Allah, Allah, bu küfrü tüğyandır!
Demək olmaz ki, bu müsəlmandır!
Ey səfihü dəbəngü nahəmvar,
Bu xəyalından eylə istiğfar!
Bunu təlqin edib sənə şeytan,
Şəri-paki-Mühəmmədidən utan.
Hükəma qövlünün nədir səməri?
Qalmasın fəlsəfilərin əsəri!
Var cahanda gözəl hekayətlər,
Neçə min nazənin rəvayətlər.
Nəzm qıl “Qisseyi-Güləndam”i,
Eylə məlum eşqi-Bəhrami.
Kərəmin Əsli ilə yaz vəslin,
Kəşf qıl Əsli xanımın əslin.
De “Koroğlu”, cahanı canə gətir,
Qıratın vəsfini bəyanə gətir.
Söylə nəqli-Qəribdən hərdəm –
Ki, onun yarı idi Şahsənəm.
Eşidənlər kəlamın olsun şad,
Söyləsinlər ki, mərhəba, ustad!
Qala aləmdə yadigar sözün,
Ola sövqati-hər diyar sözün.
Nə gərəkdir hekayəti-xilqət,
Nə gərəkdir bizə o keyfiyyət?
Bu nə sözdür ki, xəlqi-kövnü fəsad
Nə qərar ilə oldular iyçad?!
Nə gərəkdir fəzilət izharı,
Həq-təala bilir bu əsrarı.
Olmayıbdır əgər sözün kutah,
Başla nəqli-Koroğlu, bismillah!

---

* Bu söz təəccüblü bir şeydir.

## KİTABIN YAZILMA SƏBƏBİ

Bu səbəbdən mən, ey həmidəsiyər,
Eylədim nəzm çox hekayətlər.
Çünki gördüm hərifi naqabil,
Özümü əmdən eylədim çahil.
Sənə saz olmasa zəmaneyi-fən,
Özüvü saz qıl zəmanəyə sən.
Xəlqi gördün olubla divanə,
Sən də divanə ol, nə fərzanə.
Xoş məsəldir bu kim, palazə bürün,
Getsə hər yanə el, o yanə sürün.
Xah ruminəjadü xahi Zəng,
Xəlq ilə xasiyətdə ol həmrəng.
Mərifət şərhin etmə nadanə,
Səni eylər hesab divanə.
Neçə kim, bu hekayəti-ziba
Sənə bu maçəranı eylər əda.

## HEKAYƏT

Var idi bir vəziri-dəryadil,
Elmi-rəmlü nüçumdə kamil.
Bir gün ərz eylədi gəlib şahə –
Key,* çatan hökmü mehr ilə mahə!
Tapmışam mən nücum ilə ki, həman
Yağacaq üç gün, üç gecə baran.
Olacaq sulərə o su məxlut,
Hər kəs ondan içə olur məxbut.
Götürək abi-safdən neçə xüm,
Ta ki bizdən fərasət olmaya güm.
İçibən xəlq olanda divanə,
Biz qalaq xəlq içində fərzanə.

* Ki ey

Şah onun gördü rəyini mərbut,
Abi-xalisdən etdilər məzbut.
Vəqt kim, yağdı ol diyarə mətər,
Oldu məxlut sulərə yeksər.
Hər kim içdisə, oldu divanə,
Qaldı şahü vəzir fərzanə.
Gündə divanələr edirdi xüruş,
Nə libasü rida, nə fərşü füruş.
Sözləri çümlə hərzəvü həzyan,
Bəzi üryanü bəzi şeyhəkünan.
İt ularsa, bular ulardı təmam,
Qarışıb bir-birə xəvasü əvam.
Baxdılar, gördülər səğirü kəbir
Oxşamaz özlərinə şahü vəzir.
Dedilər ol güruhi-əbləhü dəng,
Bizə bunlar neçin deyil həmrəng?
Bəs vəzir ilə şəh olubla cünun,
Səltənətdən edin şəhi birun!
Çünki bunlar olubla divanə,
Bizə bir şəh gərəkdi fərzanə.
Bəs o gün ol güruhi-sərkəşü şum
Qıldı darül-imarə üstə hücum.
Gördü çün şəh o gün o əhvali,
Oldu mənzuri-xəlqdən hali.
Dedi kim, ey vəzir, eylə şitab,
Abi-məxlutdən gətir bir qab,
İçdi ondan o iki fərzanə,
Oldular xəlq kimi divanə.
Atdılar xəlq tək müəlləqlər,
Sanki oynar həvadə ləqləqlər.
Yırtdılar camə, çəkdilər əfğan,
Oldular hər libasdən üryan.
Dedilər ol güruhi-naqabil,
İndi şahü vəzir olub aqil.
Ey gözüm nuru, böylədir hikmət,
Cinsdən cins eyləməz nifrət.

Binəva şəxs binəvanı sevər,
Necə kim, kah kəhrübanı sevər.
Necə alim qaçırsa nadandan,
Bil yəqin kim, bu həm qaçar ondan.
Yox məzaqi-kəmal cahildə,
Nolduğun* fəhm qılmaz aqildə.
Aqil ol şəxsdir ki, leylü nəhar
Edə xəlqin məzaqına rəftar.

---
* Nə olduğun

## MİRCƏFƏRƏ XİTAB

Çəfər, ey qönçeyi-gülüstanım!
Ey mənim bülbüli-xoşəlhanım!
İki yüz yetmiş üçdə, bəd həzar,
Mötədil fəsl idi, zəmani-bahar.
Səni həq mən fəqirə qıldı əta,
Kəbeyi-qəlbimə yetişdi səfa.
On beş ildir ki, ey ətayi-əzim,
Sənə adab eylərəm təlim.
Yetibən əqlə sərfəraz oldun,
Dəxi məndən ki, biniyaz oldun,
Əql peyğəmbərin qılıb rəhbər,
Öyrən adabi-məzhəbi Cəfər!
Demirəm mən gedən təriq ilə get,
Əqli tut, ol gözəl rəfiq ilə get.
Sənə bürhan deyil təriqi-pədər,
Gör nə yol getdi zadeyi-Azər.
Demirəm rus, ya müsəlman ol,
Hər nə olsan get, əhli-ürfan ol.
Demirəm sünnü ol və ya şiə,
Tək hədəf olma tiri-təşniə.
Demirəm şeyxi ol və ya babi,
Hər nə olsan tək olma qüllabi.
Mən özüm şiəyəm, budur sifətim,
Leyk əshabə yox müxalifətim.
Gər Əbubəkrlə Ömər, Osman
Zülm ediblərsə, həqq edər divan.
Oların barəsində etmə güman,
Edər imanə suyi-zənn ziyan.
Zülm ediblərsə filməsəl şahə,
Oları vagüzar et Allahə.
Dilüvü saxla lənət etməkdən,
Qeyri şəxsə şəmatət etməkdən.
Neçə illər Əliyyi-İmranə
Əhli-İran deyirdi əfsanə.
Sonra nöqsanların bilib naçar,
Etdilər cümlə tövbə-istiğfar.

Olmaya ruzi-həşr, ey müztər,
Ola xəsmin cənab peyğəmbər!
İstəyirsən əgər təriqi-nicat,
Ali-ətharə söylə sən sələvat!

***

Ey gözüm nuru, ey ətayi-xuda,
Sənə Şirvanda oldu nəşvü nüma.
Lilləhül-həmd, xitteyi-Şirvan
Saniyi-İsfəhandır əlan.
Gərçi viranə oldu zəlzələdən,
Çıxmayıb mərifət bu mərhələdən.
Vardır hər guşədə yüz əhli-kəmal,
Hər biri əhli-elmü sahibi-hal.
Xassə kim, abü xakinin əsəri
Qabili-tərbiyət qılır həcəri.
Xassə kim, padşahi-kişvəri-Rus
Edəli təxti-ədlü dadə cülus,
Eləyib tərbiyət kəmal əhlin,
Gətirib halə hər məhal əhlin.
Hər vilayətdə açdı məktəblər,
Çatdılar feyzə əhli-mənsəblər.
Oxunur onda müxtəlif dillər,
Həll olur onda cümlə müşküllər.
Ey oğul, bu dəlili-bişəkdir,
Adəmi-bisəvad eşşəkdir.
Rəmzi – "həl yəstəvi"* müdəlləl imiş,
Bilməyəndən bilən kəs əfzəl imiş.
Həq buyurmuş ki, ixtilafi-lisan
Nemətimdəndir, ey güruhi-cahan!
Kim ki, bəs bir dil eyləsə hasil,
Oldu bir nemətə o kəs vasil.
Cəhd qıl neməti-təmamə yetiş,
Elm təhsil qıl, məqamə yetiş.
Ey oğul, hər lisanə ol rağib,
Xassə ol rus elminə talib.

---

* [Bilənlə bilməyən] bərabərdirmi?

Onlara ehtiyacımız çoxdur,
Bilməsək dil, əlacımız yoxdur.
Çatmayıb şərdən bizə bu xəbər –
Ki, ərəbdən siva dil oldu hədər.
Nə ərəbdir xuda, nə rum, nə zəng,
Nə həbəşdir, nə zəngbarü firəng,
Xah boq, xah tanrı, xah xuda
Birdi mənada, ey düri-yekta.
Ləfz edirsə ifadə mənanı,
Sərf edər əhli-mərifət anı.

## HƏDİS

Bir hədisi-səhihdir bu xəbər,
Söyləyibdir cənab peyğəmbər –
Ki, Süleyman nəbi əleyhisəlam
Hər güruhun dilin bilirdi təmam.
Ey oğul, bil bu rəmzdən mətləb
Deyil əlhəq lisan lisani-ərəb.
Həqq özü hər lisanə danadır, ,
Hər lisan həq yanında zibadır.
Var bizim dörd kitabımız, ari,
Hər biri bir lisan ilə cari.
Biri "Tövrat" idi giranmayə,
Gəldi İbri dilində Musayə.
Biri "İncil" idi, birisi "Zəbur",
Hər biri bir lisan ilə məşhur.
Çün Mühəmməd ərəbdən etdi zühur,
Öz lisanında qıldı həq məmur.
Türkdən göndərəydi gər ani,
Türki dildə olardı "Qurani".
Xassə kim, məzhəbi-imamiyyə,
Xah Bağdadü, xah Şamiyyə
Cümlə bu etiqadə guyadır –
Ki, nəbi hər lisanə danadır.
Xah rusi lisanü, xah firəng,
Bilir ani imami-bafərhəng.
Bir lisani ki, bəs bilirmiş imam
Sən də bilsən nə eybi, ey bədnam?

## HEKAYƏT

Mülki-Şirvanda bir haputlu nam
Vardı bir qəryə, xəlqi xeyli əvam.
Molla Kazım adında bir şair –
Ki, haman qəryədən olub zahir,
Bu hədisə olubdur ol havi,
Dedi: – "Əl-öhdətü ələr-ravi"*
Xilqəti-aləm oldu çünki tamam,
Hər güruh etdi bir dilə iqdam.
Qaldı yerdə haputlu sərgərdan.
Etdilər ərz, key xudayi-cahan,
Xah rumivü, xah rusivü zəng,
Xah tatarü türkü hindü firəng,
Bir zəban hər güruhə etdin əta,
Bizə də bir zəban ver, ey mövla!
Bu xitab oldu rəbbi-izzətdən –
Ki, düşün siz bu gunə niyyətdən.
İzzətim həqqi qalmayıb bir dil
Ki, onunla sizi edim xoşdil.
Hər nə gəlsə, gedin dəhanüvüzə
Onu cari edin zəbanüvüzə.

## DİLLƏRİN MÜXTƏLİFLİYİNİN SƏBƏBİ

Cəfər, ey gəştiyi-ümidə nicat!
Ey ləbin nəşəbəxşi-abi-həyat!
Əhli-tarix edib bu növ bəyan,
Nuhdən sonra zümreyi-insan
Dəxi tufandan etdilər pərva.
Bir uca qəsr yapdılar, ziba –
Ki, əgər olsa bir də bir tufan
Etməsin əhli-qəsrə hiç ziyan.
Bu sifət qəsri bir neçə ustad
Ərzi-Babildə qıldılar bünyad.

---
* Babalı rəvayət edənin boynuna

Oldu ol vəqt kim, o qəsr təmam,
Münhədim qıldı qadirü əllam.
Bir gün ol büqeyi-fələkbünyan
Oldu sövti-mühib ilə viran.
Vəhşətindən diyari-Babildə
Qaldı xəlqin dili təbəlbüldə.
Hər güruh etdi bir zəban peyda,
Müxtəlif oldu əlsinə yekca.
Leyk hər bir lisanı, ey dana,
Özünə nisbət eyləyibdi xuda.
Bil ki, hər bir lisan xudanındır,
Olma biganə, aşinanındır.

## MİRCƏFƏRƏ XİTAB

Ey oğul, bil ki, feyzi-rəbbani
Neçə əqsam edibdi dünyani.
Bu qədər bil ki, xəlqi-həft iqlim
Rübi-məskunda kim, olubla müqim
Lövndə, təbdə deyil yeksan,
Müxtəlifdir təbayeyi-insan.
Məsələn, mülki-Zəngibarü Həbəş.
Harrdır, xəlqi həm olur sərkəş.
Təlxgöftar olulla, tündmizac,
Qılmağa şərh bu deyil möhtac.
Təbdə sərddir çü mülki-şimal,.
Xəlqinə tünd olur dəxi əhval.
Oların baisi hərarətdir,
Bulara vasitə bürudətdir.
Etidalə qəribdir İran,
Məsələn, İsfəhan, həm Tehran.
Bu yerin xəlqi cümlə zirək olur,
Xoşzəban, xoşmizacü göyçək olur.
Kim ki, bir yerdə etsə nəşvü nüma,
Tərbiyət eylər ani abü həva.
Necə kim, xaki-xitteyi-Kaşan
Yetirir əhlini məxufü cəban.
Necə kim, var şüyui Bəğdadın,
Əhli tənbəl olur o bərbadın.
Necə abü havadə var təsir,
Həm səbəbdir bu əmrə nütfəvü şir.
Ey xoş ol nütfeyi-bülənd-iqbal
Ola bir pak sülbdən inzal,
Edə bir bəççədani-paki məqərr,
Verə surət ona xudayi-süvər,
Onu gərdun dəmi-viladətdə
Doğa bir mötədil vilayətdə,
Şiri-xalis, səfalı abü həva,
Verə ol tifli-pakə nəşvü nüma,
Hiç şək yox, o əhli-hal olur,
Təbi xoş, sahibi-kəmal olur.

Bavücudi ki, yoxdu bunda sözüm,
Leyk bu əmrə qailəm mən özüm –
Ki, nə qədr olsa şəxs naqabil,
Tərbiyətlə yenə olur kamil.
Nə o kamil ki, əkməliyyəti var,
Cüzünün küllə mədxəliyyəti var.
Cəhd qıl bəs sütudə-əxlaq ol,
Əhli-zövq ol, məlihi-afaq ol.
Xoşzəban ol, oğul, gülər üzlü,
Milh göftarlı, şəkər sözlü.
Cəhd qıl ta ki ey nəticeyi-nur,
Verəsən qəlbi-mömininə sürur.
Olma dilbəstə, ol cəbini güşad,
Səni gördükdə mömin olsun şad.
Olma dünyada qəmtərirü əbus –
Ki, görənlər üzün ola məyus.

## HƏDİS

Bu hədisi cənab peyğəmbər
Verdi əshabi-cannisarə xəbər:
Kim ki, bir mömini qıla xəndan
Olur əhli-behişti-cavidan.
Mömini-xas rugüşadə gərək,
Sözünün ləzzəti ziyadə gərək.

## HEKAYƏT

Vardı peyğəmbər əsri bir təlxək,
Hər sözü kani-göftguyə nəmək.
Gün də bir rəng ilə o fərruxdəm
Güldürürdü xəlayiqi hərdəm.
Dedi bir gün cənab peyğəmbər:
Kim ki, dünyadə olsa löbətgər,
Ruzi-məhşər qoyanda mizani,
Gətirir məhşərə xuda ani;
Boynu nazik çü meyvə saplağı,
Başı manəndeyi-Öhöd dağı.

Bu sifətdə gəlir o səhrayə,
Əhli-məhşər gülər o rüsvayə.
Ol oyunbaz şəxs hazir imiş,
Süxəni-Müstəfayə nazir imiş.
Tez durub ərz qıldı, key mövla,
Ey şəhənşahi-aləmi-məna,
Sənə qurban olum məni-bikəs!
Böyük oynum qalıb qiyamətə bəs.
Oldu bu sözlə Müstəfa xəndan,
Əfv qıldı onu xudayi-cahan.
Mömini vacib oldu güldürmək,
Eybi olmaz ki, sözdə olsa nəmək.

## HEKAYƏT

Dedi bir gün rəsuli-dəryadil,
Qocalar cənnətə deyil daxil.
Cənnət əhli olur təmami cəvan,
Qədi-mövzunu rəşki-sərvi-rəvan.
Bir qarı övrət eylədi fəryad –
Ki, nədir cürmüm, ey fəriştə-nəhad?!
Sənə kim, mən gətirmişəm iman,
Etiqadımda yox mənim nöqsan.
Qaimül-leylü saimüd-dəhrəm,
Ay kimi bunda şöhreyi-şəhrəm.
Çəkdi fəryad, eylədi nalə,
Müstəfa xəndə qıldı bu halə.
Dedi peyğəmbəri-sütudə-şiyəm,
Bilmədin, ey əcuzə, eyləmə qəm!
Qocanı döndərib cavan eylər,
Sonra həq daxili-cinan eylər.

## PEYĞƏMBƏRİN ƏLİ İLƏ ZARAFATI

Bir gecə Yəsrib içrə ali-əba
Bir təbəqdə yeyirdilər xurma.
Nə yedisə rəsuli-aləmiyan,
Töxmini birbəbir onun pünhan
Qoydu şiri-xuda qabağında,
Zikr olundu bu söz dodağında:

Ya Əli, zahir oldu indi ki, sən –
Xurmanı hamıdan füzun yemisən.
Gör, qabağımda töxmi-xurma yox,
Var qabağında hamımızdan çox.
Dedi Heydər: – Sən, ey səxa kanı,
Udmusan töxmi ilə xurmanı.
Bu sözə güldü cümlə ali-əba,
Mərhəba söylədi rəsuli-xuda.

## ƏLİNİN ƏSHABƏLƏRLƏ ZARAFATI

Bir zaman Kufədən şəhi-dövran
Şamə bir qasid eyləmişdi rəvan.
Gəldi ol qasid, ibn-Süfyanə
Mətləbin şərh qıldı mərdanə.,
Qasidin ol əmiri-bipərva
Saqqalın pak yoldu, saldı yola.
Görcək ol piri sərvəri-mərdan
Oldu biixtiyar xəndəkünan.
Dedi: – Ey pir, xoşnişan gəldin,
Pir getdin, əcəb cavan gəldin!
Bu kəramətdü, zadeyi-Süfyan –
Ki, səni pir ikən edibdü cavan.

## ƏLİNİN ÖMƏR VƏ ƏBUBƏKRLƏ ZARAFATI

Bir gün atlandı Heydərü Səfdər,
Sağda Siddiq, sol yanında Ömər.
Qaməti-Mürtəza idi kutah,
Çün uzun ol iki vəliyullah.
Bu sözü Heydərə səmahətlə
Dedilər xəndəvü zərafətlə:
"Əntə fi beynina kənuni-ləna.
Qalə in ləm əkun fəəntüm la"?*

---

* Sən bizim aramızda "لنا" ləna, yəni: bizim üçün, bizimki sözünün "ن" (n) hərfi kimisən. Dedi: mən olmasam (yəni: "n" hərfi olmasa) siz لا (la) (heç, yox, heçlik) oxunarsınız.

Oldular bu cəvabdən xəndan,
Dedilər: – Ya Əli, deyil böhtan;
Çünki Əhmədlə nuri-vahidsən,
Etdiyin iddəayə şahidsən.
Olmasaydın sən, ey sülaleyi-pak,
Xəlq olunmazdı ərz ilə əflak.
Baisi-cümlə masivasən sən,
Şəmsi-həq, nuri-övliyasən sən.
Bir günüm sənsiz olmasın, davər,
Olmasaydın həlak olurdu Ömər.
Ey oğul, bil ki, övliyayi-xuda
Eyləyiblər zərafəti-ziba.
Hər o söhbət ki, yoxdur onda nəmək,
Söyləyənçün vəbaldır bişək.

## ŞAHIN MÜLAZİMİ İLƏ ZARAFATI

Qıldı bir padşah əzmi-şikar,
İsti oldu o gün həva büsyar.
Cübbəsin padşahü şəhzadə
Verdilər çakərə o səhradə.
Duşinə almış idi onlari,
Olmuş idi onun giran bari.
Şah ona söylədi zərafətlə,
Türfə eyham ilə, işarətlə,
Dedi şəh, eyləyib ona xəndə:
Vardu bir eşşəyin yükü səndə.
O mülazim qəribə zirək idi,
Xeyli hazırcavabü təlxək idi.
Dedi: – Şaha, tüküm nə xər tüküdür,
Yüküm eşşəklə bir qoduq yüküdür.
Oldu xəndan şahi-aləmiyan,
Etdi ol xoşzəbanə çox ehsan.

## OĞLUMA NƏSİHƏT

Ey oğul, şahə eyləmə cürət,
Şah təbinə özgədir halət.
Mütələvvin olur təbiəti-şah,
Şirlərdir bular, nə kim rubah.
Gah mədhindən eyləyir nifrət,
Gah düşnaminə verir xələt.
Şairü şirü şahdən həzər et!
Onların xərgəhinə az güzər et.
Bunların hər üçü olur məğrur,
Hər üçündə əyandü kibrü qürur.
Səni təng etsə guşeyi-vəhdət,
Bari həmcinsin ilə qıl ülfət.
Mail olma özündən əlayə,
Başını salma şurü qovğayə.
Bunlar ilə çox eylədim ülfət,
Hasilim olmadı becüz zəhmət.

HƏDİS

Olsa mehmanın, ey pəsər, kafər,
Ona ikram eylə, cani-pədər.
"Əkrimüz-zeyfə"* macərasın oxu –
Ki, bu mənayədir işarə çoxu.

HƏZRƏTİ-İBRAHİM ƏHVALATI

Bir sitarəpərəst şəxsi-əlil
Əzqəza oldu mehmani-Xəlil.
Süfrə hazır qılıb Xəlilullah
Dedi ol şəxsi-pirə: Bismillah!
Gördü ol şəxs meyl qıldı ğiza,
Etmədi zikr nami-bari-xuda.
Təngdil oldu bəs cənab Xəlil,
Bildi kim, bütpərəstdir o əlil.

---
* Qonağa hörmət edin.

Oldu ilham: – Key Xəlili-xuda!
Bir gecə verdin ol əlilə ğiza,
Demədi vəqti-əkl “bismillah”,
Oldun ol bütpərəstdən ikrah.
Yetmiş ildir ki, çəkməyib namım,
Olmayıb qət ondan ənamım.
Sübhü şam ol əlilü sərgərdan,
Xani-ehsanıma olur mehman.
Dari-dünyadə, ey mələkmənzər,
Etmərəm qəti-ruziyi-kafər.
Leyk üqbadə ol bədəxtərü şum
Nemətimdən mənim olur məhrum.

## OĞLUMA NƏSİHƏT

Cəfər, ey neməti-xudayi-cahan,
Olsa bir şəxs əgər sənə mehman,
Elə ol şəxsə ehtirami-təmam,
Xidmətində dolan bəsani-qulam.
Nə ğiza xahiş etsə, övladır,
Demə bu ziştdir, o zibadır. [...]
Ey oğul, olsa süfrədə nanın,
Tikəsin sayma mərdi-mehmanın.

BİR ƏRƏBİN MÜAVİYƏYƏ QONAQ OLMASI

İbn-Süfyanə Şamdə bir şəb
Mehman oldu bir fəsih ərəb.
Quzu büryani düzdülər xanə,
Ol ərəb əkl edirdi şiranə.
Quzunun parçalardı əzasın,
Sındırıb kəlləsin, qabırqasın.
Bunu çün gördü zadeyi-Süfyan,
Dedi kim, ey rəşid olan mehman!
Bu quzuyla xüsumətin var imiş,
Görünür kim, ədavətin var imiş.
Səni buynuzlayıb atası bunun,
Ya ki bir xişü əqrəbası bunun?
Dedi kim, ey xəlifeyi-dövran,
Oldu büryanə xatirin büryan?
Bəs sənə süd verib anası bunun,
Yoxsa yoxdur bir iqtizası bunun?
Bu hekayətdən ötdü bir saət,
Yenə tapdı Müaviyə fürsət.
Dedi: – Löqməndə, ey ərəb, tük var,
Eyləmə qəflət, olgilən huşyar.
Löqməni saldı, durdu mərdi-ərəb,
Sanki divanə oldu, etdi qəzəb.
Yeməyib, bəzmdən çıxıb getdi,
İbn-Sufyanı şərmsar etdi.

## HƏCCACIN SEYİDLƏRİ QIRMASI

Necə ki, Yusif-ibn Həccacı
Nəql edirlər o sahibi-tacı,
Böylə mərr etmiş idi ol əbtər –
Kim, ola qətl ali-peyğəmbər.
Neçə yüz ali-Əhmədi ol ənid
Elədi büğzi-batin ilə şəhid.
Var idi köşkünün iki babı –
Ki, rümuzun bilirdi əshabı.
Birisi babi-qətlü biri aman,
Pasibanlar bilirdi rəmzi-nihan.
Ali-Muxtarı eyləyib ehzar,
Məclisə ol pəlidi-hiyləşüar,
Göftgudən sora o bədtiynət,
Cari eylərdi getməyə rüsxət.
Hansının qanını bileydi mübah,
Babi-qətli ona görürdü səlah,
Çıxcağın babi-qətldən o nəbil,
Pasibanlar onu edirdi qətil.
Gəldi bir seyyid öz ayağı ilə,
Göftku eylədi o yağı ilə.
Dedi: – Ey bədxisalü bədkirdar,
Düşməni-ali-Əhmədi-Muxtar,
Sənə neylibdir ali-peyğəmbər –
Ki, bizi qətl edirsən, ey kafər?
Düşməni-Mürtəzavü Heydərsən,
Sən məgər kim, cühudi-Xeybərsən.
Olacaq, ey ləini-bipərva,
Ruzi-məhşərdə düşmənin Zəhra.
Lənəti-həqqə sən düçar olasan,
İki aləmdə xarü zar olasan.
Mürşüdün kim, sənin Muaviyədir,
Mənzilin ruzi-həşr haviyədir.
Ruzi-məhşərdə ol xudayi-qəfur
Səni etsin Yezid ilə məhşur.
Olmusan düşməni-şəhi-lövlak,
Sən kimi yoxdu mürtədi-bibak.

Xaneyi-dini etmisən viran,
Lənət etsin sənə xudayi-cahan.
Qıldın ali-Xəlili sən nabud,
Yanacaqsan səqərdə, ey Nəmrud!
Hansı kafər deyər sənə islam?
Eylədin ali-Müstəfanı təmam.
Şümrdən sən bətərsən, ey məlun!
Aləmi zülmün eyləyib məhzun.
Nə desəm azdır, ey yəhud, sənə!
Lən oxur gəbr ilə cəhud sənə.
Hansı bir qapıdan olum ixrac.
Mənə vazehdir indi, ey Həccac,
Dedi Həccac: – Ey bülənd-əxtər,
Get səlamət qapıdan eylə güzər.
Özüvü qıl uzaq nədamətdən,
Çıx kənarə dəri-səlamətdən.
O dəm ol seyyidi-niku-kirdar
O səlamət qapıdan etdi güzar.
Xəlq qaldı bu halətə heyran.
Qıldı Həccac onu neçin ehsan.
Yalvarıb ağlayanları ol ənid
Eyləyirdi görən zamanda şəhid.
Ona bu seyyid eylədi nifrin,
Dedi yüz föhş, vermədi təmkin.
Əvəzi-föhş eylədi ehsan,
Çox təəccüblü işdi bu ondan.
Bir nəfər bu əcəb işi filhal
Qıldı həccacdən bu nəhv sual:
– Ey əmiri-cəlili-qəhrşiar,
Yoxdu qəlbində rəhmdən asar.
Sənə nifrin dedi o bipərva,
Nə səbəb eylədin sən onu rəha?
Dedi: – Bu işdə bir həqaiq var,
Rəmz var, nüktə var, dəqaiq var.
Mən necə eyləyim ona azar –
Ki, olum dəhrdə xəyanətkar.
Məsləhət eylədi mənə, həqqa
Mən də qıldım səlahını ifşa

Məndə yox rəhm bir müsəlmanə,
Baxmaram qeyzü qəhri-sübhanə.
Bilmərəm tarı var, peyəmbər var,
Leyk xainliyə yoxumdu şiar.
Məsləhət eyləsə mənə bir kəs,
Etmənəm mən ona xəyanət bəs.
Yüz ola düşməni-cəfapişə
Etmənəm mən xəyanət əndişə.

## HƏCCAC İLƏ DƏRVİŞİN SÖHBƏTİ

Bir duasi qəbul olan dərviş
Saldı Bağdad şəhrinə təşviş.
Hər nə hacətçün eyləsəydi dua,
O duani qəbul edərdi xuda.
Onu həccac eylədi ehzar,
Dedi: – Qıl bir duayi-xeyr izhar.
Əl götürdi, dedi: Xudavənda,
Cismdən canını sən eylə cüda!
Dedi Həccac: – Ey məlaikxu,
Səni tari, nə bəd duadır bu?
Dedi: – Bu bir duayi-əhsəndir,
Həm sənə, həm bizə mühəssəndir.
Sən ölüb etməsən günahi-ziyad,
Sitəmindən cahan olur azad.
Nə gərəkdir sənə bu təxtü bu tac –
Ki, olub payimal hər möhtac.
Mərdümazarlıq yaman işdir,
Belə qalmaqdan ölməyin xoşdur.

## ALİMİN ZALIM PADŞAHA CAVABI

Dedi bir əhli-elmə bir zalim –
Key olan şər sirrinə alim!
Mənim üçün buyur ibadətdən,
Hansı əfzəldi cümlə taətdən?
Dedi: – Ey padşahi-zülmşitab,
Sənə əfzəldi hər bir işdən xab,

Ta yatan vəqt, ey fələkkirdar,
Görməyə xəlq bir nəfər azar.
Padşalərdə ədl əhsəndir,
Fitnənin yatmağı mühəssəndir.

## NUŞİRƏVANIN OVA GETMƏSİ

Nəql edirlər ki, şahi-Nuşirvan
Oldu bir türfə seydgahə rəvan.
Tutdular seyd kim, kəbab edələr,
Şahi-dövranı kamiyab edələr.
Bir qulam oldu rustayə dəvan,
Ta gedib duz gətirsin ol əlan.
Dedi Nuşirəvan ədalət ilə,
Duzu al, ey qulam, qiymət ilə.
Töycüyə etməsinlər ani hesab,
Dağılıb olmasın bu kənd xərab.
Dedilər: – Ey şəhi-sitarə-məhəl,
Belə az nəsnədən yetər nə xələl?
Dedi: – Bünyadi-zülm dünyadə
Az olub, ey güruhi-dilsadə.
Sonradan kim ki, gəldi, etdi ziyad,
Qıldılar xanimanları bərbad.
Yesə bir sib əgər şəhi-baqi,
Olu viran rəiyyətin baği.
Beş yumurta əgər yesə soltan,
Ləşkəri min toyuq edər büryan.
Dari-dünyadə qalmaz ol qəddar,
Qalır ol şumə lənəti-büsyar.
Zülmdən yer üzündə ot bitməz,
Zülmü soltan edəndə kim etməz?
Padşah etməsə ədalət əgər,
Olur əlbəttə dəhr zirü zəbər.

## ALİMLƏRƏ HÖRMƏT HAQQINDA MOİZƏ

Cəfər, ey nuri-dideyi-Seyyid,
Qönçeyi-novrəsideyi-Seyyid,
Üləma həqqini rəayət qıl,
Əhli-elmə həmişə hörmət qıl.
Demə bu kafər, ol müsəlmandır,
Hər kimin elmi var – o, insandır.
Elmsiz adəmi xudayi-cəlil.
Dedi: – "Ən amü bəl əzəllü səbil"*,
Babamız Adəm ol səfiyullah
Elmi-əsmayə oldu çün agah.
Ona yeksər məlayik etdi sücud,
Səcdəsin fərz eylədi məbud.
Elmdən oldu həzrəti-Loğman
Hikmət ilə səramədi-dövran.
Elm bir nur, cəhl zülmətdir,
Cəhl duzəxdir, elm cənnətdir.
Üləma olmasa cahanda, yəqin
Olacaq paymal şəri-mübin.
Üləma varisi-şəriətdir,
Füqəra baisi-hidayətdir.
Əhli-təfsir açıbla Qurani,
Çıxarıblar vüzuha mənani.
Kimdi gör, xaşeyi-cənabi-xuda,
Dedi həq: – "Min ibadihil-üləma"**
Alimə kim ki, eyləməz hörmət
O deyildir peyəmbərə ümmət.
Sənə hər kimsə elm edər təlim,
Ona vacibdir eyləmək təzim.
Harda görsən, ona səlam eylə,
Baş əyib qul tək ehtiram eylə.
Qeyrini vəsf qılma yanında,
Sən dur, ol söyləyən zamanında.

---

* Avam həmişə zillətli yoldadır.
** Onun [Allahın] qullarından biri alimlərdir.

İznsiz etmə xidmətində cülus,
Olma zəcrindən, ey pəsər, məyus.
Adəm ol, incimə qiraətdən,
Çubi-molla çıxıbdu cənnətdən.
“Gülsitan” içrə bülbüli-Şiraz
Farsilə edib bu nəğməni saz:
“Padşahi pəsər beməktəb dad,
Lövhi-siminş dər kənar nəhad.
Bər səri-lövhi-u nəviştə bezər:
Cövri-ustad beh zimehri-pədər”*.
Bil ki, ustadın ey rəşid pəsər,
Sənə ruhaniyətdə oldu pədər.
Pədərin bir mənəm, bir ustadın,
Cəhd qıl yaxşı çıxmağa adın.
Səy qıl, aqi-valideyn olma,
Ziştü mərdudi-xafiqeyn olma.
Eylə ustadüvə həmişə dua,
Məğfirət qıl tələb xudadən ona.
Olma ol tifl kimi sən bədzat –
Ki, öz ustadına dilərdi məmat.

## MƏKTƏBLİ İLƏ MÜƏLLİMİN ƏHVALATI

Bir uşaq incimişdi məktəbdən,
Dedi: – Ey xaliqi-zəminü zəmən,
Bir ölüm ver bizim bu ustadə,
Ta olum məktəbindən azadə.
Bir doyunca gedim gəzim baği,
Həm edim baği seyr, həm daği.
Bu duani eşitdi mollası,
Dedi: – Oğlum, bunun nə mənası?
Mən əgər rehlət etsəm üqbayə,
Qoyar atan bir özgə mollayə.
Atanın mərgin istə, ey nadan,
Qalasan ta yetimü sərgərdan.

---

* Bir şah öz oğlunu məktəbə verdi (göndərdi).
Ona bir qızıl lövhə verdi.
Lövhənin üstündə zərlə yazılmışdı:
Müəllimin əziyyəti atanın məhəbbətindən yaxşıdır.

## BİR "QARE" İLƏ ŞAGİRDLƏRİN ƏHVALATI

Misrdə bir yeganeyi-dövran
Mənə bu macəranı qıldı bəyan.
Dedi kim, bizdə var idi bir pir,
Sahibi-elmü şeyxi-pakzəmir.
Əhli-təcvidü qarei-Quran,
Ona "Qürrai-səbə" əbcədxan.
Daim ol qarei-kühənsalə
Öyrədirdi qiraət ətfalə.
Məddü əşbaü ğünnə, səktəvü rövm,
Çeşmi-ətfal üçün həram idi növm.
Dərsdən qeyri həm o şeyxi-kühən
Onlara eyləmişdi kim, qədəğən
Göftgu olmasın qiraətsiz,
Məddü təcvidsiz, bəlağətsiz.
Oldular təngdil hamı ətfal,
Həqqi, ətfalə çox girandu bu hal.
Bir gün ol şeyx çağ edib qəlyan
Çəkdi, ondan ucaldı ərşə duxan.
Nagəhan bir şərarə qəlyandan
Düşdü əmmaməsinə sol yandan.
Etdi bir tifl işarə: – Key ətfal,
Hələ bir qədr dinməyin, dərhal
Şeyxin əmmaməsi bir az yansın,
Qansa da, bari sonradan qansın.
Çünki bir qədr yandı əmmamə,
Oldu bir tifl gərmi-həngamə,
Şeyxə verdi xəbər qiraətlə,
Mədd ilə, çox uzun ibarətlə.
Dörd əlif qədri çəkdi hər hərfi,
Ğünnənin yox hesabü sərhəddi.
Taki əvvəl xitabın eylədi "ya",
Rəmazan tək uzandı hərfi-nida.
Dedi: – "Ya haci", "hai" çəkdi təvil,
Oldu zahir həzar cərrü səqil.
Mübtəda zahir oldu çox, əmma
Xəbərə müntəzir qalıb molla.

Dedi: – Axır o tifli-əllamə,
Şeyxəna, qoyma, yandı əmmamə!
Ol zaman kim, o tifl verdi xəbər,
Nisfdən yanmış idi balatər.
Tünd olub şeyx, etdi qəhrü qəzəb,
Dedi: – Ey tifli-bihəyavü ədəb,
Sən ki gördün yanırmış əmmamə,
Gərm olubdur başımda həngamə,
Etmədin hali sürət ilə nədən?
Dedi kim, etmisən özün qədəğən.
Ey olan lütfü xeyrixah bizə,
Bu əməldə nədir günah bizə?
Dedi minbəd, ey güruhi-əziz,
Göftgu eyləyin qiraətsiz.

## ŞAGİRDLƏRİN MÜƏLLİMƏ KƏLƏK GƏLMƏLƏRİ

Var idi bir müəllimi-dana,
Xoşzəban, xoşədavü nüktəsəra.
Oxudurdu neçə nəfər ətfal,
Məktəbi olmuş idi malamal.
Dərsi-ətfalə diqqət eylərdi,
Onlara çox siyasət eylərdi.
Dərsü təlimü bəhsü məşqü səbəq
Tifl üçün napəsənddir əlhəq.
Təbi-ətfal ləbə maildir –
Ki, hənuz əqli qeyri-kamildir.
Oldular dərsü bəhsdən diltəng,
Etdilər ustadə hiyləvü rəng.
Məktəbə kim ki, gəldi vəqti-səhər,
Etdi rüxsari-ustadə nəzər.
Dedi: – “Ey ustadi-dövranım,
Sənə qurban ola mənim canım!
Nə səbəbdən bu gül üzün qaralıb?
Gözlərin ağı sərbəsər saralıb?
Gözün üstü şişib, olubdu qovuq,
Zahirən bu gecə dəyibdi soyuq?”

Hər biri gəldi məktəbə bu sifət
Mollanın canına salıb vəhşət.
Qüvveyi-vahimə ziyad oldu,
Mollanın rəngi xövfdən soldu.
Var ikən əvvəli səhih bədən,
Aqibət naxoş oldu vahimədən.
Dedi molla ki, həqqi, ey ətfal.
Mən bu gün xeyli olmuşam bihal;
Görünür, məndə var əlaməti-təb,
Heç söz yox, soyuq dəyibdi bu şəb,
Ürəyim eylə qusmağa qalxır,
Dəmbədəmdən qulaqlarım salxır.
Bəs gedim evdə rəxtxabə girim,
Özümü ölməmiş, evə yetirim.
Eyləsin övrətim imalə məni,
Bəlkə gətsin imalə halə məni.
Sizə verdim bu həftəni möhlət,
Gər tapam mən bu haldən səhhət,
Yenə baş üstə, eylərəm təlim,
Qoymaram sizləri bu gunə yetim.
Səhhətimçün gedin dua eləyin,
Əgər öldüm, məni səna eləyin.
Ta ki məktəbdən oldular azad,
Etdilər bir-birə mübarəkbad
Dedilər cümlə, ey xudayi-ənam,
Mollanın ömrünü tez eylə təmam.
Binəva molla getdi xanə tərəf,
Yolda az qalmış idi ola tələf.
Rəxtxabi döşətdi, yatdı hərif,
Günbəgündən vücudi oldu zəif.
Yenə şagirdlər gəlib hər gün
Mollanın könlünə qoyurdu düyün.
Hiylə ilə o firqeyi-rubah,
Ustadə baxıb çəkərdilər ah.
Biri nagəh yalandan ağlardı,
Birisi nəşini qucaqlardı.
Mollanı tutdu aqibət vəhşət,
Dari-dunyadən eylədi rehlət.

## OĞLUMA XİTAB

Ey oğul, alim olsa rəbbani,
Sən onun ol dərində dərbani.
Mən özüm kim, zəmanə sərvəriyəm,
Üləmanın kəminə çakəriyəm.
Necə kim, vardı fazili-Şirvan,
Ol behinzadeyi-şəhi-dövran,
Mənbəyi-elmü helmü nuri-cəli,
Mədəni-fəzlü bəzli-Seyyid Əli.
Ələmü əfzəli-qəbaildir,
Məhbiti-cümleyi-fəzaildir.
Yoxdu zatında buyi-rəngü riya,
Qeyrlər ləfzdir, budur məna.
Leyk bir parə mərdi-hiylətgər,
Eyləyir dərs üçün İraqə səfər.
Kimisi şəhri-İsfəhanə gedir,
Kimisi Yəzdü Bəhbəhanə gedir.
Kimisi Kərbəlayə azim olur,
Neçə şeylər ona mülazim olur.
Oxuyur hər biri beş-altı vərəq,
Sonradan saqqala verir rövnəq.
Zadəhallah İraqdə tüllab
Mütəvü siğədən olur sirab.
Hər zaman vaqe olsa üsrü hərəc,
...eyləyir ümidi-fərəc.
Qüvveyi-bahi görməsə ifrat,
Bir də gördün atıbdı həbbi-nişat.
Günüzü siğəni edər əzbər,
Gecələr nazəninə həmbəstər.
"Nəfərə minküm" ayəsin oxuyur,
Çoxusun sinədən yalan toxuyur.
Qurtarır puli çün olur məğlub,
Vətən əhlinə göndərir məktub –
Ki, əya sakinani-əhli-vətən,
Çəkmişəm on beş il riyazət mən,
Edirəm kəsbi-elm leylü nəhar,
Gündüzüm dərsdir, gecəm təkrar.

Həmdəmim şəb "Üsuli-Kafi"dir,
Sizə ancaq bu elm kafidir.
Şöhrətim gün təki cahanı tutub,
Rüfətim ərzü asimanı tutub.
Elmə əllameyi-zəmanəm mən,
Ələmi-xəlqi-kun-fəkanəm mən.
Olmuşam elmü fəzldə mümtaz,
"Fəxri-Razi" deyil mənə həmraz.
Elm ilə hər məkanda adım var,
Gözüvüz aydın, ictihadım var.
Gəlməyimdə əgərçi var təxir,
Edirəm mən risaləmi təhrir.
Mənə bir qədr pul edin irsal,
Ləşkəri-fəqrə olmuşam pamal.
Gecələr şəmə tapmıram bir pul –
Ki, yazam şərhi-müşkülati-üsul.
Çox gecəm var ki, şamsız yatıram,
Çaysız, həm təamsız yatıram.
Bu pəyamı eşitcək əhli-vətən,
Alışıb, od tutub çi mərdü çi zən.
Bir qədər cəm eyləyib zərü sim,
Göndərirlər ki, hiç eyləmə bim,
Pul gəlir hər qədər ki, sən qalasan,
Təki sən sahibictihad olasan.
Pul ki çatdı cənab tüllabə,
Yenə verdi əzəlki mis qabə.

## MÜCTƏHİDİN TƏHSİLDƏN QAYITMASI

Müxtəsər, bir zaman çıxar bu xəbər –
Ki, gəlir ol cəhani-fəzlü hünər.
Pişvazə çıxar səğirü kəbir,
Ucalar ərşə naleyi-təkbir –
Ki, bu gün nayibi-imam gəlir,
Eyləyib elmini təmam gəlir.
Yerbəyerdən o qövmi-niksifat;
Üzünü görcəyin çəkər sələvat.

Tökülür xəlq sol və sağından,
Öpələr ta ki əl-ayağından.
Ehtiram ilə şəhrə varid olur,
Yeddi gün məclisi dolur, boşalur,
Kəsilir hər tərəfdə qurbanlar,
Açılır babi-lütfü ehsanlar.
Neçə əyyam olur ziyafətlər,
Eyləyir əhli-şəhr dəvətlər.
Fikr edir kim, o qövmi-fərzanə
Müçtəhidçün gərəkdi bir xanə.
Bir də gördün ki, eyləyib tədbir,
Bir gözəl xanə etdilər təmir.
Yenə söylər o qövmi-danişvər,
Müctəhidçün gərəkdi bir həmsər.
Bir gözəl qız nikah edib anə.
Mələki əqd edillə şeytanə.
Ta ki məqsuduna yetişdi imam,
Məscidə naz ilə edər iqdam.
Özünə əvvəl eyləyər zivər,
Bir gəlin tək ki axtarır şövhər;
Gözünü sürmədən edər məkhul,
Bir zaman zinətə olur məşğul.
Üzünə eyləyir gülab əfşan,
Barmağında nigini-ləlnişan.
Başına durdu qoydu əmmamə,
Geydi nəleynini o əllamə.
Var boğazında səxt təhtülhənək,
O qədər bərk çəkib olub döyənək.
Çiyninə saldı bir lətif əba,
Əlinə aldı bir zərif əsa.
Başda əmmamə, saqqalında həna,
Barmağında üzük, əlində əsa.
Var ayağında cüft nəleyni,
Bil ki peyğəmbərin budur qeyni.
Sağ-solunda qalıbdı çeşmi müdam –
Ki, görək kim verir imamə səlam.
Bu gün evdən çıxıb nəmazə gəlir,
Sufivü safi pişvazə gəlir.

Məscidə naz ilə olur daxil,
Girdi mehrabə alimü fazil.
Uydular xəlq, imam qıldı nəmaz,
Etdi min gunə həqqə razü niyaz.
Edibən ta nəmazını itmam,
Minbərə vəz üçün edər iqdam.
Minbər üstündə ol fələkrüfət,
Oxur ahəstə bir uzun xütbət.
Xütbədən sonra bir gözəl ayə,
Olur ol xoşzəbanə sərmayə.
Keyyühənnas, sirrdir bu dəqiq,
Hikməti şərə etmişəm tətbiq.
Sədrim olmuş vəsi dəryadən,
Fəzlim artıqdı Molla Sədradən.
Bəhri-elmimdə, ey güruhi-bəşər,
Pak olan gövhəri-muradə, yetər.
Yazmışam sərbəsər füruati,
Açmışam ğamizati-ayati.
Köhnə təfsirə vermişəm təğyir,
Tazədən yazmışam özüm təfsir.
Bir neçə səhv edibdi Beyzavi,
Olmuşam cümlə onlara havi.
Fəxri-Razi qərini-raz deyil,
Yazdığı rəmzlər təraz deyil.
Eyləyib səhv sahibi-"Tibyan",
Ruhdən bixəbərdü "Ruhi-bəyan".
Etməyib fəth Molla Fəthullah,
Səhvi-vazeh yazıbdır ol gümrah.
Gah fələk, gah ərşdən danışır,
Bu sifət çox çərən-pərən danışır.
Təmtəraqın görür o qövmi-əvam,
Söyləyirlər ki, etmiş elmi təmam.
Bu filan muctəhiddən əkməldir,
Şeyxül-islamdən bu əfzəldir.
Leyk bir parə mərdi-danişvər
Anlayıbdır ki, kəddə var nə xəbər.

Boş dəğar olduğun bilib dərhal,
Xövfdən leyk nitqin etmiş lal.
Bir deyən yoxdur, ey imami-şərir,
Edəcəksən nə vəqtədək təzvir?
Tutalım elmə olmusan vasil,
Bizə bu elmdən nədir hasil?
Hansı nadanı alim etdin sən?
Hansı bimarı salim etdin sən?
Hansı kuri sən etmisən bina?
Hansı əmvatı eylədin ehya?
Hanı islam üçün sərəncamın?
Yerə girsin o müctəhid namın!
Söylədin telqramı elmi-bəlis –
Ki, onu ixtira edib iblis.
Kari-şeytan dedin dəmir yolunu,
Xəlqə etdin həram Dum pulunu.
Xaçpərəstlər təmam düşdü qabaq,
Tökülüb dalda qaldıq, ay sarsaq!
Aldı əhli-kitab dünyanı,
Şərh edirsən sən indi Quranı?!
Əhli-islam oldu xarü zəlil,
Baisi sənsən, ey imami-cəlil!
Sən bizi nəfə etmədin vasil,
Barı qoy özgə elm edək hasil.
Bizi bəsdir bu qədr aldatdın,
Dini dinarə hər zaman satdın.
Sən bilən elmi bilməyən yoxdur,
Səndən ələm uşaqlar çoxdur.

## CAHİL ATA İLƏ ALİM OĞUL HEKAYƏSİ

Bir təvangər əvami-dəryadil
Göndərir oğlun elm edə hasil.
Hər il irsal edir məsarifini,
Ta ki kəsb eyləsin məarifini.
On beş il İsfəhanda ol huşyar
Eyləyib kəsbi-elm leylü nəhar,

Yetirir cümlə elmi itmamə,
Fəzli məşhur olur çü Əllamə.
Hikmətin əvvəlinci Loğmani,
Xassə hikmətdə yox ona sani.
Ta ki eylər müraciət vətənə,
Bülbülasa gəlir kühən çəmənə.
Bir gün ondan edər atası sual –
Key gözüm nuru, ey həmidəxisal,
Neçə illərdü çəkmişəm zəhmət,
Qalmışam gül cəmalüvə həsrət,
Sənə göndərmişəm hər il çox pul,
Oğul, az qalmışam olam yoxsul,
De görüm, mətləbə olaq vasil,
Hansı bir elmi etmisən hasil?
Dedi: – Ey baisi-həyatım ata,
Ey rizası olan nicatım ata.
Sən özün bir əvami-ümmisən,
Bu sualındı qeyri-müstəhsən.
Mən nə dilcən sənə bəyan eləyim,
Mən neçə elmimi əyan eləyim?
Dedi: – Filcümlə qıl bəyani-ülum,
Ta görüm səndə vardı bir məlum?
Dedi: – Heyət mən etmişəm hasil,
Sənə bundan nə şey olur vasil?
Dedi: – Heyət demək nədir yəni,
De görüm heyətə nədir məni?
Dedi: – Heyət edər bəyani-nücum,
Sənə filcümlə eylərəm məlum.
Çün olur Şəms daxili-Sərətan,
Olur aləmdə fəsli-tabistan.
Cədyə daxil olanda mehri-münir
Zəmhərir aləmə edər təsir.
Bu səyaqı əlində tut bürhan,
Bilüsən yay haçanı, qış nə zaman.
Dedi: – Ey bikəmal, on beş il
Gedibən etmisən bunu hasil?

Heyf o zəhmət, mənim o sərmayəm,
Sən bilən elmi həm bilir...
Sallanır yayda, annaram yaydır,
Yığışır qışda, zehli bir yaydır.
Şərmnak oldu alimi-dana,
O sifət elmdən budur məna.

## ALİMİ-BİƏMƏL VAQİƏSİ

Bir nəfər mərd getdi təhsilə –
Ki, yetirsin ülumi təkmilə.
Neçə illər ki, qaldı qürbətdə,
Oldu övqatı sərf işrətdə.
Nə kitabü nə dərsü nə təkrar,
Eyşü işrətdə qaldı leylü nəhar.
Elmdən bir şey etməyib hasil,
Vətənə gəldi alimi-cahil.
O zaman kim, vətəndə qaim idi,
Binəva bundan artıq alim idi.
Gəlibən xəlq, bədi-həmdü səna
Etdilər iltimas, key mövla,
Neçə illərdü ey imami-kəbir,
Yoluva göz dikib səğiru kəbir,
Cəm olubdur bu dəm vəziü şərif,
Məscidi-cameə gətir təşrif.
Bizə üç gün gərəkdü vəz edəsən,
Rəsmü adabi-şəri öyrədəsən.
Məhşər əhvalını bəyanə gətir,
Qəlblər kim, ölübdü – canə gətir.
Gördü kim, izdiham edibdir əvam,
Edibən məscidə o dəmdə xuram,
Duruban başə qoydu əmmamə,
Geydi nəleynini o əllamə.
Gəldi məsçiddə oldu pişnəmaz,
Etdi bəd əznəmaz razü niyaz.
Ərseyi-minbər üstə tutdu qərar,
Edər avaz, key ülül-əbsar!

Siz bilirsiz əya güruhi-fəqir?
Dedilər: – Bilmirik, elə təqrir.
Bilməyənçün, dedi, edim nə bəyan?
Edibən qəhr, düşdü oldu rəvan.
Yenə fərda edər o qövmə xitab –
Ki, bilirsiz, əya güruhi-dəvab?
Dedilər kim, bəli, əya mövla,
Bilirik, ey imami-ərzü səma!
Dedi kim, bəs bilirsiz, ey bipir,
Dəxi bica nə eyləyim təqrir?
Yenə düşdü aşağə minbərdən,
Getdi ol naibi-imami-zəmən.
Yenə fərda edər o qövmə xitab –
Ki, bilirsiz əya güruhi-lübab?
Dedilər:–Nisfimiz bilir, əmma
Nisfimiz bilmir, ey imami-hüda.
Dedi kim, ol bilən güruhi-əlim
Eyləsin bilməyənlərə təlim.
Dedilər mərhəba bu göftarə!
Budu söz, dərdə eylədin çarə.
Elmi bir kəlmədə təmam elədin.
Çareyi-dərdi-xasü am elədin.
Sən təki olsa alimü fazil
Bizi hər mətləbə edər vasil.
Həq-təala verib kəmal sənə,
Aldığın pul ola həlal sənə!

## OĞLUMA XİTAB

Ey oğul, nifrət eylə vahimədən,
Vahimə şumdur, müxərribi-tən.
Vahimə olsa şəxsə müstövli,
Eylər ani həlak öz hövli.
Qüvveyi-vahimə şəyatindir,
Vahimə cinniyani-bidindir.
Görməyirsən ki, şəxs olanda cünun
Vahimə qalib oldu, əql zəbun?
Rəftə-rəftə cünunu bədtər olur,
Qüvveyi-vahimə müsəvvər olur.
Sanki bir şəxs ona olur peyda,
Bir-birilə olur bular guya.
Leyk zahirdə yoxdu şəxsi-digər,
Vahimə eyləyib o şəxsə əsər.
Elə hər bir məqamdə cürət,
Zəhr içsən hesab qıl şərbət.
Xövflə gər səhər yesən gülqənd,
Gətirər zəfi-mədə, ey dilbənd.
Sənə bu macərani eylər əda,
Guş qılsan, hekayəti-hükəma.

### İSKƏNDƏR DÖVRÜNDƏ İKİ HƏKİM

Vardı İskəndər əsri iki həkim,
Mülki-Yunanda, vacibüt-təkrim.
Onların düşdü çün mübahisəsi –
Ki, nədəndir zəmanə hadisəsi?
Ol nə bürhan gətirdi hüccət ilə,
Bu onu rədd edirdi hikmət ilə.
Hər nə mətləb ki, qıldı bu ünvan,
Ol gətirdi buna gözəl bürhan.
Hərçi ilzamə oldular talib,
Birinə olmadı biri qalib.
Aqibət şərt qıldı iki təbib,
Hərə bir zəhr eyləsin tərtib.

O bunun zəhrini içə, bu onun,
Ta bu sevdadə kim olur məğbun?
Birisi şərbət eylədi tərtib,
Zəhr hazır qılıb ikinci təbib.
Bir-birə verdilər məhabət ilə,
Birisi içdi zəhri cürət ilə,
Bilmədi zəhr olduğun anın,
Belədir müqtəzası dövranın.
Etmədi xövf səmmi-nafizdən,
Qaldı ol şirdil səhihbədən.
Ol biri içdi xövf ilə şərbət,
Dari-dünyadən eylədi rehlət.
Öz işindən onu qiyas etdi,
Vəhşətindən zəmanədən getdi.

## OĞLUMA XİTAB

Cəfər, ey rahəti-rəvani-pədər,
Güli-xoşətri-gülsitani-pədər.
Sədəfi-təbimin səmin gühəri,
Vermə bir kimsəyə yaman xəbəri.
Bülbül ol, ver bahardən müjdə,
Cüğd tək xəlqi etmə pəjmürdə.
Farsidə bu fərdi bir dana
Eyləyibdir nəsihət ilə əda:
"Bülbüla, müjdeyi-bəhar biyar,
Xəbəri-bəd bebumi-şum güzar"*.

### XEYİR SÖYLƏMƏZİN HEKAYƏSİ

Vardı bir xeyrsöyləməz nadan,
Dilinə xeyr gəlməyib bir an.
Dedi bir şəxs ona kim, ey müztər,
Edirəm mən bu gün İraqə səfər,
Bir dua eylə, ey əziz, mənə –
Ki, səlamət gəlim yenə vətənə,
Hər nə əynimdə var libasi-səfər,
Sənə verrəm, çıxardıban yeksər.
Dedi kim, indi ver mənə, heyhat,
Eylədin bəlkə qürbət içrə vəfat.

### TOXUCUNUN HEKAYƏSİ

Var idi İsfəhanda bir nəssac,
Toxudu şahə bir gözəl dibac.
Doqquz ay çəkdi binəva zəhmət,
Verdi dibacə nəqşdən zinət.
Yazdı əşar ilə kətibələrin,
Nəqşdən zahir etdi sehri-mübin.
Baxdı dibacə ta ki şahi-cavan
Bir zaman qaldı valehü heyran.

---

* Ey bülbül, bahar müjdəsi gətir. Pis xəbəri uğursuz bayquşa həvalə elə (*Sədi*)

“Mərhəba” söylədi səğirü kəbir,
Şah dedi: – Ey vəziri-batədbir,
Nə üçün yaxşıdır bu, eylə bəyan.
Ərz qıldı vəzir, key soltan,
Yaxşıdır bu qumaşdən camə,
Yaraşar padşahi-islamə.
Biri ərz etdi: – Ey şahi-övrəng –
Ki, bunun çox olur qəbasi qəşəng.
Biri ərz etdi, key şəhi-əşraf,
Çox gözəldir ola bu ruyi-lihaf.
Əhli-məclis o gün səğirü kəbir,
Hərə bir növ, göstərib tədbir,
Dedi ol padşahi-niksüxən:
– Qoy sual eyləyək həm ustadən.
Dedi ustad: – Ey fələktədbir,
Çox gözəldir ki, saxlana bu hərir,
Çəkələr sən öləndə tabutə,
Görünə onda xəlqi-nasutə.
Təngdil oldu padşahi-cavan,
Qətlinə verdi ol kəsin fərman.

## HƏZRƏTİ-İSANIN QİSSƏSİ

Bir gün , ey ruhi-həzrəti-İsa,
Kəlmeyi-həq, o nuri-paki-xuda
Bir məkandan rəvan edirdi güzər,
Verdilər föhş ona yəhudilər.
Bu əziz onlara dua elədi,
Qıldı təhsinlər səna elədi.
Ərz qıldı ona həvarilər –
Key olan cümlə aləmə rəhbər,
Nasəza söylədi təmami sana,
Sən edərsən bu qövmə xeyrü dua?
Dedi: – Xərc eylədi olar varın,
Batinin zahir etdi asarın;
Mən də xərc eylədim nə varım var,
Yox xəzəf, dürri-şahvarım var.

## HARUN VƏ ŞAİRLƏR ƏHVALATI

Gəldi Harun üçün iki şair,
Hərə bir fərd eyləyib zahir.
Bu idi fərdi-əvvələ məna –
Ki, olur yaxşı felə yaxşı cəza.
Fərdi-sanidə həm bu idi əyan –
Ki, həmişə olur yamanə yaman.
Şairi-əvvələ o fəxri-kübar
Mərhəmət qıldı min ədəd dinar.
Şairi-saniyə həm etdi əta
Əvvəlin nisfini, o kani-səxa.
Əhli-bəzm oldu bu işə heyran,
Dedilər: – Ey xəlifeyi-dövran,
Birdi mənadə kim, bu iki kəlam,
Bəs nədən oldu müxtəlif ənam?
Dedi kim, şəxs olsa xoştinət,
Yaxşılıqdan müdam edər söhbət.
Var idi tinətində çünki səfa,
Yaxşılıq fərdin eylədi o əda.
Ol birində yamanlıq oldu nihan,
Odu kim, söylədi yamanə yaman.
Sifəti-sahibi-kəlamdı söz,
Batin asarına təmamdı söz.

## SƏNCAN ŞAHININ YUXUSU

Yuxuda gördü şahi-Səncani –
Ki, tökülmüş təmam dəndani.
Bir müəbbirdən etdi ani sual,
Dedi: – Ey padşahi-ərşcəlal,
Bil ki, dəndandır sənə övlad,
Böylə yazmış kitabdə ustad:
Öləcəkdir sənin çox övladın.
Çıxacaq ərşə ahü fəryadın.
Dedi şəh: – Böylədir, deyil böhtan,
Qətlinə eylədi onun fərman.

Tünd olub padşahi-danişvər,
İstədi bir müəbbiri-digər.
Bu müəbbirdən etdi hali sual,
Dedi: – Ey padşahi-nikufal,
Gördüyün xab üçün budur təbir,
Həq sənə lütf edibdi ömri-təvil.
Çün bu rəmzi eşitdi şahi-cavan,
Verdi bu şəxsə xələti-əlvan.
Dedilər: – Ey şəhi-zəminü zəmən,
Sadir oldu əcibə iş səndən.
Hər müəbbir ki, halı etdi bəyan,
Söylədin böylədir, deyil böhtan.
Birini qanə eylədin qəltan,
Birinə xələt eylədin ehsan.
Dedi: – Ari, o iki mərdi-dilir
Yuxumu yaxşı etdilər təbir.
Leyk əvvəlki şəxs idi nadan,
Sözü bipərdə qıldı şərhü bəyan.
Necə əvvəlki eylədi təbir,
Sonrakı eylə qıldı həm təqrir.
Sözü lazımdı şəxs eylə desin –
Ki, təbiət o sözdən inciməsin.

## OĞLUMA NƏSİHƏT

Cəfər, ey sibti-Heydəri-Kərrar,
Mərdlik şivəsində ol huşyar.
Kişilik vardır əgər səndə,
Olma eybi-zənanə cuyə[...]
Naqisül-əqldir güruhi-nisa
Olma naqislər eybinə cuya.
Özgələr övrətini eyləmə zəmm,
Şişeyi-xəlqə atma səngi-sitəm.
Etmə naməhrəmə, yamandı, nəzər,
Nəhy edibdir cənab peyğəmbər.
Eyləmə özgə övrətin töhmət,
Kizbü böhtanə eyləmə adət.
Sənə möhtac edibdi övrəti həq,
Etmə möhtacüvə qəzəb nahəq.
Filməsəl övrətində olsa xəta,
Eyləmə xəlq ara onu rüsva.
Təbüvə gəlməsə xisalı pəsənd,
Rədd qıl, ver təlaqin, ey fərzənd.
Pərdəsin açma, zəbt qıl əsrar,
Açmasın ta ki pərdəni səttar.
Necə kim, bu hekayəti-ziba
Sənə bu macəranı eylər əda.

### ARVADINI BOŞAMIŞ KİŞİ HEKAYƏSİ

Verdi bir şəxs övrətinə təlaq,
Vəchin ondan soruşdu bir sarsaq.
Dedi ol şəxs: – Ey səfihü dəğa,
Eybdir etdiyin sual sana.
Belə biqeyrətəm məgər, ey pir,
Övrətim eybini qılım təqrir.
Çəkdi sail sualdan xiclət,
Bu hekayətdən ötdü bir müddət,
Getdi bir şəxsi-digərə ol zən,
Yenə bu sordu ol rəfiqindən.
Dedi: – Ey dust, indi ol övrət
Oldu bir şəxsi-digərə qismət.

Nə üçün sən təlaqini verdin,
Onda aya nə bəd əməl gördün?
Dedi kim, ey bəradəri-nadan,
Sorduğun eybi-narəvadən utan!
O gedib özgəyə olubdur zən,
Soruşursan qəribə söz məndən.
Mən sənə qeyr söhbətin danışım,
Özgənin eybi-övrətin danışım?
Sorma, xamuş ol bu söhbətdən,
Xövf qıl zilləti-qiyamətdən!

## OĞLUMA XİTAB

Ey oğul, əksəri-zənani-cahan
Ərinin marginə olur nigəran.
Düşər ol şum bu təmənnayə –
Ki, gedə şayəd ondan əlayə.
Etsə hər sadəru cəvanə nəzər,
Bu mənə kaş ola deyər şövhər!
Nə gözəl bığ çəkib binaguşə,
Məni hər şəb çəkəydi ağuşə!
Odu kim, etdi qadiri-əllam
Mərdi-biganəni zənanə həram.
Xoş deyil gərçi mərd övrətsiz,
Fel yoxdur cahanda hikmətsiz.
Leyk lazımdır eyləmək diqqət,
Övrət olmaz ricalə hər övrət.
Zən gərək xanədani-ismətdən,
Əhli-təqvavü əhli-iffətdən.
Çox da hüsnü cəmalə etmə nəzər,
Səni allatmasın zərü zivər.
Bu əməl sünnəti-müəkkəddir,
Rövnəqi-dini-paki-Əhməddir.
Dedi: – Təzvicə etməyən rəğbət
Hiç şək yox, deyil mənə ümmət,
Buyurub: – Ümmətim, qılın təzvic,
Dini-islamə artırın tərvic.

Sizdə təzvicə inqiyad olsun,
Həşrdə ümmətim ziyad olsun.
Ümmətin çoxluğu baharımdır,
Olsa da siqt, iftixarımdır.
İzdivac ilədir bəqayi-bəşər,
Növi-insani ol ziyad eylər.
Çoxdu bu babdə hədisü xəbər,
Ey oğul, tapşırıbdu peyğəmbər.
İxtiyar eyləsən əgər övrət,
Gözümün nuru, eylə çox diqqət.
Ta ki baqqal tək o məkkarə
Çəkməsin nəşüvü sənin darə.

## BAQQALIN ARVADININ HEKAYƏSİ

Çəkdi bir padşahi-xunxarə,
Bir nəfər düzdi-müfsidi darə.
Əsəsə böylə oldu fərmani –
Ki, ola üç gecə nigəhbani.
Dardə qalsın ol dənitinət,
Özgələr ondan eyləsin ibrət.
Apara nəşi gər açıb bir kəs,
Çəkilir darə ondan ötrü əsəs.
İttifaqən əsəs edər qəflət,
Nəşi əyyarlər edər sirqət.
Olur agah ta ki mərdi-əsəs,
Dağılır cüstü-cu üçün hər kəs.
Dolanıb çölləri o şami-siyah,
Bir işıqlıq görür əsəs nagah.
Yetişib eylədi o dəm diqqət,
Gördü qəbr üstə bir gözəl övrət.
Dedi: – Ey nazənini-gülrüxsar,
Ey şəbi-dacə mehri-pürənvar.
Ey ləbin zülmət içrə abi-həyat,
Ey sözün rizə-rizə qəndü nəbat.
Çox təəccübdü, ey səhi-əndam,
Nisfi-şəbdə tülui-mahi-təmam.
Sən mələksənmi, ey pərisurət,
Ya enib göydən ayeyi-rəhmət?

“Leylətül-qədr”dir məgər ki, bu şəb,
Yerə göydən nüzul edib kövkəb?
Ey qılan tirə tələti mahi,
Yoxsa sənsən pərilərin şahi?
Bu təəccübdür, ey büti-fərxar,
Nisfi-şəb söylə bu məkanda nə var?
Açdı göftarə ləb o məhsurət,
Nöqtəni qıldı qabili-qismət.
Dəhənin açdı ol fəriştənihad,
Sözləri yoxdan eylədi icad.
Dedi kim, bu məzarıdır ərimin,
Ol üzü gül, boyu sənubərimin.
Eyləmişdik bu növ ilə peyman –
Kim ki, ölsə qabaqca, dalda qalan
Etməsin cüfti-axərə rəğbət,
Olmasın özgə şövhərə övrət.
İndi üç gün deyil ki, bu fazil
Rəhməti-iyzədə olub vasil.
Mən məzarında şəm yandırıram,
Yarımın ruhunu inandırıram.
Dedi: – Ey nazənini-hurliqa,
Eyni-bidətdir etdiyin sevda!
Bu qədər kim, cahanda var övrət,
Hansına üz verib bu keyfiyyət?
Övrəti fövt olanda, hansı kişi
Bir bəyan eylə kim, tutub bu işi?
Bu qədər nazəninim, olma əvam,
Sən edən əmrə kim edib iqdam?
Yoxdu bundan şəriətin xəbəri,
Qoy əlindən bu nəxli-bisəməri.
Kişi ölsə, ərə gedər övrət,
Övrət ölsə, dəxi budur adət.
Dedi övrət ki, ey rəşid cavan,
Kimdir axır məni-həzini alan?
Dedi: – Etsən qəbul, mən allam.
Hər gecə qoynuma səni sallam.
Dedi: – Mən raziyəm, di bismillah!
Durdular olmağa rəvaneyi-rah,

Oxusun qazi ta ki əqdi-nikah,
Eyləsin onlara bu əmri mübah.
Bir qədər getmiş idi ol gümrah,
Nagəhan çəkdi ol əsəs bir ah.
Düşdü meyyit xəyalına əsəsin,
Dedi: – Heyf oldu, məhliqa, həvəsin.
Olmuşam şahdən üzü qarə,
Çəkəcək şəh səhər məni darə.
Dedi: – Aya nədir günah sənə –
Ki, qəzəb eyləyibdi şah sənə?
Dedi: – Bir düzdü şahi-xunxarə
Hökm edib çəkdilər bu gün darə.
Dardə üç gecə qalaydı gərək,
Mən idim pasiban ona, bişək.
Eylədim qəflət, olmadım huşyar,
Bu gecə meyyiti oğurladılar.
Axtarırdım o meyyiti, ey yar,
Sənə oldum bu sərzəmində düçar.
Dedi övrət: – Bu işdən eyləmə qəm,
Vardır hər zəxmə bir gözəl mərhəm.
Gəl çıxardaq bunu məzarından,
Apar as, padşah darından.
Meyyitin meyyitə var oxşari,
Kim bilir böylə nazik əsrari?
Dedi: – Bu fikri-bikrə səd əhsən –
Ki, qutardın məni bu möhnətdən!
Qazdı qəbri, çıxartdı baqqali,
Gördü vardır üzündə saqqali.
Dedi: – Ey nazənin, düzəlmədi hal,
Ol cavan idi, bunda var saqqal.
Dedi: – Bu səhldir, tapıb miqraz;
Vurdu dibdən, üzari oldu bəyaz.
Qırxdı saqqali-meyyiti o zaman,
Ölünü qırx yaşında qıldı cavan.
Aparıb çəkdi gecə darə əsəs –
Ki, günüz fərq etmədi bir kəs.

Meyyitin üç günü çün oldu tamam
Açdılar, dəfn qıldılar axşam.
Aldı ol övrəti-cavanı əsəs,
Bu işə vaqif olmadı bir kəs.
Neçə illər dolandılar xoşhal,
Şadman "bilğüdüvvi vəl-asal"*.
Bir zaman oldu ol əsəs bimar,
Mərgdən zahir oldu çox asar.
Yığışıb yarü aşinası tamam,
Dedilər: – Qıl vəsiyyətin əlam.
Dedi ki, mən edən zamanda vəfat,
Dəfn edin, verməyin mənə xeyrat.
Hər nə məndən ki, qalsa malü mənal,
Eylədim varın övrətimə həlal.
Tapşırın etməsin behəqqi-xuda,
Məni baqqal kimi ol rüsva.
Çəkməsin nəşimi mənim darə,
Qırxmasın saqqalım bu məkkarə.
Dedilər kim, nə dar, nə baqqal?
Etdi təqrir onlara əhval.
Eylədi şərh macəranı tamam,
Qaldı məbhut cümlə xas ilə am.

## OĞLUMA XİTAB

Cəfər, ey sadəlövhü pakzəmir,
Bil ki, vardır zənanda çox təzvir.
Sureyi-Yusif içrə məkri-zənan
Oxusan, ey oğul, olubdu bəyan.
Bil ki, Quranara xudayi-əlim
Buyurub: "İnnə keydəkünnə əzim"**.
Məkri-şeytani həq sayıbdu zəif,
Məkri-nisvan ilə qılıb təhqiq.
Adəmi ol nəimü nemətdən
Zən çıxardıbdu bağİ-cənnətdən.

---

* Gecə və gündüz.
** Onların (qadınların) hiyləsi böyükdür.

Zən verib Müctəbayə zəhri-cəfa,
Mürtəza məkri-zəndən oldu fəna.
Çox böyük məkr oldu məkri-zənan,
Zənə şagirddü məkrdə şeytan.
Məkri-zən çox evi qılıb viran,
Məkri-zən çoxları qoyub giryan.

## MƏKRİ-ZƏNAN

Var idi bir müsənnifi-adil,
Elm dəryasi, mürşüdi-kamil.
Söylər idi həmişə ol dana:
Naqisül-əqldir güruhi-nisa.
Övrətə etibar etməz idi,
Hər nə övrət desəydi, bitməz idi.
Cəm qılmışdı bir kitabi-rəvan,
Adını qoymuş idi "Məkri-zənan".
Bir neçə vəqt gəzdi dünyani,
Eylədi cəm məkri-nisvani.
Səfəri-axərində ol huşyar
Eylədi bir qəbilə içrə güzar.
Çıxdı nagəh qabağə bir övrət,
Qıldı mehmanə layiqi hörmət.
Düşürüb rahət etdi mehmanın,
Qıldı asudə fazilin canın.
Gördü kim, ol cəmileyi-dövran,
O üzü gül, o sərvi-qönçədəhan,
Bilir adabü rəsmi-mehmani,
Mizəbanlıqda yoxdu nöqsani.
Dedi fazil ona ki, ey övrət,
Bu qədər eylədin mənə hörmət,
Sən bu mehmannəvazlıq karın
Kimdən öyrənmisən, qıl izharın.
Dedi: – Peyğəmbəri-mükərrəmdən,
Xələfi-biqərini-Adəmdən.
Müstəfa, ol rəsuli-paksirişt
Dedi: – Mehmandır dəlili-behişt.

Kim ki, mehmanə eyləsə ikram,
O mənimlə edər behiştə xuram.
Dəxi bil kim, bu söz mühəqqəqdir,
Mərdi-mehman hədiyyeyi-həqdir.
Dəxi təqrir edib ki, əhli-siyər
Hər kəs öz ruzisin tənavül edər.
Bir evə gəlsə bir qonaq əgər,
Bil onun ruzisi qabaqca gələr.
Çün eşitdi bu sözləri fazil
Gördü əqlin o övrətin kamil.
O gecə fazili-bülənd cənab
Açıb, ahəstədən oxurdu kitab.
Sordu övrət ki, bu kitab nədir,
Çox baxırsan, bu, ey cənab, nədir?
Baxdı fazil o övrətə, güldü,
Dedi: – Bu bir kitabi-müşküldü.
Məcməyi-hiyleyi-nisadır bu,
Etmişəm cəm, ey behişti ru.
Bildi kim, cəm edibdi məkri-zənan,
Oldu xəndan o sərvi-qönçədəhan.
Dedi kim, ey müsənnifi-aqil,
Sən əcəb əmrə olmusan şağil.
Səni mən eylədim o şəxsə misal –
Ki, gedib hazır etdi bir qərbal,
Gəlib ölçərdi abi-dəryani,
Açmayıb kimsə bu müəmmani.
Öhdəsindən bu əmrin, ey dana,
Gəlməyib kimsə ta ki var dünya.
Bir qədər su tutum, götürdün sən,
Su görək əksilir o dəryadən?
Harda kim, zahir olsa məkri-zənan,
Orda acizdü məkrdən şeytan.
Məkri-nisvandə xudayi-əlim
Buyurub: – "İnnə keydəkünnə əzim".
Çəkmə zəhmət dəxi bu halət üçün,
Ömrüvü sərf elə ibadət üçün.
Məkri-nisvanə yoxdu həddü həsar,

Bu xəyalından eylə istiğfar.
Çün bu təqriri etdi fazil guş
Qaldı məbhut sözdən, oldu xəmuş.
Xabdən oldu sübh çün bidar,
Gəldi ol nazənini-gülrüxsar,
Etdi mehmaninə nəvazişlər,
Dedi: – Ey fazili-həmidəsiyər!
İstəyirsən ki, hiyleyi-zəndən
Sənə bir qədr eyləyim rövşən?
Edəsən ta yəqin ki, məkri-zənan
Bəhrdir, leyk bəhri-bipayan.
Edəsən bu kitabüvü dərhəm,
Özüvü sanma fazili-ələm.
Dedi: – Ey nazənini-gülrüxsar,
Bildiyin məkri dur elə izhar.
Durdu nagəh əyağə ol övrət,
Özünə getdi eylədi zinət.
Eylədi zülfi-ənbərin şanə,
Kim ki, görsə, olurdu divanə.
Gözünə sürmə çəkdi ta ol mah,
Fazilin ruzgarın etdi siyah.
Oldu pirayədən lətafəti çox,
Əyri qaşi kəmanü kipriyi ox.
Geydi ol şux cameyi-əlvan,
Qıldı tavusi-məst tək cövlan.
Fazilə gəldi verdi ta ki səlam,
Xalini qıldı danə, zülfünü dam.
Qıldı nazü girişmə, ğincü dəlal,
Oldu tuti kimi fəsihməqal.
Ləbinin dövrə gətdi ta camın,
Fazilin aldı səbrü aramın.
Dedi fazil ki, ey büti-ziba,
Sənə qurban olum məni-şeyda!
Hursən, ya mələk və ya ki pəri?
Bu lətafətdə görmədim bəşəri.
Ola canım nigahına qurban,
İki çeşmi-siyahına qurban!

Bu nə çeşmi-xumardır, nə nigah?
“Vəhdəhu la şərikə illəllah”*.
Ey vüsalın behişt, hicrin nar,
“Vəqina rəbbəna əzabən-nar”**.
Gördü övrət ki, şeyxi-əllamə
Zülfünü görcəyin düşüb damə,
Dedi: – Ey fazili-niku-mənzər,
Bu nə sözdür, nə üz veribdi məgər?
Sən kimi şəxsi-aqilü dana
Özünü eyləməz əbəs rüsva.
Sən kimi sahibi-kitab olan –
Ki, yazar hər zamanda məkri-zənan
Səbr edər, böylə biqərar olmaz,
Övrətə çünki etibar olmaz.
Dedi: – Ey dilbər, ey fəriştəüzar,
Dəxi yox məndə tabü səbrü qərar.
Getdi səbrim, dəxi qərarım yox,
Aşiqəm, aşiq, ixtiyarım yox!
Bu gecə fikrin ilə, ey dildar,
Sübhədək gözlərim qalıb bidar.
Çarə qıl, getdi ixtiyar əldən,
Getdi bu zarü biqərar əldən!
Duruban, fazili o gülrüxsar
Çəkdi xəlvət otağə, tutdu qərar.
Fazilə eylər idi işvəvü naz,
Nagəhan eylədi kəniz avaz,
Dedi: – Ey xanım, ey fəriştəliqa!
Ol xəbərdar kim, gəlir ağa.
İztirab ilə durdu ol dilbər,
Hər libasın çıxardı çapiktər.
Özünü çəkdi bir kənarə o dəm,
Gördü bu hali fazili-əkrəm,
Dedi: – Ey nazənin, nədir belə hal?
Kolmusan*** beylə müztərib-əhval?

---

* Allah təkdir, ondan başqa allah yoxdur.
** Ey Allah, bizi odun [cəhənnəmin] əzabından saxla.
*** Ki olmusan

Dedi: – Üç gündü ki, ərim, ey yar,
Gedibən eyləmişdi meyli-şikar.
Söyləyir kim, kəniz, gəldi cavan,
Bizi bir yerdə görsə, verməz aman.
Tökəcəkdir yəqin ki, qanımızı,
Dağıdar indi xanimanımızı.
Bildi çün halı fazili-dövran,
Oluban bərgi-bid tək lərzan.
Xövfdən çıxdı eşqi başindən,
Dedi: – Bir çarə, neyləyim bəs mən?
Dedi: – Sanduqə olgilən daxil,
Ta görüm neylirəm mən, ey aqil!
Girdi sənduqə fazili-dana,
Eylədi qıfl dilbəri-ziba.
Şövhərin durdu, etdi istiqbal,
Bir-birin görcək oldular xoşhal.
Əyləşib oldu həm kişi rahət,
Etdi sənduqə təkyə həm övrət.
Etdilər növ-növ söhbətlər,
İşvələr, nazlar, zərafətlər.
Ta ki sənduqi ol pəri-rüxsar
Tərpədib, zikr eyləyib əşar;
Ey yazan keyd, şeyxi-əllamə,
Düşmüsən məkr ilə əcəb damə.
Dedi şövhər: – Nə sözdür, ey övrət,.
Görürəm səndə çox əcəb halət?
Dedi: – Dün gecə bir qərib cəvan
Gəlibən nagəhan mənə mehman,
Ol ki, məqdur idi evimdə təam,
Eylədim ol qərib üçün əncam.
Sahibül-elm, mərdi-fazil idi,
Yox idi nəqsi, şəxsi-kamil idi.
Bir də gördüm ki, bir kitabə baxur,
Belə ahəstədən onu oxuyur.
Dedim: – Ey şeyx, bu kitab nədir?
Etmisən böylə tərki-xab nədir?
Dedi: – Bu bir kitabdır ziba,

Bunu mən etmişəm özüm inşa.
Etmişəm cəm hiyleyi-nisvan,
Bu kitabındır adı "Məkri-zənan".
Eylə ki, bu kəlamı etdim guş,
Doğrusu, qeyrətim gətirdi cuş.
Dedim: – Ey şeyx, hiyleyi-nisvan
Bəhrdir, leyk bəhri-bipayan.
Qissələrdir bu nəqli-tulü diraz,
Yazasan gər yüz il, təmam olmaz.
Gəlməsən öhdəsindən ol karın,
Çəkməsin rənc çeşmi-bidarın.
Mənə etdi təbəssüm ol dana,
Məni incitdi doğrusu bu əda.
Dedim: – İstərmisən, əya fazil,
Sənə bir məkr edim məni-cahil?
Görəsən ta ki məkri-nisvani,
Biləsən hiç yoxdu payani?
Özümə durdum eylədim zivər,
Rubəru gəldim otdum, ey şövhər,
Məni görcək bu hüsnü tələtlə,
Bu nəzakətlə, bu vəcahətlə,
Getdi aramü ixtiyarı onun,
Qalmadı səbr ilə qərarı onun.
Eylədim xəlvətin sərəncamın,
Məndən istərdi ta ala kamın.
Məndən eylərdi könlünü xürrəm,
Sən gəlib eyşin eylədin dərhəm.
Təhi-sənduqdən o danişvər
Eşidirdi bu sözləri yeksər.
Xövfdən qaçdı rəngi-rüxsari,
Leyk çıxmırdı naləvü zari.
Dedi şövhər: – Bular zərafətdir.
Dedi: – Nə, taci-sər, sədaqətdir!
Bilmərəm göftüguyi-böhtan mən –
Ki, yalançı xudayədir düşmən.
Mən sənə hiç bir yalan demişəm?
Ya sənə bir zərafət eyləmişəm?

Dedi: – Bəs hardadır o bədbünyan –
Ki, edim qaninə onu qəltan?
Hardadır, söylə, ol nəməkbəhəram –
Ki, evimdə gəlib yeyibdi təam,
Qəsd edibdir mənim bəs övrətimə,
Necə dəyməz bu əmr qeyrətimə?
Mən onu öldürəm gərək əlan!
Özgə evdə həm olsa bir mehman,
Mizəbanə xəyanət eyləməsin,
Hiç kəs böylə cürət eyləməsin.
Qeyz ilə tutdu çəkdi şəmşirin,
Sanki bir şir qırdı zəncirin.
Dedi övrət ki, səbr elə, ey yar,
Getməyibdir uzağə ol idbar.
Sən gələn vəqt çaşdı ol fazil,
Onu sənduqə etmişəm daxil.
Verdi övrət kilidi kim, əlan
Açıban eylə qanına qəltan.
Fazilin qorxudan qaçıb qani,
Bəlkə beş yol batırdı tumani,
İttifaqən kişiylə ol övrət
Çəkmiş idi cinaq bir müddət.
Nə bu qalib olurdu, nə şövhər,
Ona verdi kilidi çün dilbər
Dedi: – “Yadımda” eylədin nisyan,
Sənə mən qalib olmuşam əlan!
Ərinin yadına ki, düşdü cinaq,
Atdı əldən kilidi ol sarsaq.
Dedi: – Həqqa ki, çoxdu məkri-zənan,
Sənə şagird ola gərək şeytan!
Qafil idi dəxi ki, ol müztər –
Ki, bu məkrində vardı məkri-digər.
Dedi ki, ey mühileyi-dövran,
Məni yaxşı aparmısan əlan!
Dediyin sözlərə inandım mən,
Səhvimi gör ki, doğru sandım mən.

Eylə bildi cinaq üçün övrət
Eyləyibdir bu növ ilə söhbət.
Dedi: – Bəs dur, gətir şərabü təam,
Əkl edək, ta yataq, keçir axşam.
Mahəzər etdi hazır ol dilbər,
Yedilər, yatdılar, çün oldu səhər,
Şövhəri oldu azimi-həmmam,
Açdı sənduqi, verdi şeyxə səlam.
Dedi kim, dur əyağə, ey fazil,
Özüvü sanma mürşidi-kamil!
Demə hərgiz kim, ey həkimi-zaman,
Naqisül-əqldir güruhi-zənan!
Dəxi get, qıl kitabüvü dərhəm,
Qoyma bu vadiyi-bəlayə qədəm.
Sən kimi şeyxü mürşidü kamil
Özünü damə saldın, ey fazil.
Guş edirdin ki, macəranı təmam,
Ərimə bir-bir eylədim əlam.
Qeyrətindən itirdi tədbirin,
Qətlinə çəkdi ta ki şəmşirin.
Onu əvvəl necə inandırdım,
Soradan başını dolandırdım.
Səni gətdim ölüm ayağına ta,
Yenə verdim dönüb nicat sana.
Övrətin qeyri kəslə olsa işi,
Saxlaya bilməz ani hiç kişi.
Hər nə ki istəsə edər övrət,
Saxlamaq olmaz, ey fələkrüfət.
İndi get, tərk elə bu sövdani,
Dəxi çəm etmə məkri-nisvani.
Bizə şeytan deyil bu işdə hərif
Geydi-şeytanı həq buyurdu zəif.
İndi dur get, dəxi səlamət ilə,
Ömrüvü sərf qıl ibadət ilə.
Elə ki, getdi fazili-əkrəm,
Nə ki yazmışdı, çəkdi üstə qələm.

## BƏLX ŞƏHƏRİNİN QAZISI VƏ DÜLGƏR HEKAYƏSİ

Bir zəni-işvəsəncü mərdfirib
Qaziyi-şəhri-Bəlxə oldu nəsib.
Sədri-darül-qərari-qazı idi,
Qazı ondan ziyadə razı idi.
Vardı bir dülgəri-giranmayə,
O şəriətpənahə həmsayə.
Qazının övrətinə aşiq idi,
Rindi-bibak idi, münafiq idi.
Nəl tək yandı könlü atəşdə,
Ərrə tək qaldı yüz kəşakəşdə.
Tişeyi-naxun ilə məxfiyü faş
Lövhi-cismin müdam edirdi xəraş.
Rəndeyi-ah ilə o qəmdidə
Qıldı can rişəsin təraşidə.
Təbəri-hicr ona qəza çalmış,
Nəxli-ömrün əyaqdən salmış.
Tiri-qəmlər ona atardı fələk,
Ciyərin çak edərdi iskənə tək.
Görməyə çeşmi-yarı leylü nahar,
Bədəni gözlər açdı pəncərəvar.
Aqibət ahü-naleyi-şəbgir
Dili-dildarə eylədi təsir.
Yetdi nəccar vəsli-cananə,
Mur tək düşdü şəkkəristanə.
Dedi nəccarə kim, zəni-qazi
Deyiləm bu vüsalə mən razi.
Nəqb vur öz evindən, ey müztər,
Ta bizim xanədən gətirsin sər.
Ta ki ol nəqbdən gəhü bigah
Tey qılaq rahi-xeyri, ey dilxah.
Oturaq xani-vəslə leylü nəhar,
Bu işə vaqif olmasın dəyyar.
Getdi nəccar nəqbi qıldı tamam,
Üzünə rahi-vəsli açdı müdam,

Daim eylərdilər sürurü səfa,
Qazının bağladı gözünü qəza.
Dedi bir gün ki, övrət: – Ey şeyda,
Bir əçəb fikr etmişəm peyda.
Get bu gün , ərz qıl ki, ey qazi,
Səndən olsun xudayi-həq razi.
Bu sözü ta ki eylədin izhar,
Ovcuna qoygilən neçə dinar.
Degilən, dur gətir bizə təşrif –
Ki, mənə üz veribdi bir təklif.
Məni qazi sənə nikah eləsin,
Bu həram əmri ol mübah eləsin.
Simü zər ver ki, qaziyi-məğrur
Simü zər görsə, gözləri olu kur.
Sanma rüşvətdə simü zərdir əbəs,
Sındırır dəstəmazi-şəri hədəs,
Çox füsunlar cavan alıb təlim,
Qaziyə gəldi eylədi təzim.
Gəldi səffün-nəaldə durdu,
İnkisar ilə boynunu burdu.
Əldə bir neçə dirhəmü dinar,
Dedi: – Ey rəhnümayi-xürdü kübar,
Zivəri-şərü zinəti-islam,
Zübdeyi-xəlqü naşiri-ehkam,
Əxzü cərr babi-fəzlüvə dərban,
İki quldur ki, tabeül-fərman,
Bəndə gəldim hüzuri-valayə,
Ehtiyacım düşübdür ağayə.
Həqqi-həmsayəlik varımdır əgər,
Leyk töhfə gətirmişəm həm zər.
Kətxuda olmağım düşübdü səlah,
Lazım olmuş bu əmrə əqdi-nikah.
Eylə təşrif xanimanımıza,
Ver səfa bağü gülsitanımıza.
Belə səbz oldu çün riyazi-kəlam,
Buyi-xeyr etdi qazi istişmam.

Zövq ilə nitqə gəldi şeyxi-kərim,
Durdu nəccarə etməyə təzim:
Və əleykəssəlam, fəxrəd-din,
Ey sənə lütfi-kirdigar müin,
Edə əcdaduva xuda rəhmət!
Nə gözəl fikrə etmisən niyyət!
Kəbeyi-məqsədə səfadü nikah,
Sünnəti-şəri-Müstəfadü nikah.
İzdivac ilədir bəqayi-bəşər,
Bunu təkid edibdi peyğəmbər.
Barəkəllah, ey fələkpayə!
Ey girami, nəcib həmsayə.
Sənə layiq deyil o səffi-nəal,
Mərhəba, mərhəba, təal, təal!
Əyləşib eylə istirahətlər,
Bizə eylə rücu xidmətlər.
Canü dil mehr ilə rəhinindir,
Qazi bir müxlisi-kəminindir.
Dedi könlündə kim, ona nəccar
Mənə müxlis deyilsən, ey qəddar.
Payi-zər gətdi çün aralığa zur;
Atanı qəbrdən çəkib çıxarır.
Dedi nəccar: – Əyyühəl-qazi,
Səndən olsun görüm xuda razi.
Şəfqətin eylədi məni xoşdil,
Leyk əyləşməyim olur müşkil.
Müntəzirdir o mahi-zöhrəcəbin,
Müştərini qıl Afitabə qərin.
Əqd qıl Fərqədanə Pərvini,
Mehr ilə bağla sən bu kabini –
Ki, bu dəm xeyli nik saətdir,
Nəzəri-səd üçün işarətdir.
Beyti-Əqrəb uzaqdu taledən,
Yoxla təslisi bu mətalibdən.
Zəhmət olmazsa, dur şitab eylə,
Məh gərək bürci-Afitabə gələ.
Başına qoydu qazi əmmamə,

Əyninə geydi bir gözəl camə.
Səbheyi-əxzü cərr götürdü ələ,
Gəldi nəccar evinə sürətlə,
Vird edərdi bu nüktəni o cənab,
"İftəhu ya müfəttihül-əbvab"*.
Qazi çün nazəninə qıldı nəzər,
Gördü kim, öz həlalına bənzər.
Bir də baxdı o mahə diqqətlə,
Dedi könlündə dərdü həsrətlə –
Ki, xudaya, iş oldu çox mübhəm,
Bir-birə böylə oxşamaz adəm.
Qaldı heyrətdə qazi sərgərdan,
Dedi nəccar: – Ey ədibi-zaman,
Niyə heyrətlə qalmısan dilxun?
Gedir əldən bu saəti-məymun.
Qazi başın götürdü balayə,
Bir də baxdı o mahsimayə.
Gördü kim, xeyr, bu öz övrətidir,
Nazənini-qəmər-vəcahətidir.
Dedi: – Lahövlə, durdu qaziyi-pir,
Dedi nəccar: – Ey imami-kəbir,
Niyə durdun ayağə sürətlə?
Çox baxırsan bu halə heyrətlə.
Dedi: – Ey şəxs, nüsxeyi-"Miftah" –
Ki, onunla gəlir təmamə nikah,
Qalıb evdə, gətirmədim ani,
Olmasa, yoxdur əmrin imkani.
Səbr qıl, ta onu gedim gətirim,
Şahidi-məqsədə səni yetirim.
Qazi düşdü yola şitab ilən,
Nəqbdən keçdi ondan əqdəm zən.
Gəlib öz xəlvətində ol dilbənd
Xürreyi-xabi-nazə oldu bülənd.
Qazi çün oldu daxili-xanə
Gördü kim, xab edibdü cananə.

---

* Ey qapıları açan [Allah], [üzümüzə] qapı aç!

Qaldı heyrətdə qaziyi-gümrah,
Dedi kim, lailahə illəllah!
Niyə töxmi-məzənnə əkdim mən,
Nə üçün bu xəyalı çəkdim mən?
Şərmsar oldu qaziyi-huşyar,
Öz xətasına qıldı istiğfar.
Övrətə rövşən oldu çün halat,
Xabdə etdi bir neçə hərəkat.
Gərnəşib qafilanə çevrildi,
Leyk qazi onu yatan bildi.
Dedi övrət ki, ey bənöfşə, mana,
Yuxu gəlməz, görüm nədir bu səda?
Bu qədər qalü-qil yəni nədir?
Dəsti-xər, payi-fil yəni nədir?
Xoş qədəm, sərhesab olun möhkəm,
Qoymasın xəlvətimə kimsə qədəm.
Bu sözü tapşırıb yenə yatdı,
Qaziyi-sadəlövhü allatdı.
Qazi nəccar evinə aldı qədəm,
Keçib əyləşmiş idi zən əqdəm.
Yenə çün gördü yar rüxsarın,
Qaldı heyrətdə, çaşdı göftarın.
Dedi: – Sübhanə rəbbiəl-əla!
Malikül-mülk, xaliqül-əşya!
Bir əcəb halətə giriftarəm,
Bilmirəm, yatmışam, ya bidarəm?!
Bir tərəf xar xari-iqdanə,
Bir tərəf rəşki-kari-cananə.
Şəkkim əfzun olub, yəqinim kəm,
Ürəyim qüssədən gətirdi vərəm.
Dedi nəccar: – Eyyühəl qazi,
Nə qılım kim, edim səni razi?
Qalmısan əmrdə düdil nə üçün?
Olmusan bu sifət xəcil nə üçün?
Bu nə heyrət, bu nə xəcalətdir?
Səndə axır bu nə kəsalətdir?

Gər fəmən-yəmələ təmənnadır,
Simü zər kari-xeyrə peydadır.
Məqsədi-qazi əxzü cərridü gər,
Bəndəlik eylərəm, bu sim, bu zər.
Gördü qazi dübarə sim ilə zər,
Əqli imanı kimi etdi səfər.
Qazi fikr etdi kim, bu mərdi-fəqir,
Neyləyim, etməyibdi bir təqsir.
Pul verir bu fəqiri-niknihad,
Oxuram əqd, hərçi badabad! .
Çəkdi əmri-nikahə bismillah,
Arizi-yarə bir də etdi nigah.
Gördü çün xali-ləli-canani,
Yandı narə sipənd tək cani.
Vardı ol hindu ilə sevdası –
Ki, edirdi şəkər təmənnası.
Ucalıb dudi-qəm nihadından,
Çıxdı əmri-nikah yadından.
Gördü nəccar çün müsahələsin,
Qazinin etdiyi müamələsin,
Dedi: – Ey qazi, olmusan məsru,
Yoxsa bir feldir bu naməşru?
Bu nə heyrətdü, bu nədir təxir?
Oldun axırda qaziyi-təsvir.
Dedi qazi ki, olma mərdi-ləcuc,
Əmri-müşküldü çox bu əmri-füruc.
Xazini-gənci-əmri-dinik biz,
Şərin ehkamına əminik biz.
Bu nə nəccarlıqdır, ey huşyar,
Bunda lazımdı diqqəti-büsyar –
Ki, sabah ərseyi-qiyamətdə
Qalmayaq zillətü xəcalətdə.
Sən gərəkdir ki, səbr eyləyəsən,
Cəm edim ta ki öz həvasımı mən.
Bir qəni dün gecə edibdi vəfat,
Qalıb ondan mənali-biğayat.

Varisi var əlli yeddi nəfər,
Qismət olmaq gərəkdi sim ilə zər.
Bəs gərək vazeh olmağa məchul
Mən olam zərbi-qismətə məşğul.
Bu sözü zikr eyləyib durdu,
Mərdi-nəccar boynunu burdu.
Qaziyə ərz qıldı kim, aya
Niyə durdun ayağə, ey mövla?
Dedi: – Məndən olub hədəs hadis,
Oldu fövti-vüzuyə ol bais.
Gedirəm ta vüzu edim, təcdid,
Bivüzu narəvadır ol təvid.
Dedi: – Ey qaziyi-bəhanəsəra,
Tapılar burda su, behəqqi-xuda.
Bu qədər zöhdi-xüşk satma bizə,
Kutəh et, bu işi uzatma, bizə.
Dedi qazi: – Deyildir ol mərğub,
Yəhtəmil ki, bu su ola məğsub.
Bunu zikr etdi, durdu oldu rəvan,
Nəqbdən keçdi həm o ruhi-rəvan.
Bir kitabə özün edib məşğul,
Onu gördükdə qazi oldu məlul.
Dedi: – Bilməm ki, bu nə halətdir,
Mənə bu mayeyi-xəcalətdir.
"Tübtü ya zülcəlal vəl ikram
Min cəmiiz-zünubi vəl-asam"*.
Qaziyə ərz qıldı ol övrət:
Bu nə halətdir, ey qəza-hikmət?
Səni kim eyləyibdi divanə,
Danışırsan müdam əfsanə?!
Səndə vardır nişani-xəbti-dimağ,
Səni lazımdır eyləmək bəs dağ.
Gedibən qıl ilaci-azarın,
Yoxsa müşkül olur sənin karın.
Dedi qazi ki, ey xədarətkiş,
Var bu gün məndə bir əcəb təşviş.

---

* Ey cəlal və kəramət sahibi olan [Allah], bütün günah və xətalarımdan tövbə etdim.

Fikri-vəsvas çıxmayır məndən,
Olmuşam xeyli bədgüman səndən.
Etmişəm səndən ötrü özgə xəyal,
Məni, ey nazəninim, eylə həlal.
Gedirəm çünki beyti-nəccarə,
Görürəm gül nəsib olub xarə.
Səni nəccar evində çün görürəm,
Dururam heyrət ilə tez gəlirəm,
Görürəm yatmısan otağında,
Əql heyrandı bu səyağında.
Dedi övrət ki, zişti-əhli-cahan
Olur ol kəs ki, ola əhli-güman.
Var idi mərdi-qazidə bir sib,
Bölübən etdi anı iki nəsib.
Nisfini verdi övrətə qazi,
Ta özündən edə onu razi.
Dedi: – Bir sibdir ki, müxtəsəri,
Çoxdu cədvardən bunun əsəri.
Qüvveyi-bahi bu ziyad eylər,
Bu müfərrih qülubi şad eylər.
Sən bu sibi tənavül eylə bu şəb,
Eylərik ləzzət ilə eyşü tərəb.
Gəldi nəccar evinə qaziyi-pir,
Gördü kim, əyləşib o mahi-münir.
Nisfi-sib əldə ol turunc-qəbqəb
Əyləşibdir başında çadirşəb.
Qazinin heyrəti ziyad oldu,
Gözü tək könlü qan ilən doldu.
Mütəhəyyir qalıb o sahibi-hökm,
Yerə çökdü, oturdu sümmün-bükm.
Dedi nəccar: – Ey şəriətkiş,
Nə səbəb vaqe oldu bu təşviş?
Fikrüvü olmadı sənin bilmək,
Bunca axır nədir gedib-gəlmək?
Mətləbin qeyrdir bu işdə əgər,
Dərdsər olmasın əya, sərvər.
Get, dəxi çıxma künci-mədrəsədən,

Bizi qıldın həlak vəsvəsədən.
Sən əgər etməsən bu sövdanı,
Gətirim əqdə özgə mollanı.
Vəchi-əqdanəmiz kəm isə əgər,
Al, qəbul eylə ha, bu simü bu zər.
Çünki zər gördü dideyi-qazi,
Oldu əqdi-nikah üçün razi.
Sanki bir eşşək idi cov gördü,
Ya ki məsru mahi-nov gördü.
Simü zər alladıb o gümrahi,
Çəkdi nagəh "əuzü billahi".
Oldu cari çü ləfzi-"ənkəhtü";
Müttəsil həm kəlami-"zəvvəctü",
Yenə tez baxdı bir o mahə tərəf,
Baxcağın tiri-dərdə oldu hədəf.
Gördü ol titəni ki, zərgərdən
Almış idi o qaziyi-pürfən,
Nəsb edib başına o mahliqa,
Gözünə tar oldu bu dünya.
Yenə biçarə qıldı fəsxi-nikah,
Dedi yüz heyrət ilə:Ya fəttah!
Yoxdu karımda hiç fəthü zəfər;
Dinimi əldən aldı sim ilə zər.
Çəkibən binəva ciyərdən ah,
Ziri-çeşm ilə bir də qıldı nikah:
Dedi: – Sübhanə faliqül-əsbah,
Mənə oldu bəla bu əmri-nikah.
Dedi nəccar: – Əyyühəl-qazi,
Sözlərin cümlə oldu miqrazi.
Edəcəksən nə vəqt bəs izhar,
Qəti-göftar, ey vərəasar?
Baxmağından yəqin olur hasil
Olmusan sən bu dilbərə mail.
Qəlbini oxşayıb kəmani-nəzər,
Əyləşib tiri-arizu ta pər.
Xeyli qabil məkandır abadan,
Töxm səp, vergilən suyun asan.

Qıl təsərrüf, bu qədr eyləmə bim –
Ki, həlalındı misli-mali-yetim.
Qazi fikr etdi kim, gərək təzvir,
Dedi kim, bir əvamdır bu fəqir.
Çün işim tapmadı səlah bu gün ,
Oxuram bir yalan nikah bu gün .
Dedi: – Ey zifünuni-nəccari,
Siğə əlhal eylərəm cari.
Hər nə mən zikr edəm bəvəçhi-həsən"
Degilə sən, qəbul etdim mən.
"Və nikahən, şələn səməlqatən,
Məhmələn, adiyən kənəl-hatən"*.
Çün eşitdi bu sözləri nəccar,
Dedi: – Ey rəhnümayi-xürdü kübar,
Afərinlər bu siğeyi-pakə,
Xeyli müşküldü fəhmi idrakə.
Verdiyim pul ola həlal sənə!
Nə gözəl həq verib kəmal sənə!
Etmisən bu nikahi əzbər sən,
Zahirən "Bozmara" kitabindən.
Belə zənn eylədin ki, nəccarəm,
Elmdən mən dəxi xəbərdarəm.
Etmişəm bil ki, mən də elmi təmam,
Bilirəm məniyi-rümuzi-kəlam.
Nəqli-"Seyfül-müluk"ə danayəm,
Qoysam əmmamə, mən də mollayəm.
Tanıram rahi-məscidi-came,
Deyiləm leyk sən kimi tame –
Ki, edəm bənd pənceyi-təqsim,
Ta ola payimal mali-yetim.
Mənə dərsi-nikahi qıyqaci
Verdi təlim Yasəmən baci.
Nə nikah idi kim, bu eylə bəyan,
Oldu ləfzi-mübarəkindən əyan?
Nə ibarətdir, ey ədəb kani –
Ki, nə yunanidir, nə süryani?

---

* Mənasız sözlərdir (*S.R.*)

Dedi qazi ki, eyyühən-nəccar,
Səndə canım, qəribə daiyə var.
Nə bilirsən təriqi-mədlulat?
Sənə vazeh deyil ki, məqulat.
Mən həmin siğəni həmin tərkib
Neçə gündür ki, etmişəm tərtib.
Hər kəsin bir təriq olur kari,
Budur əqdi-nikahi-nəccari.
Siğeyi-xanü siğeyi-ümərə
Hər biri bir səyağ olur inşa.
Sən qulaq as, əzizim, olma füzul,
Hər nə ki mən desəm, sən eylə qəbul.
Bir qiraətlə çəkdi "bismillah".
Arizi-yarə bir də qıldı nikah.
Gördü ol nisfi-sibi əldə, vəli
Binəvanın yenə tutuldu dili.
Dedi ki, ey nigari-laləqəba,
Mənə ol nisfi-sibi eylə əta.
Alıb ol nisfi-sibi qazi müft,
O biri nisfin eylədi ona cüft.
Gördü ol sibdir gedib parə,
Nisfini vermiş idi dildarə.
Qaldı bu halə haimü heyran,
Dedi: – Sübhanə xaliqül-imkan!
Bir əcəb dərdə mən giriftarəm,
Bilmirəm məstü ya ki huşyarəm?
Dedi nəccar: – Ey həmidəsifat,
Nədir axır bu növ ilə hərəkat?
Niyə cüft eylədin bu almanı,
Bizə məlum qıl bu mənanı.
Şər nirəngsazlıqdı məgər,
Qazilik hoqqabazlıqdı məgər?
Dedi qazi: – Tələsmə, ey nəccar,
Bu işi eyləməkdə hikmət var.
Bunu bil kim, edər bu şəkli-cəmil
Ər ilə övrət ülfətin təkmil.
Ey əzizim, görüblər əhli-təmiz

Bu duanı nikah üçün təcviz.
Bu dua nüsxəsi qalıb əmma
Evdə, ey mərdi-arifü dana.
Səbr elə, ta gedim onu gətirim,
Səni vəsli-nigarə tez yetirim.
Çünki gəldi evinə zarü məlul,
Gördü bir əmrə övrətin məşğul.
Dedi övrət ki, ey ədibi-zaman,
Halına qalmışam bu gün heyran.
Eyləyirsən mənə nigah neçün,
Çox çəkirsən ciyərdən ah neçün?
Cümlə karın xilafi-adətdir,
De görüm səndə bu nə halətdir?
Yoxsa ey çeşmeyi-çirağı-ümid,
Gətirib çeşmin abi-mirvarid?
Yoxsa dərmanə olmusan möhtac,
Ey gözüm nuri, bəs tez eylə əlac!
Dedi qazi ki, ey büti-Kəşmir,
Nə bəladır ki, düşmüşəm məni-pir.
Sən ki, bilfel əhli-hikmətsən,
Nə olub kim, bu halə düşdüm mən?
Dedi:–Bu dərd olur rütubətdən,
Mədə içrə olan kəsafətdən.
Bir də, hər kəs yedisə vəqti-təam
Loğmeyi-şübhənak, ya ki həram,
Bu rütubət olur o təğziyədən –
Ki, olur kur dideyi-rövşən.
Əvvəlin payəsində bu azar
Gözdə bir illət eyləyər izhar.
İki şəxs, ey fəzailə came,
Ona bir şəkldə olur vaqe.
Eyləməz bir dəqiqə səbrü qərar,
Seyr edər misli-günbədi-dəvvar.
Bu əlamətlər ol mərəzdəndir,
Bu ədalar xud ol qərəzdəndir.
Qazi bir ah çəkdi, ağladı zar,
Dedi: – Torpaq başıma, ey yar!

Dünən ölmüşdü mərdi-nütfəhəram,
Ramazan oğlu Məşhədi Bayram.
Qalmış idi evində neçə yeim,
Onların malın eylədim təqsim.
Yedim ol evdə bir qədər həlva,
Yəhtəmil ki, həram imiş o ğiza –
Ki, bu vəsvasə mən düçar oldum,
Gözümə dərd gəldi, xar oldum.
Bəs gedim, müntəzir qalıb nəccar,
Oxuyum əqdini onun naçar.
Hər nə pul ondan eyləsəm peyda,
Gətirim bəs alaq bu dərdə dəva.
Beyti-nəccarə qazi oldu rəvan,
Yenə gördü oturmuş ol canan.
Övrətin qövlünə inanmış idi,
Sözünü cümlə doğru sanmış idi.
Əyləşib qazi, çəkdi bismillah,
Yenə bir yarə məxfi qıldı nikah.
Dəxi sövti-qəzəblə, ol dildar,
Dedi: – Ölsün əzizin, ey nəccar,
Getdi badi-fənayə nam ilə nəng,
Kimdü bu mərdi-lutiyi-sərhəng?
Üzümə hər zaman baxır qıyqac,
Dur, bu evdən bunu elə ixrac!
Qaziyi-bülfüzul imiş bu cənab,
Lutiyi-sırf imiş bu xanəxərab!
Məni bu dami-qəmdən eylə rəha,
Qalmadı bəzmi-eyşimizdə səfa.
Hey vurub qaziyə o dəm nəccar,
Dedi: – Mən oldum ömrdən bizar!
Nə qədər, ey zəmanə mümtazi,
Edəçəksən bizimlə sən bazi?
Getdi əldən dəxi o saəti-xub,
Həq səni eyləsin görüm məyub!
Dedi qazi ki, hiç eyləmə bak,
İki gün xoşdu gərdişi-əflak.
Sənə, ey bifərasətü kovdən,
Saəti-nikü bəd deyil rövşən.

Sən deyilsən sitarədən hali,
Kimə sən öyrədirsən əhvali?
Sənə nəccarlıq olub pişə,
Sənə lazımdır ərrəvü tişə.
Nə bilirsən ki, sən nədir təslis,
Ya ki tərbi, ey səfihü xəbis.
Mənə sən eyləmə bunu təlim,
Bilirəm mən, əlimdə var təqvim.
Çünki mən olmuşam bu gün möhtac,
Məni-kəhhalə müncər olmuş əlac.
Gətirib çeşmim abi-mirvarid,
Olmamış gözlərim gərəkdü səfid
Gedibən mən tapım bu işdə fəlah,
Oxuram sonra, qorxma, əqdi-nikah,
Ta ki durdu ayağə ol qəddar,
Yaxasın tutdular zənü nəccar.
Dedilər: – Ey səfihü layələm,
Həq-təala edibdir əqlüvü kəm.
Olmaya əqdimiz əgər cari,
Sənə yox zindəganlıq asari.
Gördü qazi özün həlakətdə,
Bir zaman qaldı fikrü heyrətdə.
Dedi ol qaziyi-qəzavü qədər,
Sən bilirsən ki, qalmışam müztər.
Əqlimi fikr apardı, huşumu bad,
Oxuram əqdi, hərçi badabad!
Əlqərəz, çarə tapmayıb qazi,
Oldu əqdi-nikah üçün razi.
Oxudu siğə, cari etdi nikah,
Dedi: – Oldu sizə cima mübah.
O zaman var idi belə adət –
Ki, öpə qazinin əlin övrət.
Gəldi öpsün əlin o zibarəxt,
Əlini qazi vurdu burnuna səxt.
Qanadı burnu, qan rəvan oldu,
Daməni-yar qan ilə doldu.

Gəlibən evdə gördü övrətini –
Ki, edib parə-parə surətini.
Bürüyüb cümleyi-libasını qan,
Eyləyir ahü naləvü əfğan.
Dəmbədəm başına tökür torpaq,.
Dilinin zikri "əttəlaq təlaq"!
Belə ərdən gərək olam bizar –
Ki, olub aşiqi-zəni-nəccar!
Qazi heyran qalıb çəkib ahi,
Qüssədən çöhrəsi olub kahi.
Yerə düşdü başından əmmamə,
Parə qıldı o, qüssədən camə.
Dad çəkdi ki, ah, yüz bidad,
Qəlbdən qıldı naləvü fəryad.
Bangi-qazi yetişdi nəccarə –
Ki, çəkir nalələr o biçarə.
Qazinin gəldi yanına nəccar,
Gördü candan dəxi olub bizar.
Yerə düşmüş başındakı dəstar,
Yox ayağında kəfş ilə şalvar,
Başına qoydu öz əmaməsini,
Pak qıldı ridavü caməsini.
Dedi: – Aya, nədir bu dadə səbəb,
Halətin görsənir nəzərdə əcəb?
Bu nə fikrü xəyaldır vəsvas,
Tutmusan hansı bir əzizinə yas?
Bu işin rəncdir, həmaqətdir,
Övrətə baş qoşan kəs övrətdir.
Naqisül-əql olur hamı övrət,
Eyləsən bəhs, görməsən ləzzət.
Eyləmə öz-özün belə rüsva,
Bu deyil feli-mazi, ey molla.
Övrətin zəmminə xudayi-rəhim
Buyurub: – "İnnə geydəkün nə əzim"*.
Oların əsli-zatı kəcdir, kəc,

---

* Onların hiylələri böyükdür.

Hər qüsuruna açma göz, qoy keç.
İstəsən səndən ola zən razi,
Halü müstəqbəlini qıl mazi.
Onların hiylələri böyükdür.
Fitneyi-aləmə səbəbdir zən,
Müxtəsər, əsli-zatı çəpdir zən.
Səhldir inciyib xanım səndən,
Bir nəsihət edim, eşit məndən.
Məhkəmə içrə tütgilən aram,
O dilaram ta sənə ola ram.
Saralır firqətində gülnari,
Ağ üzə əşki-al edər cari.
Ta peşiman ola səyağından,
Sülh edər şövqi-iştiyağından.
Yalvarır, barışır səninlə o şux,
Mehri artıq olur sənə söz yox.
Yalvarıb sülh edər səninlə müdam,
O qəzali-hərəm olur sənə ram.
Qaziyə biriya göründü bu pənd,
Pəndi-nəccari qıldı xeyli pəsənd.
Çəkdi əl etdiyi fəzihətdən,
Getdi vəsvası ol nəsihətdən.
İstədi övrətə edə tənbeh,
Məhkəmə içrə tutdu yer o səfeh.
Övrətə müjdə aparıb nəccar
Dedi: – Əl məkrdən çək, ey dildar.
Qaziyi-əhməqin işi bitdi,
Oldu xürrəm, muradına yetdi.
Dur ayağə büsatı qıl çidə,
Elə bəzmi-nişatı bərçidə.
Məhkəmə içrə eylədi mənzil –
Ki, fəraqı sənə ola müşkil.
O sənəm qıldı çidə bəzmi-sürur,
Oldu nəccarə yar, eylədi sur.
Düzdülər hər nə var, mayəhtaç,
Verdilər mayeyi-cimayə rəvaç.

## OĞLUMA NƏSİHƏT

Ey oğul, olma çox da sadəzəmir,
Ta sənə mərdüm eyləyə təzvir.
Xəlq olub məkrü hiylədə kamil,
Sadəlövh olma sən də, ey qafil.
Zirək ol, yaxşıya yaman olma,
Xəlqdən çox da bədgüman olma.
Hər sözü yoxla, eyləmə bavər,
Dari-dünyadə azdı doğru xəbər.
Çoxdu dünyadə mərdi-hiyləşüar,
Zahiri sadədil, özü əyyar.
Məsti-layəqil olma, huşyar ol,
Xəlqin övzainə xəbərdar ol.
Necə kim, bu hekayəti-ziba
Sənə bu macərani eylər əda:

### SADƏLÖVH BƏRMƏKİN ƏHVALATI

Bir nəfər şəxsi-sadeyi-Bərmək
Şəhrdən gəldi aldı bir eşşək.
Çəkdi əfsarin, oldu rahə rəvan,
İki əyyar nagəh oldu əyan.
Birisi tutdu söhbətə ani,
Açdı yol üstə nəqli-tulani.
Biri eşşəkdən aldı əfsari,
Başına ta ki saldı əfsari.
Düşdü dalınca anın oldu rəvan,
Bu elə bildi kim, gəlir heyvan.
Gəldi ol eşşəyi apardı rəvan,
Eylədi bir təvilədə pünhan.
Bir qədər rah getdi ol sadə,
Dalına baxdı bir o əsnadə,
Gördü kim, eşşəyi olub insan.
Bir zaman qaldı valehü heyran.
Düşdü əyyar onun əyağinə,
Soluna keçdi, gah sağinə.

Ərz qıldı ki, ey fəriştəliqa,
Canım olsun qədəmlərüvə fəda!
Sən nə xoşyümni-şəxsi-valasən!
Xızrsan, yoxsa kim, Məsihasən?
Dedi: – Mən əvvəli bir adəm idim,
Mən də sən kimi bir mükərrəm idim.
Var idi məndə bir himari-xidam,
İşlədərdim onu qapımda müdam.
Gəlsə sudən, gedərdi tez oduna,
Gündə nökərlərim döyüb buduna,
Gündə yüz yol vurardılar dəyənək,
Sağrısı sərbəsər olub döyənək.
Nə tumari, çulu, nə arpası,
Görməyib arpa hiç torbası.
Gecə gər görsə göydə kahkəşan,
Özünə binəva bilərdi saman.
Görməyib axurunda hərgiz cov,
Dalı yağır, dəxi ayağı cidov.
Bəs ki zəhmətlə dərdnak oldu,
O himar aqibət həlak oldu.
Bu mükafat üçün cahanda xuda
Məni etmişdi eşşək, ey ağa.
Neçə illərdi kim, bu halətlə
Eşşək idim həzar zəhmətlə.
Sən ki, oldun mənim xəridarım,
Səndən iqbalə döndü idbarım.
Sən ki, aldın məni-günəhkari,
Əfv edibdir günahımı tari.
Yenə lütf etdi surəti-insan,
Oldum insan, ey fəriştənişan.
Sənə mən indi zərxərid, qulam,
Qul desən qul, oğul desən oğulam.
Dedi ol sadədil ki, ey heyvan,
Çün səni əfv edib xudayi-cahan,
Yenə verdi əzəlki surətüvü,
Lütf qıldı haman fərasətüvü.
Get, səni mən də eylədim azad,
Etmə bir eşşəyə dəxi bidad.

Aldı əfsarını, rəha qıldı;
Ona əyyar çox dua qıldı.
Dedi: – Yarəb, əziz hörmətinə,
Xəri-ehyasının kəramətinə,
Get, görüm həqqi-həzrəti-İsa
Səni eşşəksiz etməsin mövla!
Ol biri gün ki, sübh oldu əyan,
Dolub eşşəklə çarsuyi-cahan.
Yenə həngami-sübh ol dehqan
Eşşək almağa oldu şəhrə rəvan.
Yenə şəhr içrə gördü ol minval,
Satır əvvəlki eşşəyi dəllal.
Gedib ol eşşəyin qabağinə,
Dedi ağzın qoyub qulağinə:
Adəm idin dünən ki, sən bişək,
Yenə oldun bu gün neçün eşşək?

## XORUZ VƏ ÇAQQAL HEKAYƏSİ

Sübh vəqtində bir qoca çaqqal
Aclıq etmişdi çox onu bihal.
Gördü kim, bir xoruzi-rənginmu
Eyləyir bir ağacda “quqqulu-qu”.
Sordu çaqqal: – Ey xoruz, nə var?
Dedi: – Vəqti-nəmazdır əzkar.
Bu minar üstə mən əzan verirəm,
Xəlqə sübh olduğun nişan verirəm.
Dedi kim, ey xoruzi-xoşavaz,
Düş əşağə, qılaq xudayə namaz.
Dedi: – Bəs qoy imamız gəlsin,
Vacibül-ehtiramımız gəlsin.
Dedi: – Kimdir imamın, ey zirək?
Dedi: – Kənd içrə zorba, qıllı köpək.
Dedi bəs mən gedim bulağə tərəf, .
Dəstəmazım mənim olubdu tələf.
Köpək adın eşitcəyin çaqqal
Xövfdən durmadı, qaçıb filhal.

## HƏMƏDAN KƏNDİNİN HEKAYƏSİ

*Allaha ruşvət*

Həmədan ölkəsində xud əlan
Vardı bir qəryə, xəlqi çox nadan.
Necə var bizdə qəryeyi-Lahic,
"La" bemənayi-hiç, "hiç" də hiç.
Bir il ol qövmə qəht olur baran –
Ki, qalırlar səfilü sərgərdan.
Edir ol qövmi-zar cəmiyyət –
Ki, gərək tanrıya verək rüşvət,
Ta bizə göydən endirə baran.
Bir qədər simü zər qılıb saman,
Bağlayıb dəstmalə simü zəri,
Verdilər kətxudayə simü zəri.
Kətxuda azim oldu mövlayə,
Düşdü biçarə kuhü səhrayə.
Gəzdi səhrani zarü sərgərdan,
Əldə rüşvət, özü xuda-cuyan.
"Rəbbi ərni"* deyib gəzirdi rəvan,
Nagəhan bir səvarə oldu əyan.
Demə kim, bir əmiri-şahsəvar
Eyləyibmiş o gündə əzmi-şikar.
Əldə şahini-ahənin mixləb,
İki tazi yanında tövqi zəhəb.
Görcəyin ol əmiri-zişani,
Tutdu heyrət o mərdi-nadani.
Belə fikr etdi kim, xudadır bu,
Dedi kim, dərdimə dəvadır bu.
Yüyürüb səcdə qıldı ol kövdən,
Dedi: – Ey xaliqi-zəminü zəmən!
Məni göndərdi bir bölük füqəra
Ərz edirlər ki, ey şəhi-vala,
Bu qədər simü zərdi rüşvətimiz,
Yoxdu bundan füzunə qüdrətimiz.

---

* Allahım, görün.

Bizə barani-rəhmət eylə əta,
Nari-qəht ilə yanmasın füqəra.
Ol əlün üstə Cəbrəilə qəsəm,
Bu iki şux Əzrəilə qəsəm.
Bizi rəhmətdən eyləmə növmid,
Qifli-məqsudə şəfqətindü kilid.
Bildi kim, əqli yoxdu, müxtəsəri,
Aldı, etdi qəbul simü zəri.
Dedi: – Oldu qəbul rüşvətüvüz,
Yaxşı niyyətdü, qorxma, niyyətüvüz.
Bu gələn cümə biqüsuru güman
Sizə inzal eylərəm baran.
Şad olub gəldi ol fəqir, səhər,
Verdi bu macəranı xəlqə xəbər.
Dedi: – Gördüm xudayi-ərşi-bərin,
Əlinin üstə Cəbrəili-əmin,
İki Əzraili yanında əyan,
Tizçəngalü ahənindəndan.
Görcəyin səcdə eylədim bünyad,
Eylədim rüşvətimi pişnəhad.
Gərçi bir töhfeyi-mühəqqər idi,
Leyk ikram ilə qəbul elədi.
Ruzi-cümə o mənbəyi-ehsan
Bizlərə vədə eyləyib baran.
Əzqəza, ruzi-cümə yağdı yağış,
Mürtəfe oldu seyl yeddi qarış.
Qəryə heyvanları həlak oldu,
Xəlq tufanla zəhrəçak oldu.
Dedilər: – Ol xudayi-biminnət
Harda görmüşdü min tümən rüşvət?
Pulu çox gördü, eylədi ifrat,
Deyəsən ki, atıbdı həbbi-nişat.

## BİR AXMAĞIN HEKAYƏSİ

Var idi Baxərəzdə bir əhməq,
Vəh, nə əhməq ki, əbləhi-mütləq.
Bir zaman Bəlxdən gəlirdi bəri,
Yıxılıb ta ki yolda öldü xəri.

Çığırıb hərçi eylədi fəryad,
Gördü fəryad eyləməz imdad.
Növhədən eşşək olmadı zində,
Dərisin soydu ol pərakəndə.
Pustin saldı duşə, oldu rəvan,
Hər kimi yolda gördü ol heyvan
Dedi ki, gördüz eşşəyimi gedən?
Yetişibdirmi şəhrə indiyəcən?
Dedilər: – Xeyr, görmədik eşşək,
O deyərdi, yalan deyir bişək.
Bir neçə aşinayə oldu düçar –
Ki, tanırlardı anı hər necə var,
Dedi: – Gördüzmü yolda bir eşşək,
Rəngi qarə, uzun qulaqları şək?
Cilddən eşşəyim çıxıbdır haman,
Məndən əqdəm evə olubdu rəvan.
Dedilər: – Bu hekayə böhtandır,
Eşşəyin şəhrdə nümayandır.
Səndən, ey bülhəvəs, küsübdür eşək,
Yetişib şəhrə bil ki, indiyədək.
Bilirik, biz küsüb gedib o əlil,
Özünü qaziyə salıbdı dəxil.
Şəhrə varid olan kimi dərhal,
Qaziyə get bəyan elə əhval.
Eşşəyinlə səni o əhli-fəlah
Sülh edib ta ki eyləsin islah.
Varidi-şəhr olub gecə o cənab,
Öz evin gəldi qıldı dəqqülbab.
Pəsi-dərdən xitab eylədi zən,
Dedi: – Ey qapını döyən, kimsən?
Dedi: – Ey övrət, Əhmədəm, cüllah,
Şövhərin, sahibi-himari-siyah.
Fəthi-bab oldu çün ona hasil,
Evinə Əhməd olmadı daxil.
Dedi övrət ki, gəlsənə, a kişi!
Dedi: – Çoxdur hələ kişinin işi.
Hələ mən doğrudan ki, gəlməmişəm,
Bir xəbərçün bu əzmi eyləmişəm.

Dərisindən çıxıb himari-siyah,
Yıxılıb yolda verdi can nagah.
Leyk yolda neçə rəfiqi-kühən
Dedilər: – Eşşəyin küsüb səndən.
Gedibən qaziyə düşübdü dəxil –
Ki, onu saxlasın yanında bir il.
Dedi övrət ki, doğrudur bu xəbər,
Bilirəm, çünki ölməyibdir xər.
Budur, evdə durubdur əfsarı,
Düşmənin öldürə onun tarı.
Olma divanə, ölməyib mərkəb,
Get elə qazidən himarı tələb.
Yanına saldı oğlun ol əbləh,
Oldular kam üçün rəvaneyi-rəh.
Dedi: – Ey nuri-didə, eyləmə şək,
İnşaallah ki, sağdır eşşək.
Bəlxdən ta ki gəlmişəm vətənə,
Eşşək öldü, deyən yox idi mənə.
Etmişəm hər kimi görəndə soraq,
Dedilər hamı eşşəyindir sağ.

## SƏFEH QAZI

Vardı bir qaziyi-bülənd-cənab,
Əzqəza bir gecə oxurdu kitab.
Gördü qazı yazıbdılar hikmət –
Kim, ola kimsədə bu iki sifət:
Başı kiçik ola, uzun rişi,
Olur əhməq zəmanədə o kişi.
Dedi, ey vay kim, bu iki sifət
Tapılır məndə, bəs zəhi xiclət!
O gecə pərt oldu əhvali,
Sübh şagirdin eylədi hali.
Dedi şagird: – Ey imami-mübin,
Olma bu fikrdən əbəs qəmgin.
Lilləhül-həmd kim, kəmalın var,
Gözəl adabü yaxşı halın var.

Bu deyil şərü fiqh məsələsi,
Gəlib əhli-qiyafənin həvəsi,
Çox yazıblar bu növ əhvalat,
Etibarı nədir onun, heyhat!
Dəfeyi-sani, ol rəfi-cənab
Oxuyurdu gecə evində kitab.
Yenə ol sərgüzəştə oldu düçar.
Dedi kim, xeyr, məndə var asar.
Etdi şagird vəsfimi zahir,
Mənə verdi təsəlliyi-xatir.
Məndə əhməqliyin əlaməti var,
Bəs gərək çarəsin tapam naçar.
Başa əmmaməni böyük qoyaram,
Olu başım böyük, tutar aram.
Kəsərəm nisfini çü saqqalık,
Rəf olur qüssəsi bu əhvalın.
Olmasam mən əgər uzunsaqqal,
Məni əhməq deməzlər əhli-kəmal.
Bir vəcəb tutdu rişin ol mürtaz,
Axtarıb evdə tapmadı miqraz.
Tutdu rişin çirağa, odlandı,
Yandı saqqalı, həm əli yandı.
Qoydu əldən təmam saqqalı,
Sərbəsər yandı həm rüxi-alı.
Həmi yandırdı saqqalın, həm üzün,
Alov az qaldı kim, çıxarda gözün.
Yerbəyerdən üzü tuluqlandı,
Özünün axmaq olduğun qandı.

## TACİRİN AXMAQLIĞI

Vardı bir mərdi-sahibi-rövnəq,
Tacir idi və leyk çox əhməq.
Açmış idi füruş üçün dükkan,
Vardı bir cüft onda ənfiyədan –
Ki, haman zərflər tiladən idi,
Nə tila, zərri-pürbəhadən idi.

Bir yəhudi ki, düzd idi, əyyar,
Rubəhi-nər misalı hiylətkar.
Gəldi dükkan-ara o pürhiylət,
Sordu kim, bunlara nədir qiymət?
Dedi kim, qiymətin deyim sənə düz,
Bu biri yüz manatdır, ol iki yüz.
O yəhudi bu qiymətə bitdi,
Yüz manatlıq qabı alıb getdi.
Keçdi bu qissədən neçə saət,
O yəhudi yenə qılıb ricət,
İstədi ondan ol qalan qabı.
Gör nə təzvir edir o qüllabı?
Dedi ki, yüz manat çatıb sənə düz,
Bu da öz qabın, oldu bu iki yüz.
Çatdı çün iki yüz manat bu dəm,
Ol biri qabı bəs dur eylə kərəm.
Sandı yoxdur bu əmrdə nöqsan,
Verdi ol qabı taciri-nadan.
Aldı ondan yəhudi zərfi-zəri,
Elə getdi ki, yox hələ xəbəri.

## SADƏLÖVH NÖKƏR

Seyyida, olma əhməq ilə yar,
Ta səni əhməq etməsin zinhar.
Belə təqrir edibdir əhli-bəyan –
Ki, müəssirdir ülfəti-insan.
Elə təsdiq kim, bu söz həqdir,
Əhməqin yoldaşı həm əhməqdir.
Əhməqin yoxdur əql ilə karı,
Bilməz əhməq səyaqi-göftarı.
Sən deyərsən ki, asimandır bu,
O deyər, ari, risimandır bu.
Guş qıl kim, bu xoş rəvayətdir,
Gərçi bir müxtəsər hekayətdir:
Var idi bir əmiri-sahibzər,
Muzd ilə saxlamışdı bir çakər.

Leyk ol çakər əhməq idi, zəbun,
Fəhmdən dur, huşdən məğbun.
Dedi bir gün əmir o gümrahə –
Ki, filan kimsə gəlsə dərgahə,
Məni səndən sual qılsa əgər,
Degilən evdə yoxdu, getdi səhər.
Başa düşdünmü mən deyən hali,
Yaxşı oldunmu bu sözə hali?
Dedi: – Düşdüm başa bunu, amma
Nə deyim gəlməsə bəs, ey mövla?

## OĞLUMA NƏSİHƏT

Ey oğul, olma xəlq-ara nəmmam,
Oldu nəmmam kimsə zati həram.
Olma nəmmam, ey ətayi-əzim,
Dedi nəmmamı həq: "ütillü zənim".
Mərdi-nəmmamə həmnişin olma,
Əhli-hal ol, müzəbzəbin olma.
Nəhy qılmış cənab peyğəmbər,
Dedi: – Bundan ona aparma xəbər.
Xəlq edərsə yanında göftari,
Qədri-məqdur saxla əsrari.
Fitnəyə bais oldu doğru xəbər,
Yalan o doğrudan düşər behtər.
Kizbü böhtanə eyləmə adət,
İftiradən həmişə qıl nifrət.
Tabe ol əmrə, əhli-iman ol,
Olma şeytani-ins, insan ol!

HEKAYƏT

Gördü bir mərd kim, məgər şeytan
Bir uçuq büqədən baxır pünhan.
Uzadır başını, çəkir hər dəm,
Dedi: – Ey düşməni-bəni-Adəm,
Nəyə məşğulsən, bu yerdə nə var?
Dedi: – Ahəstə eylə kim, göftar,
Neçə günlərdi çəkmişəm zəhmət,
Tapmışam bir kişiylə bir övrət.
Etmişəm onları bu gün iğva –
Ki, bu viranədə edillə zina.
Az qalıb işləri təmam olsun,
Dedi: – Bu ad sənə həram olsun!
Aduvi qoymusan əbəs şeytan,
Tutduğun əmri-şeytənətdən utan!

Neçə gün zəhmətindən, ey rüsva,
Edəcək axır iki şəxs zina?
Nə hünərdir bu, nə rəşadətdir,
Sənə bu mayeyi-xəcalətdir.
Gör mən indi nə iş təmam edərəm,
Sənə şeytanlığı həram edərəm.
Dedi: – Get qoççağım, görüm bari.
Getdi ol şum bir oba sari.
Dedi: – Ey xançobanlı taifəsi,
Görməyirsiz gəlir tüfəng səsi?
Sizi öldürməyə Bağırbəyli
Atlanıb əl-ayağı çirməkli.
Onlara çox yaman iş eyləmisiz,
Bir dana quyruğu siyirləmisiz.
Bunlar amadə oldu etməyə cəng,
Kimi xəncər götürdü, kimi tüfəng.
Bunları hazır eyləyib yeksər,
O biri qövmə getdi verdi xəbər.
– Ey Bağırbəyli! Xançobanlı gəlür.
Bu yavuq dəmdə qanuvuz tökülür.
And içiblər təmam Quranə,
Boyasınlar sizi qızıl qanə.
Sözümə etməsəz əgər bavər,
Göndərin bir nəfər xəbərdən ötər.
Həm bular cəngə oldu amadə,
Durdular müntəzir o səhradə.
Düşdü ol gün arayə çərxəçilər,
Aqibət şölə çəkdi atəşi-şər.
Çəkdilər tiğ, tökdülər çox qan,
Yüz nəfər qanə oldular qəltan.
Getdi ol mərd gördü kim, şeytan
Hələ viranəyə baxır əlan.
Dedi şeytanə: – Uff, ey bədnam!
Bir zina olmayıb hənuz təmam?
Gör ki, mən tutmuşam nə əfsanə,
Boyadım aləmi bu dəm qanə.

Dedi şeytan ki, ey səfihü dəğa,
Mən gərək bunları edəm iğva,
Ta ki gəlsin vücudə, ey bədnam,
Sən kimi bir şəriri-nütfəhəram –
Ki, belə məsdəri-fəsad olsun,
Fitnəəngizü bədnihad olsun.
Necə sabiqdə valideynüvü mən
Etdim iğva, vücudə gəldin sən.

## OĞLUMA NƏSİHƏT

Ey oğul, xəlqə söyləmə böhtan,
Yaxşıya yaxşı ol, yamanə yaman.
Əsldə yaxşı olsa bir dana,
Sən "yamandır" – demək deyil ziba.
Tutalım, sən gülü dedin "bədbu",
Xəlq söylər ki, əqlsizdir bu.
Sənə bir yaxşı kimsə olsa yaman,
Xəlq onu söyləməz yaman, ey can.
Yaxşıdır ol ki, əsli, bünyani,
Sən "yamandır" – desən nə nöqsani?
Sən dedin ki, deyil xəlifə Ömər,
Ömərə bu kəlamdən nə zərər?
Sən dedin ki, deyil imam Əli,
Olmadı zaye ehtirami-Əli.
Dedilər Müstəfani sahirdir,
Var cünuni, səfihü şairdir.
Tapmadı şəni-Müstəfa nöqsan,
Yaxşını eyləmək olurmu yaman?!

## İRƏVAN TACİRİ

Bir nəfər irəvanlı bazərgan,
Hacitərxanə pənbə etdi rəvan.
Oldu bazari-pənbə xeyli rəvac,
Onu həllaclər edib tarac.
Birə beş nəf edib o bazərgan,
Dedi: – Ey pənbə, ey mətai-giran,
Töxmüvi gətdi Həzrəti-Adəm
Bağı-cənnətdən, ey fəriştəxidəm!
Məryəmə səndən oldu pirahən,
Zindəyə caməsən, şəhidə kəfən.
Ey olan Yusifi-əzizə qəba,
Çeşmi-Yəqubə səndən oldu ziya.

O biri il yenə o bazərgan
İki ol qədr pənbə etdi rəvan.
Əzqəza, nırxi-pənbə oldu kəsad,
Pənbə eyşin o eylədi bərbad.
Getdi xüsranə sudü sərmayə,
Düşdü sövdagər özgə sövdayə.
Dedi: – Ey pənbeyi-pəlidsəmər,
Səndə olsaydı bir şərafət əgər,
Səni qoymazdılar ölü...
Çulğamazlardı mürdə hacətinə.

## OĞLUMA NƏSİHƏT

Cəfər, ey xəstə cismimin cani,
Səd ya nəhs olan günü tani.
Səd o gündür ki, kam ola hasil,
Olasan öz muraduva vasil.
Nəhs o gündür ki, qismətin qəmdir,
Sənə ol aşiri-məhərrəmdir.
Birinə nəhs olan gün , ey dana,
Birinə səd olur, deyil bu həba.
Belədir karü bari-cümlə cahan,
Birinə sud olur, birinə ziyan.
Birinə bir zaman olur xürrəm,
Birinə ol zaman olur matəm.
Kim ki, bir qəmdə əhli-matəmdir,
Eydi-novruz ona məhərrəmdir.

MİSAL

Çarşənbə günüydü, bir tacir
Pul itirmişdi, tapdı bir facir.
Dedi tacir ki, nəhs gündür bu.
Dedi facir: – Bu gündü ruzi-niku.
Nəhslik görmürəm bu gündə hələ,
Hər günüm kaş ki olaydı belə!
Bəxtimin kövkəbində var rüfət,
Əlimə gəldi bir belə dövlət.
Bu günü nəhs kim deyib, həzyan?
Bu günə canü dil ola qurban.
Hiç aləmdə olmayıb belə gün ,
Həll olub müşkülüm, açıldı düyün.
Eydi-novruzdən bu behtərdir –
Ki, bu gün mətləbim müyəssərdir.

MİSAL

Bir nəfər əhli-hal edibdi sual
Mürtəzadən ki, ey sipehri-kəmal,
Nədir elmi-nücumdə rəyin,
Varmı təsiri Zöhrəvü Ayın?

Dedi: – Ol afitabi-çərxi-ülum –
Ki, əsərsiz deyil cəhanə nücum,
Nəfsiz elm yoxdur aləmdə,
Nurdir elm qəlbi-adəmdə.
Dedi iyzəd səmani zati-büruc,
Bircə kövkəb qılır nüzulu üruc,
Şərh edibdir mənazili-qəməri,
Vardı bu cümlə kövkəbin əsəri.
Ulduza and içibdi bari-xuda,
Gör ki, "Vənnəcmdə" nədir məna.

NƏSİHƏT

Ey oğul, sanma əhli-elmi zəif,
Bil bu elmi-nücumi elmi-şərif.
Bunu quran ki, eyləməz inkar,
Neçə ayatdən olur izhar.
Vardı bir gün ki, ey düri-yekta,
Söyləyib nəhs müstəmirr xuda.
Nəql edirlər ki, şahi-ərşcənab
Dedi: – "Külli münəccimün kəzzab"*.
Bir xəbərdir ki, ey fəqirü zəbun,
Sidqü kizbə var ehtimali bunun.
Xud tutaq kim, səhihdir bu xəbər,
Ona var leyk məniyi-digər.
Dürri-təvilə olgilən qəvvas,
Çünki hər amə vardı məniyi-xas.
Zənndir çünki hökmi-elmi-nücum,
Bəs deyildir həqiqəti məlum.
Bəzi işdə münəccim etsə xəta,
Bu deyildir həqiqət eyb ona.
Leyk var bəzi hökmünün əsəri,
Mehrü mahın tutulmağı xəbəri,
Dəxi bir parə əmrü ehkami,
Rastdır yazdığı sərəncami.
Var Sədü Ütaridin şərəfi,
Bil Hübuti-Zühəldə nəhsü xəfi,

* Bütün münəccimlər yalançıdır.

Müştəri baisi-səadətdir,
Zühəlin hər işi nühusətdir.
Hər nə kim, xubü bəd olur hadis,
Ona Mərrix olur həmin bais.
Müxtəsər, hər nə vardı kövkəblər
Vardır hər birində türfə əsər.
Hamısı izni-kirdigar ilə
Nə ki təsiri-ixtiyar ilə.
Bular əsbabi-qüdrəti-həqdir,
Şər ilə həm bu söz mühəqqəqdir.
Bu şərif elmi Həzrəti-İdris
Xəlqə hikmətlə eyləyib tədris.
Bil ki, mirasi-ənbiyadır bu,
Ey oğul, elmi-övliyadır bu.
Necə kim, bu hekayət, ey zifənn,
Sənə bu mətləbi edər rövşən.
Olma qevli-münəccimə gümrah,
Bil ki, kimdir nücumdən agah.
Bil ki, sərxeyli-əsfiya kimdir,
Vaqifi-sirri-masiva kimdir.

## MÜNƏCCİM HAQQINDA HEKAYƏ

Bir gün oldu səvar şiri-xuda,
Bir qəzavətçün ol şəhi-vala.
Bir münəccim düçar oldu səhər,
Dedi: – Ey şəmsi-çərxi-pürəxtər,
Lilləhil-həmd mərdi-danasən,
Elm çərxində şəmsi-beyzasən.
Qütbsən, ləşkərin kəvakibdir,
Xeyli-əncüm sipehrə rakibdir.
Sənə əklili-çərx taci-vüqar,
Astanündə kəlbi-bəstəcəbar.
Sailin kim, cahanda yüz mindir,
Həm biri qissətül-məsakindir.
Ey olan kainatdən əfzəl,
Cümlə ramehləri qılan əzəl.

Sən Süleymansən, pəri bu sipah,
Nəsri-tairdü hüdhüdün, ey şah.
Səndədir zövqi-kövkəbi-Şira –
Ki, yetər qətlə səndən ali-zina.
Mehrru, müştərisəadətsən,
Kövkəbi-çərxi-övci-rüfətsən.
Etmisən ey əmiri-cinnü bəşər,
Nə yaman nəhs gündə əzmi-səfər?
Nəcmi-nəhseyn eyləyibdi qiran,
Biri Mərrixdir, biri Keyvan.
Dedi Heydər rəsulə, bəs Dəbran
Hansı kövkəblə eyləyibdi qiran?
Şərh qıl bəs ki, kövkəbi-Şira
Hansı mənzildə eyləyib məva?
Eylə izhar kim, filan kövkəb
Hansı kövkəblə müqtərindi bu şəb?
Bu qəbil ol sipehri-fəzlü kəmal
Ol münəccimdən etdi xeyli sual.
Qaldı heyran münəccimi-dana,
Söylədi bilmirəm mən, ey mövla.
Sən özün vazei-kəvakibsən,
Sahibi-midhətü münaqibsən.
Bəs o xurşidi-çərxi-fəthü zəfər
Verdi öz fəthini o şəxsə xəbər.
Dedi: – Əfvaci-zümreyi-taği –
Ki, bizimlə olar olub yaği
Mərdümi-Kufədir, xəvaricdir,
Xilqəti-zati nari-maricdir.
Ədədi onlarındı doqquz min,
Cümləsi bədnihaddır, bidin.
Onların cümləsi həlak olacaq,
Tiği-qəhrimlə sinəçak olacaq.
Hər minə bir nəfər olur bizdən.
Qaldı ol mərd mat bu sözdən.
Necə ki, söyləmişdi şiri-xuda
O sifət macəra olub peyda.

## MÜNƏCCİMİN HEKAYƏSİ

Var idi bir münəccimi-əyyam,
Ona Pərviz edərdi çox ikram.
Bir gün ərz etdi: – Key şəhi-dövran,
Görmüşəm mən nücum ilən ki, həman
Mənə bu həftə bir bəla gələcək,
Məni bir şəxsi-şum öldürəcək.
Yazığam, ta tökülməsin qanım,
Ola lütfün mənim nigəhbanım.
Məni bir həftə saxla pünhani,
Ta edim dəfi-məkri-üdvani.
Şəh onu hifz edibdi yanında,
Yatdı, şəh yatdığı məkanında.
İttifaqən, gör, ol sütudəsüxən
Var idi şahə bir neçə düşmən.
Bir gecə ziri-qəsrdən əda
Urdular nəqb, etməyib pərva.
Səri-nəqb evdən olcağın naşi,
Ələ düşdü münəccimin başi.
Sandılar kim, budur səri-Pərviz,
Etdilər paymali-xəncəri-tiz.
Kəsib ol başi etdilər çü fərar,
Oldu Pərviz xabdən bidar,
Eylədi çox təəssüf ol pirə,
Bildi kim, çarə yoxdu təqdirə.

## RİYAKAR ABİD

Abidi dəvət etdi bir soltan,
Ta ola xani-lütfünə mehman.
Dedi abid ki, bir dəva yeyərəm,
Özümü mən zəif göstərərəm.
Çün görər zəfimi şəhi-dövran
Mənə eylər ibadət ilə güman.
Deyəcək kəsrəti-ibadətdən,
Abid olmuş zəif taətdən.

Etiqadi ziyad olur şahın,
Rəhməti izdiyad olur şahın.
Yedi ol bir dəva ki, qatil idi,
Dərzəman abidi həlak etdi.
Rəsmi-mərufdir ki, əhli-riya
Özünü dəhrdə edər rüsva.

## ÇOBANIN HEKAYƏSİ

Yay günü şəhrə gəldi bir çoban,
Dəyənək əldə, seyr edib hər yan.
Nagahan gördü bir nəfər baqqal,
Doldurub buz təbaqə malamal,
Səslənir hər zaman ki, "ay yəxəsər!"
Bu kəlam eylədi çobanə əsər.
Buzu ol ehtiramdə görçək,
Yüyürüb vurdu bir neçə dəyənək.
Dedi: – Bax, bax, bizi bilir qanmaz!
Elə bildi çoban bunu tanımaz.
Qışda qırdı qoyun-quzum yeksər,
Burada adını qoyub "yəxəsər".

## OĞLUMA NƏSİHƏT

Əgər olsaydı əql ilə dövlət,
Olan əqli tapardı bəs izzət.
Dövlət olsaydı gər fərasətlə,
Niyə nadan olurdu dövlətlə?
Bitəmizin əgərçi dövləti var,
Qəm yemə, həq yanında hikməti var.
Bəxtü dövlət deyil kəmal ilə,
Tapmaq olmaz onu xəyal ilə.
Belə cari olub qəzavü qədər,
Hər kəsin layiqincədir işlər.
Bil ki, təqdiri-əmrdir mazi,
Ol qəzayi-xudayə sən razi.
Dövlət olsaydı halüvə layiq,
Etməz idi müzayiqə xaliq.

Yoxdu xaliqdə zərrə büxlü həsəd,
Bu xəyalı edən olur mürtədd.
Sən çalış dövlət etməyə hasil,
Gər müqəddər olub, olur vasil.
Leyk çox ciddü cəhd bər verməz –
Ki, kötüksüz ağac səmər verməz.
Çox həris olma, ey məlaik xu,
Cəhd yırtar çarıq, məsəldir bu.
Danə səp, qıl təvəkkül Allahə,
İşüvü qıl mühəvvəl Allahə.
Gəlməmiş sən cahanə, ey dana,
Ruzüvü qismət eyləyibdi xuda.
Həq ki, müftə sənə veribdir can,
Diş verən kimsənə verər həm nan.

## ÇOBAN ƏHVALATI

Nagahan şəhrə gəldi bir çoban,
Gəzdi bazari haimü heyran.
Gördü bir xoştəranə, beynən-nas
Söyləyir: – Əssəbil, ya Abbas!
Verdi bir pul, içdi bir kasə,
Dedi: – Layiq deyil bu Abbasə.
Nagahan gördü ol əcibəsifat
Uçadan səslənir biri: – Sələvat!
Verdi üç pul, içdi sələbdən,
Dedi: – Bu yaxşıdır o məşrəbdən.
Şəhrdən çıxdı tışra, oldu rəvan,
Gördü şəhrə gedir bir özgə çoban.
Necə kim, rəsmi-rəhrəvandı bu hal,
Bir-birindən soruşdular əhval.
Dedi ol şəhrdən gələn çoban –
Ki, məbada səbilə allanasan!
Bil ki, Abbasəli deyil bir zad,
Yenə səlvatdən gəlir bir dad.

## OĞLUMA NƏSİHƏT

Ey oğul, bil ki, ol əta kani
Xəlq edib səndən ötrü dünyani.
Sənə etmiş müsəxxər əflaki,
Başına qoydu taci-lovlaki,
Məhü xurşidü çərxü əbr ilə bad
Səndən ötrü olubdular icad.
Səndən ötrü bular nümayandır,
Əmrüvə cümlə bəndəfərmandır.
Ey oğul, ərzü asimandü sənin,
Əsldə kövn ilə məkandü sənin.
Aşinadır bular sənə yeksər,
Çeşmi-biganə ilə etmə nəzər.
O çoban kimi olma, ey xoşxu,
Nagahan tapdı yolda bir güzgu.
Əlinə şadiman aldı çoban,
Baxıb öz əksin onda gördü əyan.
Dedi: – Əfv eylə, ey məlaik xu,
Elə bildim ki, səngü gildir bu.
Əksini özgə kəs xəyal etdi,
Qoyub ayinəni yerə, getdi.

### KƏNDLİ ƏHVALATI

Şəhrə varid olur bir əhli-dehat,
Qalır övzai-xəlqi görcək mat.
Görür ol binəva ki, bir baqqal
Buzdan eylüb təbaqi malamal.
Səslənir hər zaman ki, ay yəxəsər,
Saf, dürdanə, ay haray, yəxəsər.
Buz qoyubdur kişi qabağında,
Yəxəsər yox bunun tabağında.
Müttəle olmağa bu əhvalə,
Bir manat pul verir o baqqalə –
Ki, hanı bəs, gətir mənə “yəxəsər”,
Adı var, leyk yox özündən əsər.

Bir-iki parça sındırıb baqqal,
Dedi: – Qardaş, çağır gələ həmmal.
Dedi: – Səndən mən istərəm yəxəsər,
Buza pul verməyimdə yoxdur əsər.
Dedi baqqal o mərdə: – Key sadə,
"Yəxəsər" buz deməkdü mənadə.
Bildi məna, oyandı qəflətdən,
Qoydu qaçdı pulunu xiclətdən.

## MÜNACAT

Barilaha, behəqqi-həştü çahar,
Xabi-qəflətdən et bizi bidar.
Bu qədər bilmişəm ki, ey mövla,
Birdü mənada müxtəlif əsma.
Əhədü Əhmədü Bəşirü Nəzir
Bir kəsin adıdır ələttəqdir.
Adəmü Nuhü Salehü Musa,
Zəkəriyyavü Həzrəti-İsa
Hamısı bir vücud sari imiş,
Məzhəri-feyzi-külli-bari imiş.
Səməda, xaliqa, xudavənda!
Ey edən süni-aləmi peyda.
Arif etdin bizi bu əsmayə,
Elə vasil dəxi müsəmmayə.
Ləfzi-hüsnün nə isə mənasi,
Əhli-eşqin odur təmənnasi.
Arifü kamil etdi nəfyi-sifat,
Ta ki zati-həqi edə isbat.
Seyyida, faş qılma əsrari,
Yoxdu bu gövhərin xəridari.

## OĞLUMA MÜRACİƏT

Cəfəra, bavər eylə kim, Quran
Vəhydir, nazil eyləyib sübhan.
Vardı peyğəmbər əsri çox şüəra,
Etdilər çox qəsidələr inşa.
Onların mayəsi fəsahət idi,
Hamısı mənbəyi-bəlağət idi.
Neçə qərra qəsidə mülhəq idi,
Xaneyi-Kəbədən müəlləq idi.
Yazıb əshablər neçə ayə,
Ta ki versin şikəst o inşayə.
Asdılar bami-Kəbədən ani,
Şairin zahir oldu bütlani.
Oldu "ya ərzü iblə"i[*] peyda,
Ol "qifa nəbkə" vurdu nəbki-qifa.
Məhv edib səbeyi-müəlləqəni,
Zail etdi çidalü ləqləqəni.
İnsü cinn olsa cəm, ey dana,
Edə bilməz bir ayəsin inşa.
Həq kəlami hara, kəlami-bəşər?
Onu inkar edən bəlayə düşər.
Xoş deyibdir Nizamiyi-ustad,
Həqq onun qəbrini qıla abad!
Gəncə yanında qəbri virandır,
Günbədi torpaq ilə yeksandır.
"Süxən əz aləmi-kəbudaməd,
Süxən əz asiman fürud aməd.
Gər budi gövhəri vərayi-süxən
An fürud amədi becayi-süxən"
Bəhri-vəhdətdən ayrılıb ol dürr,
İbtidada kəlami-nəfsidür.
Lövhdə bir vücuddur kətbi,
Cümlə ayati-yabisü rətbi.

---
[*] Ey yer, onu [Qarunu] ud! (*ayə*)

Ey oğul, həzrəti-rəsulə ani,
Gətirib Cəbrəil hər ani.
Surə bər surə, ayə bər ayə
Nazil olmuş rəsuli-Bəthayə.
Həq kəlami, o möhkəmü tənzil –
Ki, çəkib müddəti iyirmi üç il[...]
Bu sifət cövhəri-nəfis kəlam,
Bil, iyirmi üç ildə oldu təmam.
Odur isbatə möcüzi-baqi –
Ki, qoyub zarü aciz afaqi.
Var idi əvvəli pərakəndə,
Onu bir növ oxurdu hər bəndə.
Bu səbəbdən ki, tapmasın təhrif,
Misli-butə nə kim, olubdu xəfif,
Onu cəm etdi Həzrəti-Osman,
Bu haman cəmdir ki, var əlan.
Gərçi mənası qeyri-asandır,
Kağızı, xətti, cildi Qurandır.
Harda görsən kəlami-sübhani,
Öpübən qoy göz üstünə ani.
Möcüzi-həqdü batinü zahir,
Məss etməz məgər onu tahir?
Ey gözüm nuri, ey ətayi-xuda,
Vermə təfsirsiz ona məna:
Çəkibən rəncü zəhməti-bişmər*,
Onu təfsir edib müfəssirlər.
Bilməsən hər birin o ayətdən,
Gedibən örgən əhli-xibrətdən.
Olma sən ol çoban kimi nadan,
Nagəhan yolda tapdı bir Quran,
Dedi kim, yaxşı oldu bu halət,
Mənə tari yetirdi həmsöhbət.
Açdı Qurani-paki ol əhməq,
Çevirib eylədi vərəqbəvərəq.
Görmüşəm səndə vardı xoş avaz,
Bir zaman həm çobanə ol dəmsaz.

---

* Bişümar: saysız, hesabsız

Gördü kim, xeyr, laldır Quran,
Yerə qoydu əlindən ol heyvan.
Vurdu Quranə bir neçə dəyənək,
Dedi: – Gördü çobanı oldu kənək.
Mollanı görsə mırt-mırt danışar,
Lal olur bizdə, bildiyin də çaşar [...]

## PADŞAHIN MƏCLİS ƏHLİNƏ SUALI

Etdi bir padşah məclisi-xas,
Cəm idi bəzmdə əvamü xəvas.
Dedi ol padşahi-sahibhal,
Övrətindən o kim, deyil xoşhal,
Dursun ol kəs ayağə sürətlə!
Hamısı durdular icabətlə.
Bir nəfər durmayıb ayağə rəvan,
Dedi ol padşahi-mülki-cahan:
– Durmadın tez ayağə, səd əhsən!
Razısan yoxsa övrətindən sən?
Dedi: – Heyhat, ey xədivi-cahan,
Durmağa yox bədəndə tabü təvan.
Deyiləm razi, ey fələk şövkət,
Qıçımı sındırıb bu gün övrət [...]

## PƏRVİZİN ƏHVALATI

Dedi Pərvizə kim, bir əhli-xidəm;
Sənə çox oxşayır filan adəm.
Başına qoysa tac, vursa kəmər,
Ona Pərviz söylər əhli-nəzər.
Şəh tələb qıldı ani dərgahə,
Gördü kim, həqqi, oxşayır şahə.
Dedi ol şəxsə kim, anan gəhü gah
Bizə dəllallikdə tapmış rah.
Çox süxənsənc şəxs idi o fəta.
Yer öpüb, söylədi ki, ey ağa,
Basmayıbdır anam hərimə qədəm
Hərəmə var imiş atam məhrəm.

Hərəmi-şahın abiyarı idi,
Gənci-pünhan xəzinədarı idi.
Şahə xoş gəldi ol cəvabi-dilir,
Verdi ənam, etməyib təzir.

## XƏSİS ƏHVALATI

Bir bəxilə deyib bir əhli-füsun
Bir yuxu görmüşəm, de xeyr olsun.
Dedi ki, xeyr ola yuxun, de görək.
Dedi: – "Gördüm yuxuda sizdə çörək".
Düşübən iztirabə ol sərsaq,
Gedib öz övrətinə verdi təlaq.
Olmağa qazi əmrdən agah
Dedi: – Bu övrətə nə idi günah?
Deyib ol şəxs: – Əyyühəl-qazi,
Necə bu əmrə mən olum razi?
Yuxuda bir kişi görüb çörəyim,
Durmur üstümdə indi də ürəyim.
Mənə lazımdı bir özüm təki can,
Çörəyi eylə saxlaya pünhan,
Yuxuda görmək olmaya məqdur,
Övrəti-müsrifin cəzası budur.

## XORASAN XƏSİSİ VƏ QULAMI

Şaiq, ol hadiyi-bədikəlam,
Güli-xoşətri-gülşəni-əyyam,
O kühən dürdnuşi-meyxanə,
Gəzdirib sözdə böylə peymanə –
Ki, Xorasanda var imiş bir pir,
Büxldə şəhreyi-səğirü kəbir.
İttifaqən, məgər qəzadən o il.
O bəxil aldı bir qulami-bəxil.
Büxlü ol xacədən ziyadə idi,
Əsli büxlü bəxilzadə idi.
Bir gecə xacə bang urdu; qulam
Dedi: – Ləbbeyk, ey əmiri-hümam.

Süfrə aç, hazır eylə mahəzəri,
Sonra get bağla, ey qulam, dəri.
Dedi: – Ey xacə, sən zəmani-təam
Xeyli biehtiyatsən, həm xam,
Bəlkə biz süfrə fərş edəndə həman
Qapıdan girdi bir nəfər mehman.
Deginən, əvvəl eylə bəstə dəri,
Sonradan hazır eylə mahəzəri.
Bu cavabı ki, xacə eylədi guş,
Zövqdən oldu valehu mədhuş.
Edibən ol qulamə təhsinlər,
Eylə xacə belə qulam istər.
Qapısın bağlayar həmişə ləim,
Oturar rugüşadə mərdi-kərim.

## PADŞAH VƏ BAĞBAN

Sübh bir padşah oldu səvar,
Edibən sürət ilə əzmi-şikar.
Şəhrdən çıxdı ol fələkmiqdar,
Oldu bir mərdi-bağbanə düçar.
Rəm qılıb bağbandan ol heyvan,
Yerə atdan yıxıldı şahi-cahan.
Şəh qəzəblə çağırdı fərraşın,
Dedi: – Al tiği, kəs bunun başın!
Ağlayıb söylədi o zarü fəqir:
Nədir ey şah, bəndəyə təqsir?
Buyurub: – Çünki şum adəmsən,
Səni görcək yıxıldım atdan mən.
Dedi: – Ey şah, mən dəxi bu səhər
Görmədim səndən özgə bircə nəfər.
Məni görcək yıxıldı şahi-cahan,
Leyk bir üzvü tapmadı nöqsan.
Sən nə gör şumsən, özündən utan,
Qətlimə qıldın axırı fərman.
Görməsəydim əgər bu didarı,
Olmaz idim əcəl giriftarı.

Xoş gəlib şahə ol zərif kəlam,
Ona şəmşirin eylədi ənam.
Deyib əhsəntü bu kəlamə ki, sən
Gənci-göftari-nəqzə məhrəmsən.
Ey zəban, ey kilidi-gənci-süxən,
Sən gəhi gənc, gahi əjdərsən.
Gah sən zəhrü gah şəkkərsən,
Gahi mərhəm, gəhi çü neştərsən.
Mənə hər nə bəla olur hadis,
Ona sənsən zəmanədə bais.

## LOĞMANIN VƏQƏSİ

Dörd min il ömr eylədi Loğman,
Oldu ol vəqt ömrü kim, payan,
Lifi-xurmaydı səqfü bamı onun,
Keçib ol evdə sübhü şamı onun.
Onda hər dəm ki, yatmağa uzanır,
Bədəni nisfdən eşikdə qalır.
Mələkül-mövt gəldi verdi salam,
Gördü bir evdə eyləyibdi məqam,
Əyləşibdir o evdə pirü əlil,
Rizq təhsilinə toxur zənbil.
Dedi Əzrail: – Ey hünərzadə,
Bu qədər etdin ömr dünyadə,
Niyə bir xanə etmədin təmir?
Dedi: – Haza li mən yəmutü kəsir*.

## NUHUN VƏQƏSİ

Dörd min ildən yüz əksik oldu ki, Nuh
Getdi dünyadən ol cahan-fütuh.
Dəmi-mərgində eylədilə sual:
– Necə gördün cahani, keyfəl-hal?
Dedi: – Gördüm cahani qüllabi,
Sanki bir evdü var iki babi.

---

* Ölən adama bu da çoxdur

Ta ki oldum bu babdən daxil,
Çıxdım ol babdən mən, ey sail.
Gedirəm həsrət ilə dünyadən,
Olmadım vaqif ol müəmmadən.

## HACI VƏ MOLLA ƏHVALATI

*Köpəyə ehsan*

Var idi Şahsevəndə bir haci,
Şahsevənlər təmam möhtaci.
Sahibi-dövlət idi çox ol kəs,
Naqəvü gusfəndü çoxlu fərəs.
Vardı Bozlar adında bir köpəyi,
Qoyunun pasibanı, at köməyi.
Əzqəza, bir gün öldü Bozlari,
Oldu Haci onun əzadari.
Edibən qüsl, hazır etdi kəfən,
İzzət ilə götürdü çox yerdən.
Qazıb əhli-qübur içində məzar,
Oldu mədfun qəbr-ara Bozlar.
Verdi Bozlara yeddi gün xeyrat,
İstədi həqqdən ona həsənat.
Hali olmuş bu halə bir molla,
Çəkdi fəryad, qıldı vaveyla.
Dedi: – Va milləta! Nədir bu xəta,
Zaye oldu şəriəti-qərra.
Dindən çıxdı bu güruhi-əvam,
Bərtərəf oldu hörməti-islam.
İt nədir, dəfnü kəfnü qəbristan,
Getdi əldən şəriətü Quran.
Mindi bir at molla, düşdü yola,
Ta gedir məhşər eyləsin bərpa.
Çatmamışdı hənuz o hiylətgər,
Verdilər Haciyə bu halı xəbər –
Ki, filan molla qilü qalə gəlir.
Dedi: – Yox, özgə bir xəyalə gəlir.

Sürüdən tez ayırdı əlli qoyun,
Dedi: – Siz bunları yol üstə qoyun.
Özü çıxdı onun qabağinə,
Mollanın keçdi solü sağinə.
Dedi: – Ey naibi-imami-zəman,
Sənə olsun atam-anam qurban!
Öldü Bozlar, ah, sındı belim,
Kaş gözündən bataydı cümlə elim.
Necə Bozlar, o çapükü huşyar,
Pəncədən şirü yelgədən kaftar.
Canavar ondan eylə qorxardı –
Ki, sədasın eşitcək ağlardı.
Hafizi-xeylü pasibani-rəmə,
Gecə-gündüz olan şəbani-rəmə.
Sahibi-dövlət ilə malım idi,
Baisi-sərvətü cəlalım idi.
Çox idi gərdənimdə həqqi mənim,
Dedi: – Olsun hərirdən kəfənim.
Hər vəsiyyət ki, etdi qıldım əməl,
Bir vəsiyyət sizinçün etmiş əzəl.
Söyləyib siz cənabə əlli qoyun,
Demişəm onları yol üstə qoyun.
Qoyun adın eşitdi çün molla,
Dedi: – Əhsən bu halə, nami-xuda!
İt deme, ol dəxi bizim birimiz,
Belə ölmüşlərə fəda dirimiz.
Rəhməti-həqqə ol düçar olsun,
Səgi-Əshabi-kəhfə yar olsun!
Oxuyub sidq ilə ona yasin,
Özü də saxladı onun yasin.

## BAĞDADLININ VƏQƏŞİ

Bir kişi şəkvə qıldı Məmunə –
Key çatan hökmi rübi-məskunə,
Yüz qızıl, ey şəhi-zəminü zəmən,
Vermişəm bir kəsə əmanət mən.
İndi getdim tələb qılam dinar,

Etdi inkar qıldı həm məni xar.
Dedi Məmun: – Yat evində bu şəb,
Sübh get qazidən zər eylə tələb.
Qorxma, dinarüvü əda eylər,
Könlüvün mətləbin rəva eylər.
Gər o verməzsə, mən əda edərəm,
Mətləbü məqsədin rəva edərəm.
Şəh gecə qazini qılıb mehman,
Gəldi yüz gunə neməti-əlvan.
Gəlibən məclisə o hurnəjad,
Dedi ol padşahi-niknəhad –
Key, vücudün təfaxüri-islam,
Məşriqü məğribə imami-ənam,
Ey əmamən misali-qübbeyi-nur,
Vey sözün vəhy, bəzmi-xasın Tur.
Qaziyi-çərx əmamənə bişək
Kəhkəşanın gətirdi təhtül-hənək.
Daneyi-səbhən, ey imami-zəmən,
Hər biri bir sitareyi-rövşən.
Puri-İmran kimi əlündə əsa,
"Mübtilüs-sehr"* əjdəhayi-xuda.
Xaki-nəleynin, ey nəbirəftar,
Sürmeyi-dideyi-ülül-əbsar.
Sən ki hər əmrə eylədin fitva,
Qaziyi-çərx həm edər imza.
Hökmüvün tabeyi qəzavü qədər,
Bəndeyi-dərgəhin çi xüşkü çi tər.
Özgə yerlərdə var dəxi qazi,
Bir kəs ondan vəli deyil razi.
Sən bu gün düşmüsən zəmanədə taq,
Əql ilə cüftü şöhreyi-afaq.
Nə ki tənha fərasətin vardır,
Həm əmanət-dəyanətin vardır.
Nə qədər xəlqi eylədim təxmin,
Tapmadım bir sənə bərabər əmin.

---

* Sehri batil edən

Nayibi-şəri-Müstəfasən sən,
Varisi-elmi-övliyasən sən.
Bu səbəbdən mən, ey fələk-rüfət,
Bu gecə vermişəm sənə zəhmət –
Ki, əgər eyləsən qəbul, səhər
Sənə yüz kisə göndərim mən zər.
Bir özün bildiyin yerə ani
Qoyasan qala səndə pünhani.
Gərdişi-çərxdə əgər nagah
Ali-Abbasın olsa halı təbah,
Gedə bu təxtü cahü şövkətimiz,
Çıxa əldən bu malü dövlətimiz,
Ali-Abbasi et soraq, əgər
Tapıla bir fəqirü biyavər,
Ver o zərdən ona beqədri-kifaf,
Olmasınlar zəmanədə əclaf.
Çün bu göftarı qazi eylədi guş,
Şövqdən oldu valehü mədhuş.
Dedi könlündə kim, bu əhməqdir,
Bunun əhməqliyi mühəqqəqdir.
Nəqdi allam, onu mən alladaram,
Nisyə sözdür, balıq təki udaram.
Dedi qazi ki, şahə səd əhsən!
Nə gözəl fikri-bikr eyləmisən.
Maşaallah bu fikrə, nami-xuda!
Sanki nazil olub kəlami-xuda.
Belə də fikr olur, belə əncam,
Sənə bu qeybdən olub ilham.
Şah olan böylə fikri-bikr eylər,
Eybi yox, saxlaram, səhər göndər.
Durdu qazi şəhi vida etdi,
Evinə xeyli şadman getdi.
O gecə yatmadı sürurindən",
İncinirdi sitarə nurindən.
Hər nəfəs verdi xaliqül-əsbah,
Oxuyub sübhədək duayi-"Sabah",

Bəs ki eylərdi sübh üçün təcil,
Hər dəqiqə ona gəlirdi bir il.
Sübh kim, afitabi-zərrintar,
Çıxıban zərrin eylədi izhar,
Gəldi qazi oturdu məstanə,
Müntəzir çeşmi gənci-pünhanə.
Yenə ol şəxs gəldi, verdi səlam
Və əleykəssəlam, vəl-ikram.
Hara getdin dünən çıxıb, a kişi?
Dəxi minbəd tutma böylə işi.
Bizdə qaldı dünən əmanətüvüz,
Bəlkə vardır o nəqdə hacətüvüz.
Ey mübarək, gətir o həmyani,
Müntəzir qoyma bu müsəlmani.
Gedib ol kisəni gətirdi qulam,
Verdi ol şəxsə qaziyi-islam.
Qorxdu kim, verməyə o simü zəri,
Çatacaqdır xəlifəyə xəbəri.
Onu bilsə xəlifə ər* xain,
Ona olmaz bu işdə arxayin.
Gözünü dikdi şah dövlətinə,
Müntəzir qaldı malü sərvətinə.
Şahı ol mərd eyləyib agah –
Ki, vüsul oldu qazidən tənxah.
Şah göndərdi qaziyə peyğam –
Ki, əya qaziyi-rəfi məqam,
Ey vücudi cahanda mayeyi-az,
Çox ümidiylə çıxdı əldən az.
Vədə yüz kisə çün olub təqrir,
Çıxdı bir kisə səndən, ey bipir!
Sonra min kisə zər gərəkdir düz,
Alasan ta çıxa əlindən yüz.
Afərin, ey yeganeyi-əxyar,
Sən tək olmaq gərək əmanətdar.
Bildi öz səhvini o dəm qazi,
Verməyib sud kərdeyi-mazi.

---
* Əgər

## MİR CƏFƏRƏ XİTAB

Cəfəra, rahi-batilə getmə,
Xişü əqvamə etibar etmə.
Buləhəb Əhmədin əmisiydi,
Bildin aya nə eylədi, nə dedi?
Qıldı azarlər o xanəxərab,
Dedi ol şahə sahirü kəzzab.
Oldu əhli-cəhim o bimayə,
Gəldi şənində bir neçə ayə.
Qurusun əlləri Əbu-Ləhəbin!
Kəsilir əlləri o biədəbin.
Dövlətü kəsbi etmədi çarə,
Onu həq daxil eylədi narə.
Övrəti gərdənində həbli-məsəd
Oldu həmmali-hiyzüm ol mürtəd.
Ola bir əqrəba əgər kovdan
Bil ki, biganə yaxşıdır ondan.

## ƏZUDÜDDÖVLƏNİN OĞLUNUN XƏSTƏLƏNMƏSİ

Əzudun oğlu oldu çün bimar,
Atasından tükəndi səbrü qərar.
Dedi bir abidi-fərıştənihad:
Quşları eylə bənddən azad,
Ta xuda oğluva şəfa versin,
Lütf ilə dərdinə dəva versin.
Ol xudavəndi-ədlü bəxşişü dad,
Etdi bülbülləri o dəm azad.
Leyk bir əndəlibi-nəğməsəra
Nəğməsindən müzəyyən oldu səra,
Qaldı künci-qəfəsdə zarü əsir,
Biqərarü həzinü bəs dilgir.
Əzudun oğlu ta ki tapdı şəfa,
Bilib əhvalı ol güli-rəna.
Dedi: – Ey bülbüli-Məsihnəfəsə,
Səni sövtün qoyub əsiri-qəfəs.

Olmasaydı əgər bu göftarın,
Olmaz idi bu gunə azarın.
Necə ki, Seyyidi-bədikəlam
Dil bəlasın çəkər cahanda müdam.
Nitqdəndir bəlalər insanə,
Nitq elə hər sözü həkimanə.
Demirəm ki, həmişə xamuş ol,
Nitq həngamı sahibi-huş ol.
Necə kim, Sədi eyləmiş israr;
"Əvvəl əndişə, vongəhi göftar"*.
Fikr qılmaq binadü, söz divar:
"Paybəst amədəst, pəs divar"**.

## QAZ VƏ DURNA

Bir göl içrə üzürdü bir yekə qaz,
Özünə fəxr edib uzatdı boğaz.
Dedi: – Mən bir əcibə cür quşam,
Üç hünər var məndə, xeyli xoşam.
Uçaram göydə, həm suda üzərəm,
Quru yerdə boyun çəkib gəzərəm.
Bəs mənəm quşların şəhənşahi.
Durna oldu bu nəqlin agahi.
Dedi: – Axmaqlığında yoxdur şəkk,
Qamətindir diraz, əql gödək,
Göydə tərlan tək uçmağın varmı,
Ya maral kimi qaçmağın varmı?
Bir balıq tək üzərmisən sudə,
Nədi bu göftguyi-bihudə?
Qaz utandı o göldə durnadən.
Vaqif ol, ey oğul, bu mənadən.
Yəni bir elmə daim ol talib,
Zifən ol zifünunədir qalib.
Kişi bir sənəti bilər xalis,
Çoxuna meyl edən qalar naqis.

---

* Əvvəl düşün, sonra danış

** Əvvəl bünövrə, sonra divar

## ZƏNGANLININ VƏQƏSİ

Mərdi-xoşrişi-şəhri-Zəngani,
Yuxuda, yatdı, gördü şeytani.
Saqqalından tutur deyir, ey dun,
Zatı adəmfirib olan məlun!
Uzadıbsan firib üçün saqqal,
Alladırsan cahanı, ey həyyal!
Bir neçə silli vurdu çün təkrar,
Yuxudan oldu nagahan bidar.
Görüb öz saqqalın əlində tutub,
Bir neçə silli öz üzünə vurub.
Xəndələr eylədi xəcalətdən,
Şərmsar oldu böylə halətdən.

## OĞLUMA NƏSİHƏT

Vaqif ol, ey nəcibü fərzanə,
Lən edirsən həmişə şeytanə.
Gərçi şeytanə ləndir şaye,
Kimə gör lənətin olur race,
Hər işi eylədin özün xəlvət,
Bircə şeytanə vermədin fürsət.
Sonra şeytanə lənət eylərsən,
Maşaallah, qiyamət eylərsən.
Dəyməsin göz, qəribə zirəksən,
Bu fərasətdə dəhrdə təksən.
Bir bəyan eylə ki, haçan şeytan
Sənə bir məsiyətdə oldu əyan?
Sən ki oldun bu gunə məstü xərab
Sənə şeytan nə vəqt verdi şərab?
Sənə şeytan haçan olub saqi,
Sənə kim verdi bəngü tiryaki?
Sənə şeytan nə vəqt, ey dana,
Dedi ki, gəl gedək sən eylə zina?
Övn edərkən sənə o rəbbi-ğəfur
Niyə şeytanə olmusan məcur?
Səni həq qıldı faili-muxtar,
Hər əməl qılsan, ixtiyarın var.
Xeyrü şər rahıdır sənə məlum,
Getmə sən rahi-şərrə, ey məxdum.
Səni həq şərrə etməyib məcbur,
Bu xəyalat əqldəndir dur.
Eyləməz cəbr kirdigar sənə,
Verməyib sırf ixtiyar sənə.
Ol xəbərdar kim, həkimü ğəni
Etməyib nəfsə vagüzar səni.
Sən rəha eylə cəbrü təfvizi,
Eyləmə pak dinə tərizi.
Qalma xeyrü şərin gümanında,
Seyr qıl xeyrü şər miyanında.
İşlədən şərri nəfsi-insandır,

Xaliqi-xeyrü şərr yəzdandır.
Şərrə bais demə xudanı, utan,
Yaxşıdan zahir olmayıbdı yaman.
Ol həkimü əlimü danadır,
Özü zibavü feli zibadır.

## LOĞMANIN VƏQƏSİ

Dedi bir kəs cənabi-Loğmanə:
Ey hünərvər, həkimi-fərzanə,
Hikməti kimdən iktisab etdin –
Ki, belə feyzi-əzəmə yetdin?
Dedi ki, hikməti mən, ey sail,
Kur olanlardan etmişəm hasil.
Bir yeri kur görməsə, möhkəm
Qoymaz ol mövzeü məhəllə qədəm.

## BİR KİŞİNİN MƏCNUNA İRADI

Dedi Məcnuna bir nəfər cahil:
Ey qılan eşqi əqlini zail!
O qədər ki, gözəl deyil Leyli –
Ki, ona çoxdu könlüvün meyli.
Leylinin bir lətafəti yoxdur,
Ondan əla gözəl sənəm çoxdur.
Çəkdi Məcnun sinədən bir ah,
Dedi: – Ey halə olmayan agah,
Rüxi-Leylayə, ey niku-mənzər,
Çeşmi-Məcnun ilə sən eylə nəzər.
Görəsən ta cəmali-Leylanı,
Turi-kuyindəki təcəllanı.
Olasan məhv ol təcəlladə,
Görəsən hüsni-həqqi Leyladə.
Gərçi var könlümün ona meyli
Əhli-hüsnün o güldü sərxeyli.
Mətləbim Leyliyi-həqiqətdir,
Məşrəbim şiveyi-məhəbbətdir.
Bilsə idin həqiqət, ey cahil,
Hiç bilməzdin əqlimi zail.

Eşqdir hər nə var aləmdə,
Sən də ol eşqə yar aləmdə.
Seyyida, eşqə iqtida eylə,
Eşqi tut, tərki-masiva eylə.
Mətləbin gər nəimi-sərməddir,
Sənə məşuqə bil, Mühəmməddir.
Afitabi-səma, məhi-Bətha,
Şahi-ümmi, müəllimi-əsma.
Zübdeyi-cümleyi-bəni-Adəm,
Ona olsun səlamlər hər dəm!
Canü dildən o şahə ol talib,
Eşqi-ali-Mühəmmədə rağib.

## SÜNNÜ İLƏ ŞİƏ

Bir nəfər mərdi-şieyi-xülləs,
Şiəlik zati-pakına müxtəs –
Ki, aparmışdı dən dəyirmanə,
Çatmış idi ulağə mərdanə.
Palçığa batdı yolda ol eşşək,
Tayları düşdü palçığa bişək.
Bir tayın zor ilə çıxartdı özü,
Bir tayının qalır dalınca gözü.
Nə qədər "ya Əli" deyib çəkdi,
Çıxmadı tay, palçığa çökdü.
Ta ki bir sünniyi-qəviəza
Oldu bu macəra-ara peyda.
"Ya Ömər" sövtünü bülənd etdi,
Zor edib tayı laydən götdi.
Necə gördün, dedi, kişi, Ömər,
O imami-hümamü rahbəri?
Şiənin oldu rəngi gülnari,
Üzünə vurdu qəlbinin nari.
Cünbüşə gəldi cisminin qanı,
Açıban layə tökdü buğdanı.
Dedi: – Olsun mənə həram o çörək –
Ki, Ömərdən ola bu çöldə kömək.

## XƏNDƏYİ GEN QAZIBLAR

Bir nəfər sünnü ilə bir şiə
Hədəf olmuşdu tiri-təşniə.
Yol gedirdilər ol iki əhməq,
Nagəhan çıxdı bir böyük xəndək.
Xandəyin ərzi çox ziyadə idi,
Bu iki mərd həm piyadə idi.
Dedi sünnü: – De "ya Əli", tullan,
Ta görüm lütf edər şəhi-mərdan?
Şiə bir "ya Əli" çəkib o zaman,
Xəndəyi keçdi bərq tək pərran.
Dedi: – Keç, sən də bəs çağır Öməri,
İstə imdadüvə o rahbəri.
Sünnü də "ya Ömər" qılıb ünvan,
Arxı tullanmaq istədi, o zaman
Düşdü ortasına o sünnü rəvan.
Sünnüyə şiə oldu tənəzənan.
Dedi ki, ey fəqiri-üftadə,
Gəlmədi Həzrəti-Ömər dadə?
Dedi sünnü: – Deyil müqəssir Ömər,
Xəndəyi gen qazıbdı bu kafər.

## SÜNNÜ, ŞİƏ VƏ ƏLİALLAHİ

Bir nəfər şiə ilə bir sünni
Bir-birindən acıqlı, həm kinni,
Bir yol ilə gedirdilər, o zaman
Nərdban qoydular yola xəndan.
Göftguyə çün etdilər rəğbət,
Çəkdi nazik yerə o dəm söhbət.
Dedi sünnü ki, bəs Ömər həqdir,
Ona töhmət qılan kəs əhməqdir.
Odu sərxeyli-əfzəli-əshab,
Adili-əsr, zadeyi-Xəttab.
Dedi şiə ki, bəd peyğəmbər
Hamının əfzəli olub Heydər.
Elm şəhri rəsuli-Bəthadır,
Babı ol şəhrin səfaradır.

Xüləfa tutmayıbdır hörmətini,
Qəsb ediblər onun xilafətini.
Dedi sünnü ki, olmasaydı Ömər,
Aça bilməzdi dini peyğəmbər.
Çün Ömər dini-həqqə yar oldu,
Dini-islam aşikar oldu.
Fatehi-din Ömərdü nuri-cəli,
Ola bilməz o şahə misl Əli.
Ömərin tayı dəhrdə yoxdur,
O əzizin fəziləti çoxdur.
Həq Ömərləndü, həm Ömər həqdir,
Aləm içrə bu söz mühəqqəqdir.
Gərm idi bəhsdə bular, əmma
Nagəhan bir nəfər olub peyda.
Dedilər, gəl tutaq həkəm bu kəsi,
Ta görək kimdi din dadrəsi.
Dedilər ey rəşidi-danişvər,
Əli əfzəldi, söylə, yoxsa Ömər?
Çəkibən ah ol bülənd cənab,
Onlara verdi ta bu növ cəvab –
Ki, müqəssir Əlidir, ol mövla
O yədullahi-xaliqi-əşya
Neyçün axır yaratdı kim, Öməri
Özünə dəydi aqibət zərəri.
Oldu onlara teyyibü tahir,
Əliallahi olduğu zahir.

## MƏCNUNDAN SORĞU

Dedi Məcnuna kim, bir əhli məzaq:
Ey olan eşqə cüft, taqəti taq,
Bu qədər kim, Müaviyəylə Əli
Tökdülər qan, etdilər cədəli,
İddəasında kim mühəqqəq idi,
Hansı nahəqqü hankısı həq idi?
Dedi: – Əlbəttə, həqqdir Leyli –
Ki, həqin var Leyliyə meyli.

## MƏCNUNUN CAVABI

Dedi Məcnuna bir nəfər huşyar:
Leyl əfzəldi, söylə, ya ki nəhar?
Dedi: – Məşhurdur bu, ey əhvəl,
Leyl olubdur nəhardən əfzəl.
Leyldə nami-Leyli oldu əyan,
Bu səbəbdən olub əzizi-cahan.
Dedi kim, ey əzizlər canı,
Etmisən xətm söylə Quranı?
Dedi: – “Vəlleyl”də məni-gümnam
Etmişəm məktəb içrə xətmi-kəlam.
Dedi: – Bir surədə varındı hünər?
Dedi: – “Vəlleyl”i etmişəm əzbər.
Oldu “Vəlleyl”, ey ədəb kani,
Behtəri-surəhayi-Qurani.

## YERDƏKİLƏRİN GÖYƏ ŞİKAYƏTİ

Bir zaman tutdu zülm dünyanı,
Ucalır xəlqin ərşə əfğanı.
Hərcü mərc oldu dari-mülki-cahan,
Dəhrdə qətlü qarət oldu əyan.
Yığışıb xəlq etdilər şura,
Göyə getsin gərək neçə dana,
Eyləsinlər şikayət Allahə,
Çarə qılsın bu qövmi-gümrahə.
İntixab etdilər neçə zahid,
Pakdamanü mürşüdü abid.
Çıxıb ərşə şikayət etsinlər,
Bir sərəncam alıb qayıtsınlar.
On nəfər mərdi-feyzi-əkrəm ilə,
Çıxıban ərşə “İsmi-əzəm” ilə,
Gördülər ki, xudayi-ərşi-sərir
Ağarıb saqqalı, olubdur pir.
Edibən təkyə istirahətlə,
Uzanıb ərş üstə rahətlə.
Etdilər ərz, key xudayi-cahan,
Qətlü qarət olub çahanda əyan.

Dedilər yoxdu istirahətimiz,
Qalmayıb şövkət ilə izzətimiz.
İzzətin həqqi eylə bir çarə,
Olmuşuq cumləmiz günüqarə.
Dedi: – Mən xeyli çəkmişəm zəhmət,
Etmişəm sizləri hamı xilqət.
Qocalıb indi olmuşam mən pir,
Dəxi aləmdə bilmirəm tədbir.
Yatmışam burda istirahət ilə
Bir neçə vəqtlərdü rahət ilə.
Vermişəm bu cahanı İsayə,
Oğlum, ol ruhbəxşi-valayə.
Gedin, İsayə ərzi-hal qılın,
Bu qəmin çarəsin sual qılın.
Gəlibən ol güruhi-ruhani,
Çərxi-çarümdə tapdı İsani.
Etdilər cümlə macəranı bəyan,
Dərdi-pünhanə istəyib dərman.
Dedi İsa ki, ey güruhi-dəğa,
Yoxdu sizlərdə zərrə qədri həya.
Gəlmiş idim nicat üçün dəhrə,
Kainatə, həyat üçün dəhrə.
Gəh məni Misrə qıldız avarə,
Gah çəkdiz tutub məni darə.
Gözünü qoyduz annəmin giryan,
Oldu rüxsarə əşki danəfəşan.
Xalam oğlu, o pak Yəhyanı,
Öldürüb təştə tökdüz al qanı.
Zəkəriyyanı etdiz avarə,
Ərrə ilə vücudini parə.
Qoymadız beş gün istirahət edək,
Rahi-həqqə sizi hidayət edək.
Qoymadız həq yetişsin isbatə,
Aqibət qaçmışam səmavatə.
İstəyirsiz gələm o dünyayə –
Ki, düşəm tazədən qəmü vayə?

Yaxasız möhnət ilə narə məni,
Çəkəsiz ta dübarə darə məni?
Bu xəyalatdan düşün, heyhat!
Zatüvüz çün mənə olub isbat.
Yəni mən bir də xakdanə gələm,
Qoyuban göyləri, cahanə gələm?
Canuvuz çıxsın, ey üzü qarə,
Başuvuzçun gedin qılın çarə.

## FƏQİHİN OĞLUNA CAVABI

Bir fəqihə öz oğlu etdi xitab,
Dedi, key fazili-büləndcənab,
Bircə vaizlərin sözündən əsər
Görmürəm mən özümdə zərrə qədər.
Bu səbəbdən ki, görmüşəm səd bar
Yoxdu kirdarı tabiqi-göftar.
Tərki-dünyanı eyləyir təlim,
Özləri cəm eyləyir zərü sim.
Əhli-dünyayə virdi lənətdir,
Gecə-gündüz xəyalı dövlətdir.
Alimin ki, özündə yoxdu hünər,
Eyləməz bir kəsə kəlamı əsər.
Hər bir alim ki, olsa tənpərvər
Ola bilməz o bir kəsə rəhbər.
Xəlqə söylər ki, eyləyin ehsan,
Özünün nəfsini edər nisyan.
İtiribdir özün ki, ol fazil
Ola bilməz o rəhbəri-cahil.
Verdi alim cəvab, key cahil,
Etdiyin bir xəyaldır batil.
Gər tələb etsən alimi-məsum,
Qalısan feyzi-elmdən məhrum.
Baxma alimdə felü kirdarə,
Əməl et, olsa nik göftarə.
Yaxşı söz kimdən olsa zibadır,
Demə bu mömінü o tərsadır.

## OĞLUMA XİTAB

Ey oğul, olma talibi-badə,
Getməsin ta ki izzətin badə.
Badənin zuri əqli zail edər,
Adəmi hər fəsadə mail edər
Əqldəndir şərafəti-insan,
Olmasa əql, mərd olur nadan.
Badə tabı olur şüura hicab,
Əqli məstur eyləyib meyi-nab.
Veribən simü zər şərab alma,
Ey oğul əqlüvə hicab alma.
Nəssi-Quran ilə behökmi-qədər
Badəni nəhy edibdi peyğəmbər.
Badə nəhyində gəldi "fəctənibu"*
Ey oğul, hökmi-kibriyadır bu.
Nəcisül-eyndir, nəcasətdir,
Mayeyi-nikbətü xəsarətdir.
Bil ki, ümmül-fəsaddır badə,
Verdi çox xanimanları badə.
Bir zaman gərçi mən üzüqarə
Var idim badənuşü meyxarə;
Mənə mənzil şərabxanə idi,
Həmdəmim çəng ilə çəğanə idi;
Məclisimdə həmişə hal əhli,
Mərifət məcməyi, kəmal əhli;
Həmdəmim hər büti-pərivəş idi,
Mənə məşrəb şərabi-biğəş idi;
Arü namusü qeyrəti atdım,
Baş qoyub xüm ayağına yatdım;
Gecələr məst, ta səhər bəngi,
Həymbüsatım müğənniyü çəngi;
Çəkməmiş başıma səhərlər əyağ,
Olmaz idim durub yerimdən oyağ;
Gərçi elmü fərasətim çox idi,
Əhln-fəzl içrə hörmətim yox idi;

* İctinab edin, çəkinin [şərabdan] (*ayə*)

Məst olub xəlq ilə cidal etdim,
Əqlimi cəhlə payimal etdim;
Məstlikdən olan zaman huşyar,
Gördüm əldən gedibdü qeyrətü ar;
İncinib cümlə yarü ənsarım,
Qalmayıb kimsənə havadarım;
Çıxmışam ta ki məst bazarə,
Gəlmişəm rast hər dilazarə;
Əli daşlı uşaqlar hər yan
Məni-bədməstə oldu səngzənan;
Batmışam gül kimi qızıl qanə,
Dönmüşəm sərbəsər gülüstanə;
Ta ki tovfiq oldu həmrahım,
Lütflər eylədi mənə şahım;
Ta hidayət çirağı saldı ziya,
Qəlbimi rövşən etdi nuri-xuda.
Eylədim pak camdən tövbə,
Dəxi şürbi-müdamdən tövbə.
Xəlqə verdim cəvab tövbə ilə,
Şüstüşu etdim abi-tövbə ilə.
Tərk qıldım şərab övsafın,
Tarü çəngü rübab övsafın;
Eylədim mədh şahi-mərdanı,
Vəsf qıldım Əliyyi-İmranı;
Eylədim zikri-məqtəli-şühəda,
Vəsfü övsafi-şahi-Kərbübəla;
Özümü ta dəxili-şah etdim,
Çareyi-xirməni-günah etdim;
Pak oldum cahanda yekbarə,
Sanki it düşdü bir nəməkzarə.
Barilaha, behəqqi-ali-əba,
Əfv qıl cürmümü, bağışla xəta.
Sənə bir əbdi-rusiyahəm mən,
Bəndeyi-asitani-şahəm mən.
Şahım ol Mürtəzadı, nuri-cəli,
Heydəri-şirdil, Əliyyü vəli.
Barilaha, behəqqi-ali-Bətul
Tövbəvü üzrümü sən eylə qəbul.

## OĞLUMA NƏSİHƏT

Ey oğul, alim olsa xoştinət
Mali-dünyayə eyləməz rəğbət.
Deyib ol padşahi-ərzü səma
Hübbi-dünyadü rəsi-külli-xəta.
Çün həlali hesabdır malın,
Həm hərami əzabdır malın.
Nə gərəkdir sənə bu dövlətü mal
Yüküvü yüngül eylə, ey həmmal.
Ey oğul, var cahanda çox molla,
Güzəranı üçün edər qovğa.
Qeyrəti-milləti bəhanə qılar,
Gündə xəlq içrə yüz fəsanə qılar.
Əhli-dünyayə eyləyər lənət,
Özü dünyayə eyləyər rəğbət.
Daima əğniyayədir meyli,
Əhli-fəzlin olubdu sərxeyli.
Füqəranı görəndə nifrət edər,
Ona bikarlıqda töhmət edər.
Əğniya gəlsə bəzminə, o zaman
Güli-həmra kimi olur xəndan.
Bir qəni eyləsə əgər üsyan,
Saz edər söhbətində yüz bürhan.
Filməsəl bir qəni gər içsə şərab,
Ona təcviz üçün açar min bab.
Görsə kim, bir fəqir edir üsyan,
Lən edər ol fəqir üçün hər an.
Özünün həddən ötdü üsyanı,
Məhv edibdir füsunu şeytanı.
Deyəsən ol səfihə, ey xənnas.
Oxudunmu "ətəmirunən-nas"*.
Eyləyirsən məzəmməti-hər kəs,
Niyə öz nəfsüvü unutdun bəs?
Alim öz elminə edəydi əməl,
Düşməz idi bu qədr dinə xələl.

---

* Xalqı yaxşılığa dəvət edib, özünüzü unudursunuz (*ayə*)

Rəsmdir alim olsa əhli-fəsad,
Aləmi ol fəsad edər bərbad.
Uyma mollayə, olma çox da avam,
Sanma təhtülhənək, qurubdur dam.
Baxma təsbihə, olma divanə,
Xam olan quşlara gərək danə.
Sanma alnında səcdədəndir əsər,
Gecə qoymuş həcamət ol kafər.
Xatəmindən demə Süleymandır,
Divdir ol ləin, şeytandır.
Ah, ah, ey cənab peyğəmbər!
Dinüvü zaye etdi bu kafər.
Eyləyib şərüvi vəsileyi-nan,
Bu şərirü ləinü biiyman!
Vəqtdir, eylə çarə islamə,
Tazədən sal işi sərəncamə.
Cövrü zülm ilə doldu mülki-cahan,
Ədlü qist ilə eylə bir saman.
Qıl hidayətlə aləmi abad,
Hanı bəs ol "likulli qövmün had"*.

## XAN VƏ DEHQAN

Bir əkinçi gedirdi məstanə,
Yolda ol rast gəldi bir xanə.
Xanı görcək yazıq baş endirdi,
Gör onu xan nə gunə dindirdi,
Dedi: – Ey it, kənarə çıx yoldan!
Nə çıxırsan donuz kimi koldan?
Gördü bu iltifatı çün xandan,
Zövqdən oldu gül kimi xəndan.
Evinə daxil oldu xürrəmü şad,
Övrəti onda gördü vəcdi-ziyad.
Dedi: – Ey qaşı bir hilali-mübin,
Xirmənin üstə xuşəçin Pərvin,

* Allah bütün qövmlərə [tayfalara] yol göstərəndir

Məzrəi-imtizacə danəfəşan,
Sünbülə şəkli sünbülündən əyan.
Nədi bu behcətü sürurə səbəb,
Tez bəyan et görüm nədir mətləb?
Dedi bəylər yanında xani-kübar
Yoldan ikram ilə edirdi güzar.
Dayanıb xanə eylədim kürnuş,
Məni dindirdi xani-sahibhuş.
Dedi: – Bu olmaz ey büləndəxtər,
Səni xan dindirə, edim bavər?
Nə deyib xan sənə, bəyan eylə,
Dürci-ləl aç, gühər fəşan eylə.
Atılıb düşdü bir zaman dehqan,
Həvəsi sakit oldu, qıldı bəyan.
Dedi ki, xan dedi: – Çıx it yoldan!
Nə baxırsan donuz kimi koldan?
Bizə xan iltifatı peydadır,
Bir səadətdü, feyzi-üzmadır.
Bizə bu vəch iftixar olsun,
Nəsl-binnəsl yadigar olsun.

## AYI VƏ SİÇAN HEKAYƏSİ

Bir ayı yatmış idi rahətlə,
Uzanıb xeyli istirahətlə.
Bir siçan ayı üstən etdi güzar,
Oldu ol ayı xabdən bidar.
Əl atıb muşi eylədi nəxcir,
Durdu yalvarmağa ona o fəqir.
Dedi ki, sən məni gəl eylə rəha,
Yer düşər eylərəm əvəz peyda.
Ayı güldü, onu rəha qıldı,
Siçanın mətləbin rəva qıldı.
Bir zaman ovçu qurmuş idi dam,
Düşdü dam içrə ol qəvi-əndam.
Nə qədər zur qıldı ol məğrur
Damı qırmaqlıq olmadı məqdur.

Bağırıb naləvü fəğan etdi,
Göz yaşın seyl tək rəvan etdi.
Ayının naləsin eşitdi siçan,
Bildi kim, dami-dərdədir piçan.
Gəldi kəsdi dişiylə ol damı,
Ayıya eylədi sərəncamı.
Dedi ayı ki, qalmadım qəmdə,
Yaxşılıq itməz imiş aləmdə.

## ASLAN VƏ QARIŞQA ƏHVALATI

Yay günü isti idi, bir aslan
Bir mağara içində oldu nihan;
Ta ki rahət ola hərarətdən,
Dincələ zəhmətü mərarətdən.
Üstünə bir qarışqa çıxdı rəvan,
Gəzibən seyr eylədi hər yan.
Diksinib şir durdu vəhşətdən,
Tülkü güldü ona o halətdən.
Dedi: – Ey canəvərlərin şahı,
Ucalan ərşə xeylü xərgahı,
Səndə kim, bu hünər, bu qüdrət var,
Zati-pakında kim, şücaət var,
Mur kim, bir zəif xilqətdir,
Bəs nedirsən, bular nə vəhşətdir?
Dedi: – Ey tülkü, vəhşətim yoxdur,
Murdən hiç zəhmətim yoxdur.
Leyk bu ardır mənə peyda –
Ki, çıxa padşahın üstə gəda.
Seyyida, vermə üz gədalərə sən,
Düşmə bu möhnətü bəlalərə sən.
Çün güli-gülşəni-vəfasən sən.
Niyə hər xarə aşinasən sən?
Bülbüli-gülşəni-həqiqətsən,
Mu-məcaz ilə qılma ülfət sən.
Qəfəsi-cismi sal bu viranə,
Eylə pərvaz bağı-rizvanə.

## ABİD VƏ QURU KƏLLƏ

Çay kənarında bir nəfər abid
Həqqə olmuşdu şövq ilə sacid.
Gördü bir kəllə su üzündə əyan,
Aparır çay aşağə seyli-rəvan.
Durub abid o kəlləyə yetdi,
Kəllənin halını sual etdi.
O quru kəllə nitqə gəldi rəvan,
Dedi: – Ey abidi-fəriştənişan,
Şah idim mən cahanda izzət ilə,
Ruzgarım keçirdi şövkət ilə.
Tac ilə təxtü dövlətim var idi,
Gəncü zərrü rəiyyətim var idi.
Hər tərəf işlər idi fərmanım,
Xoş keçərdi həmişə dövranım.
Məclisimdə müdam cami-şərab,
Saqivü badə, çəngü tarü rübab.
Neçə zərrinkəmər qulamlərim,
Hasil idi cahanda kamlərim.
Məclisim xüld, badə kövsər idi,
Hər murad istəyəm – müyəssər idi.
Eylədi dəhr eyşimi bərbad,
Mürği-ruhə əcəl olub səyyad,
Mənzilim ta ki bir məğak oldu,
Bədənim döndü tirə xak oldu.
Qəbrimi seyl həm fəna qıldı,
Məni bu halə mübtəla qıldı.
Seyyida, bir diyardır bu fəna –
Ki, bərabərdir onda şahü gəda.
Ömrü dünyayə etibar etmə,
Özüvü çox da xarü zar etmə.
Nəqşi-nikü bəd ilə olma qəmin,
Nəqşdən pak olur bu lövhi-mübin.
Sənə bəsdir bu əmrdə bürhan:
Nükteyi-"küllü-mən əleyha fan"*.

* Dünyada olan hər şey fani olacaqdır

## QARI VƏ OĞLU

Var idi şəhri-Reydə bir qarı,
Duz yerində satardı ol qarı.
Ümmi-təlbisü madəri-təzvir,
Hiyləsindən dolub bu aləmi-pir.
Bir cavan oğlu var idi ziba,
Baği-izzətdə bir güli-rəna.
Qonşudan bir gün ol rəsidəcavan.
Bir yumurta oğurladı pünhan.
Sirqətə gərçi ol deyildi həris,
Nənəsi eylədi onu təhris.
Əvvəl olmuşdu gər nihan oğru,
Aqibət oldu bir yaman oğru.
Rahzən, düzd, şəbrövü əyyar,
Oldu axır həramilər ilə yar.
Əhli-divan etdilər tədbir,
Ta ki ol novcəvan oldu əsir.
Şah hökm etdi ki, çəkin darə!
Şahə yalvardı kim, o biçarə
İzn ver bir zaman anam gəlsin,
Ölürəm, ta ki halımı bilsin.
Anasın gördü ol günüqarə,
Çəkdi ağuşa, yetdi didarə.
Dedi: – Ey madəri-həmidəxisal,
Dilüvü lütf eylə, ağzıma sal.
Ölürəm çünki iştiyağından,
Ta öpüm bir o dil-dodağından.
Dilini verdi ağzına madər,
Onu üzdü dişiylə ol sərvər.
O qarı etdi naləvü fəryad –
Key haramzadə, de nədir bu fəsad?
Şəh sual etdi surəti-hali,
O cavan şahı eylədi hali,
Dedi: – Ey şah, ibtidadə əgər
Mənə olsaydı bu nəsihətgər,
Oğru olmazdım, ey şəhi-vala,
Mənə yetməzdi hiç böylə bəla.

Bəs anamdır bu möhnətə bais,
Bu qəmü dərdü zillətə bais.
Bu səbəbdən mən, ey şəhi-dövran,
Eylədim ol ləini qəti-lisan.
Bir lisan xeyrə olmasa guya,
Ona lazım gəlir bu gunə cəza.
İlahə xoş gəldi bu lətif kəlam,
Eylədi ol cəvanə çox ikram.
Oldu qəmdən xilas o biçarə,
Ədli-şəh çəkdi qarını darə.

## QONAĞIN MACƏRASI

Bir fəqir oldu bir fəqirə qonaq,
Bir evi var idi necə çardaq.
Çox zəif idi pərdisi, dirəyi,
Qonağın düşdü qorxuya ürəyi.
Bərk şaqqıldayırdı damü dirək,
Dedi bu ev yəqin uçar bişək.
Dedi ev sahibinə ol bidil:
– Mənə bir ayrı yerdə ver mənzil.
Qorxuram ki, bu ev ola viran,
Məni torpaqə eyləyə yeksan.
Dedi ev sahibi ki, ey dərviş,
Qorxudan olma böylə sən dilriş.
Sənə mən eyləyim bunu təsrih,
Həqqə bu xanə eyləyir təsbih.
Dedi: – Bəs qorxuram olam nabud,
Həqqə bu xanə eyləyəndə sücud.

## SUALIN CAVABI

Ey büti-gülrüxü sənubərqəd,
Yarın olsun sənin xudayi-əhəd.
Verməsin qəm sənə xudayi-cahan,
Olasan şadü xürrəmü xəndan.
Dün sual eylədin ki, ey novrəs,
Olumu heç dərdsiz bir kəs?

Ey rəfiqi-şəfiqi-ruhani,
Sənə qurban bu Seyyidin cani!
Dərdsiz kimsənə deyil insan,
Nə bilir dərdü möhnəti heyvan.
Hər kimin fəhmi çoxdu – möhnəti çox,
Hər kimin əqli yoxdu – xiffəti yox.
Dəhri-dun möhnəti nümayandır,
Qönçələr bağrı növbənöv qandır.
Gah geyər səbzələr libas əlvan,
Gah olur novbahar, gah xəzan.
Gah verir səbzəyə baharı bahar,
Gahi üryan qılır o zarı bahar.
Xah heyvan, cəmadü xah nəbat
Hərə bir möhnəti qılır isbat.
Yoxdu bir kəs ki, dərdü qəm çəkməz,
Hanı ol kimsə kim, ələm çəkməz.
Ənbiyalər çəkiblə möhnətü qəm,
Birinin könlü olmayıb xürrəm.
Hükəmalər olub əsiri-bəla,
Filosufani-əsr çəkdi cəfa.
Verdilər zəhri-nab Sokratə,
Nə cəfalər olubdu Buqratə,
Nari-Nəmrudu gördü İbrahim,
Zəkəriyya ağacda oldu dünim.
Yusifi çərx saldı zindanə,
Düşdü dərdü bəlayi-ixvanə.
Nə bəlayə düçar olub Əyyub,
Nə cəfalər çəkib dili-Yəqub.
Çəkdi yüz gunə qəm şəhi-Bətha,
Mahi-rəxşan, leylətül-əsra.
Bu qəbil, ey nigari-məhpeykər,
Övliyalər çəkib bəla yeksər.
Sənə zahirdü nəqli-Kərbübəla –
Ki, çəkib şahi-Kərbəla nə bəla.
O vəsiyyət ki, qıldı İskəndər
Sənə eylər kifayət, ey dilbər.

## İSKƏNDƏRİN VƏSİYYƏTİ

Dəmi-nəzi-rəvanda İskəndər
Eylədi bir vəsiyyət ol sərvər –
Ki, anama deyin bu göftari,
Xəlqə ehsanım eyləsin cari.
Leyk hər kəs çəkibdi dərdü bəla
Yeməsin ol təamdən qəta.
Çünki saz oldu neməti-əlvan,
Qıldı anın vəsiyyətini bəyan –
Ki, gərək əkl etsin ol adəm
Çəkməyibdir cahanda möhnətü qəm.
Mütənəbbih olub kəlamından,
Hamı çəkdi əlin təamından.
Çünki çəkmişdi hamı möhnətü qəm,
Çıxmadı hiç bir nəfər xürrəm.
Madəri-əşkbari-İskəndər
Gərçi olmuşdu zari-İskəndər,
Bildi ki, mərgə yoxdu bir çarə,
Hamının qəlbinə dəyib yarə.
Dilbəra, çox da çəkmə möhnətü qəm,
Könlüvü eylə qəm günü xürrəm.
Gərdişi-çərxi-kəcmədar keçər,
Bu qəmü dərdi-ruzgar keçər.

## İSKƏNDƏRİN VƏQƏSİ

Seyrə çıxmışdı bir gün İskəndər,
Rast bir novcəvanə gəldi səhər.
Sərbürəhnə, cününü divanə,
Mənzili bir fəzayi-viranə.
Etdi divanəyə o şah xitab,
Oldu divanə müstəidi-cəvab.
Dedi mən padşahi-dövranəm,
Rübi-məskunə, bil ki, sultanəm.
Zati-pakımda çün nəcabət var,
Məndə dərya kimi səxavət var.
Hər nə sən istəsən olur hasil,
İstə bir şey ki, ta ola vasil.

Dedi divanə: – Ey şəhi-məğrur,
Məndən eylə bu dəm məkəsləri dur.
Mənə milçəklər eyləyir azar,
Məndən olsun buyur, bu ləhzə kənar.
Dedi sultan ona ki, divanə,
Bir şey istə ki, qadirəm anə.
Güldü divanə, söylədi: – Ey şah,
Qüdrətin xeyli var imiş kutah.
Qüdrətin çünki yoxdu bir məkəsə,
Edəcəksən nə lütf hiç kəsə.
Mən təki çünki sən də acizsən,
Özüvə görmə fəxri caiz sən.
Seyyida, gör ki, sərvəri-mərdan
Eyləyib xütbədə bu rəmzi bəyan.
Xeyli acizdü bu bəni-adəm,
Bir məkəsdən çəkir bəlavü ələm.
Məkəsə hökm qılsa ol qəyyum,
Fil xortumuna salar xortum.

## LOĞMANIN SATILMASI

Belə derlər ki, Həzrəti-Loğman
Həbəş əhliydi, ya ki ol Sudan.
Ona dəydi həvadisin xətəri,
Satdılar qul kimi o pürhünəri.
Yusif-asa o mahi-ürfani
Keyd ilə satdı fövci-ixvani.
Qul xəyal eylədi ələzzahir,
Aldı Loğmanı bir nəfər tacir.
Bir siyəhfam idi sitəbri-ləban
Leyk təlimbəxşi-biədəban.
Fəhmini gördü çünki ağası,
Oldu onun yeganə mövlası.
İmtəhan ilə bir gün ol mövla
Dedi: – Lazımdı bir lətif ğiza –
Ki, ola həm lətif, həm şirin,
Ta tənavül qılam məni-qəmgin.

Etdi Loğman hikmət ilə əməl,
Hikmətin kanı ol əmiri-əcəll.
Bir quzu zibh eylədi Loğman,
Dilini eylədi onun büryan,
Hazır etdi hüzuri-mövlayə,
Yedi zövq ilə ol fələkpayə.
Yenə bir ayrı gündə ol mövla
İstədi bir acı, kəsif ğiza.
Yenə Loğman gətirdi büryan dil,
Açma bu rəmzi, od tutub yan, dil!
Leyk sərbəstə qalsa bu məna,
Xoş deyil, eyləmək gərək ifşa.
Bədgüman oldu sahibi-Loğman,
Gördü ziddini bir ğizadə əyan.
İki dəfə gətirdi büryan dil,
Dedi: – Hikmətdə bu deyil kamil.
Bu qulun gərçi çox fərasəti var,
Leyk bu işdə səhvü qəfləti var.
Səhvkarın özündən etdi sual –
Ki, nədir böylə müxtəlif əhval?
Bir ğiza mümkün olmayıbdır həmin
Həmi acı ola, həmi şirin.
Dedi: – Ey bu sual möhtacı,
Dildü kim, zəhrdən olur acı.
Gah şəkərdən olur bu dil şirin,
Qandı mövlası, eylədi təhsin.
Qıldı təhsin kəmali-Loğmanə,
Fikri-bikrü xəyali-Loğmanə.

## OĞLUMA NƏSİHƏT

Cəfər, ey sərvi-sərfərazi-pədər,
Məhrəmi-sirri-eşqi-razi-pədər.
Hər bəla olsa dəhrdə hadis,
Bil ki, dildir olan ona bais.
Fariğ ol kəsrəti-məşağildən,
Sövmi-sümt ilə qövli-batildən.
Pakdamansən gər, ey dana,
Olur İsayi-halətin guya.
Lal ol gərçi əmrə arifsən,
Məryəmi-nükteyi-məarifsən.
Gərçi ruhül-qüdüsdür ustadın,
Hər həvaridən olmaz imdadın.
Meyl qılma xəbis dünyayə,
Sən üruc et məkani-əlayə.
Ruhsən, dəhrdə mücərrəd ol,
Sən də sultani-mülki-sərməd ol.
Dilüvü saxla kizbü qeybətdən.
İstəsən gər nicat möhnətdən.
Seyyida, hər bəla ola hadis,
Bil ki, dildir ona olan bais.

### QARINQULU ABİD

Var idi bir qarınqulu abid,
Əhli-təqva, müqəddəsü zahid.
Hər gecə nan yeyirdi on batman,
Sübhəcən xətm edirdi bir Quran.
Onu da sübhədək namaz üstə,
Əsl məbuduna niyaz üstə.
Bir nəfər şəxs eşitdi ani, dedi:
– Nim nan gər yesəydi, yatsa idi,
Bu ibadatdən çox əfzəl idi,
Hiç şək yox ki, mərdi-əkməl idi.
Qarnuvu qıl təamdən xali,
Olasan ta ki hikmətə hali.
Qıl tənavül təami sən kəm-kəm,
İbn-Adəmsən, olma ibn-şikəm.

## DİLƏNÇİ VƏ XƏSİS

Var idi bir bəxili-sahibmal,
Bir fəqir gəldi ondan etdi sual,
Dedi ki, müstəhəqqəm, ey mövla,
Mənə vəchi-kifaf eylə əta.
Dedi: – Bir söz deyim, gər etsən əməl
Sənə ehsan olur “fəmən-yəməl”.
Eyləsən gər mənim sözümü rəva,
Edərəm hər nə xahiş etsən əta.
Şad olub ol fəqirü bisərü pa,
Dedi: – Etdim qəbul, ey ağa,
O nə sözdür, onu bəyan eylə,
Dürci-ləl aç, gühər fəşan eylə.
Sözüvü vəhy tək hesab edərəm,
Ta ki təhsilinə şitab edərəm.
Dedi: – Ol söz budur, ey əhli-təəb,
Hiç bir zad məndən etmə tələb.
Bundan özgə muradın, ey sail,
Hər nə müşgül ola olur hasil.
Seyyida, olma sən vəbali-bəxil,
Özünün vizri oldu mali-bəxil.
Tutma göz dövlətü mənalından,
Yemə loğma bəxil malından.
Tələbi-teyyibati-təhsindir,
“Əl xəbisati lil-xəbisin”*dir.

## EŞŞƏYİNİ İTİRMİŞ KİŞİ

Öz ulağın itirdi bir nadan,
Qaldı səhrada haimü heyran.
Nagəhan gördü ol bir özgə ulağ,
Yüklədi öz yükün ona sərsaq.
Öz ulağı bilib olurdu rəvan,
Ta ki sahibulaq oldu əyan.
Yükü açdı ulaqdən dərhal,
Ulağın sürdü oldu fariğbal.

---
* Xəbis xəbis üçündür (yəni xəbis adama xəbis rast gəlir)

Bu kişi etdi naləvü fəryad,
Elədi çərxi-dun əlindən dad.
Çünki öz eşşəyi xəyal etdi,
Yaxasın tutdu qilü-qal etdi –
Ki, alırsan ulağımı əldən,
Vermərəm ta ki düşməsəm dildən.
Gəldilər xəlq bu təmaşayə,
Güldülər ol səfihü şeydayə.
Dedilər: – Qıl bəyan sən, a kişi,
Ulağın erkək idi, ya ki dişi?
Dedi kim, hiç yoxdu şübhəvü şəkk –
Ki, ulağım mənimdü bəs erkək.
Dedilər: – Bu ulaq kim, dişidir!
Dedi ki, məsk olub, qəza işidir.
Bir də siz etməyin bu barədə şəkk,
Çox da erkək deyildi ol eşşək.
Seyyida, var cahanda çox nadan,
Özünü aqil eyləyibdi güman.
Biri də onların yəqin sənsən,
Yenə sən qanmısan, sənə əhsən!
Belə fikr eyləyir ki, hər nadan
Özünündür təmam kövnü məkan.
Xəlq olub ondan ötrü ərzü səma,
Ümməhati-çaharü həft aba.
Bilməyir ki, tüfeyli-Əhməddir,
Xilqətin baisi Mühəmməddir.
Bil ki, olmuşdur, ey güli-Ələvi,
Cümlə aləm sənayei-nəbəvi.
O şahənşah ki, mehrdir lame,
Həqqə məsnudir, bizə sane.
İki münşəqq olub o nuri-cəli,
Biri Məhmuddür, birisi Əli.

## OĞRUNUN VƏQƏSİ

Vardı bir düzdi-şəbrəvü əyyar,
Eylədi bir oğurluq ol məkkar.
Getdi bazara satmağa xəlvət.
Bir libası ki, eylədi sirqət.

Onu ondan apardı düzdi-digər,
Əliboş gəldi acizü müztər.
Dedi yoldaşları ki, ey əyyar,
Neçəyə satmısan, elə izhar.
Dedi: – Ol qiymətə ki, almışdım,
Ələ ol növ ilə ki, salmışdım.

## XƏLİFƏ VƏ BƏHLUL

Etdi Harun bir gün əzmi-şikar,
Gəldi dərya kənarın etdi qərar.
Gördü bir əl çıxıbdı dəryadən,
Düşdülər heyrətə təmaşadən.
Beş ədəd barmaq olmuş onda əyan,
Bu müəmmayə qaldılar heyran.
Atdılar gərçi xeyli tupü tüfəng
Leyk barmaqlar olmadı münfək.
Kimsənə bilmədi bu əsrarı,
Qaldılar şah-mat elcarı.
Dedilər kim, bunu bilər Bəhlul,
Bunu eylər tila kimi məhlul.
Şah Bəhlulə qasid etdi rəvan,
Ta gəlib eyləsin bu rəmzi bəyan.
Oldu Bəhlul qarğı atə süvar,
Səyrədə-səyrədə gəlib rəhvar.
Etdilər ta ki macəranı bəyan,
İkİ barmağını bu etdi əyan.
Görcək ol əl çəkildi dəryayə,
Qaldılar mat bu müəmmayə.
Dedi Bəhlulə şəh ki, ey dana,
Bu nə işdir, buna nədir məna?
Nə əl idi o kim, əyan oldu,
Sən ki əl tutdun ol nihan oldu?
Bu rümuzun nə idi mənası,
Nə idi ol işarə iyması.
Dedi Bəhlul: – Ey şəhi-dövran.
O ki beş barmaq olmuş idi əyan,

O işarə edirdi, ey sərvər,
Nə qədər ki, çətin ola işlər,
Beş könül olsa cəm, asandır,
Cəmlikdən ədu pərişandır.
İki barmağımı mən etdim əyan,
Eylədim mən ona bu rəmzi bəyan,
Yəni ki, bu cahanda iki könül
Cəm ola, xeyli əmrdir müşkül.
Bildi mənanı, batdı dəryayə.
Seyyida, afərin bu inşayə!

## MUSA PEYĞƏMBƏR VƏ YOXSUL

Bir zaman Turə Həzrəti-Musa
Azim olmuşdu, ol kəlimi-xuda.
Nagəhan gördü bir nəfər üryan,
Özünü xak-ara qılıbdı nihan.
Möhnəti-fəqrə mübtəla idi səxt,
Bərgsiz bir xəzanrəsidə dirəxt.
Baş götürdü ki, ey kəlimi-xuda,
Turdə qıl məni-fəqirə dua.
Verə həq mən fəqirə sərmayə,
Ta qılam çarə hərrü sərmayə.
Atəşi-fəqrə hiç tabım yox,
Yanıram narə, xürdü xabım yox.
Turdə ta ki Həzrəti-Musa
Dövlət üçün o zarə qıldı dua.
Həqq ona lütf qıldı sərmayə,
Başına saldı feyzi-həq sayə.
Gördü bir gün ki, Həzrəti-Musa
Xəlq olub cəm, var bir qovğa.
Ol süxəndani-iyzədü mütəal
Səbəbi-qilü qalı etdi sual.
Dedilər ol cəmaət: – Ey Musa,
Budur ol tirəbəxtü bisərüpa.
Sən dua eylədin tapıb zəfəri,
Məst olub öldürübdü bir nəfəri.
Yekdilü yekcəhət səğirü kəbir

Bir nəfər şəxsi eyləyiblər əsir,
İndi biz şərə göstərib ixlas,
Tutmuşuq eyləyək o qanə qisas.
Şərmnak oldu Həzrəti-Musa,
O səbəbdən ki, etmiş idi dua.
Qıldı iqrar həqq hikmətinə,
Tövbələr etdi öz cəsarətinə.
Dedi: – Gümrahlıq edər peyda,
Çox kəsə ruzi etsə həqq əta.
Atanın gərçi malı var büsyar,
Zərər eylər oğuldu gər meydar.
Seyyida, mülkü malı bari-xuda
Hər kəsə layiqincə etmiş əta.
Çün deyilsən qədrdə sən qazi,
Hökmi-təqdirə olgilən razi.

## SÜLEYMAN VƏ QARĞA

Belə nəql etdi raviyani-kəlam –
Ki, Süleyman nəbi əleyhi-səlam.
Dedi kim, bir kəlağə eylə güzər,
Cümlə nəsli-tüyurə eylə nəzər,
Hansı ki, hüsndə ola ziba,
Götürüb gəl hüzuruma hala.
Bişəyə ol kəlağ qıldı güzər,
Etdi nəsli-tüyurə cümlə nəzər.
Nəzərində göründü pəstü bülənd,
Etmədi hiç bir güruhu pəsənd.
Öz balasına gəldi qıldı nəzər,
Eylədi batini məhəbbət əsər.
Dedi ki, cümlədən bu zibadır,
Bəs bunu töhfə etmək uladır. .
Götürüb düşdü əzmi-cövlanə,
Gətirib xidməti-Süleymanə.
Çün Suleyman o ziştə qıldı nəzər,
Dedi kim, ey kəlaği-bədmənzər,
Yoxdu quşlar içində bundan zişt,
Çox kərihül-cəmalü şumü düript.

İnkisar ilə ərz qıldı kəlağ,
Dedi ki, hər tərəfə çaldım ayaq,
Eylədim cümleyi-tüyurə nəzər,
Öz balamdan biri deyil behtər.
Bunda şək yoxdur, ey rəsuli-xuda,
Hər kəsə öz balasıdır ziba.
Seyyida, oğlun olsa kurü keçəl,
Görünür hamıdan gözündə gözəl.
"Küllü-hizbin bima lədeyhi"* oxu –
Ki, bu mənayədir işarə çoxu.

## MƏMUN VƏ KƏNİZİ

Aldı Məmun bir kənizi-lətif,
Bərgi-gül tək lətif-xülqü zərif.
Şəbi-xəlvət o sərvi-xoşqamət
Durdu Məmundan eylədi nifrət.
Xişmnak oldu padşahi-qəyur,
Çün özündən görüb kənizi nəfur.
Nə qədər bənd oldu miri-əcəll,
Padşahə kəniz vermədi əl.
Dedi Məmun, key fəriştəcəmal,
Xatirində nədəndi rəncü məlal?
Ərz qıldı kəniz, key mövla,
İstər öldür və ya ki eylə rəha –
Ki, gəlir buyi-bəd dəhanından,
Qaçıram, vəchi var ki, yanından.
O gecə hiç yatmayıb Məmun,
Qüssədən oldu sübhədək dilxun.
Sübh qıldı təbiblər ehzar,
Dərdi-pünhanın eylədi izhar.
Qıldılar dəfinə əlaci-niku,
Dəhəni oldu gül kimi xoşbu.
Dust tutdu kənizi şahi-əcəm,
Oldu hər sübhü şam ona həmdəm.
Mənə çox dustdur bu siməndam –
Ki, mənim eybim eylədi elam.

---

* Hər firqə [tayfa] özününkünə [öz əməlinə] fərəhlənər (*ayə*)

Eybi örtən rəfiq gövdəndir.
Onu sən dost sanma, düşməndir.
Seyyida, sanma dustdur, zinhar
Kim, sənə eybin eyləməz izhar.

## GƏNC SƏRXOŞ VƏ ABİD

Bir gecə bir cəvani-məstü xumar
Bir nəfər parsayə oldu düçar.
Oxuyurdu əlində həm bir saz,
Nəğmeyi-Şur edirdi, gah Şəhnaz,
Görcəyin parsanı ol sərməst
Başını sazı ilə qıldı şikəst.
Dinməyib parsa keçib getdi,
Gəlibən sübh ona əta etdi.
Dedi ki, məst idin gecə, ey oğul,
Bir qədər mən sənə gətirdim pul –
Ki, sınan sazüvü dürüst eylə,
Xoş deyil ki, şikəst ola böylə.
Sağalıbdır mənim başımda yara,
Sən də qıl sazüvü dürüst-nəva.
Çün cavan onda gördü xülqi-həsən
Eylədi tövbə öz ədasindən.

## SƏDİ VƏ XƏSİS

Sədi, ol köhnə bülbüli-Şiraz
Bu sifət eyləyib bu nəqli təraz –
Ki, neçə əhli-hal ilə həmdəm
Eyləyirdim səyahəti-aləm.
Eylər idik həmişə seyrü səfər,
Şəhrdən şəhrə mah kimi güzər.
Kəsb edirdik təcarübi-büsyar,
Bir gün əqsayi-Ruma düşdü güzar.
Dedilər var bu mülkdə bir kəs
Sahibi-küsfəndü xeyli-fərəs.
Var onun dövləti-firavanı,
Gecə olmaq gərəkdü mehmanı.

Bu gecə ta ki istirahət edək,
Sübh olanda yenə səyahət edək.
Cümlə bu fikrə tövəman oldu,
Kəbeyi-kuyinə rəvan oldu.
Görcəyin bizləri o sahibmal
Çıxıban tışra, etdi istiqbal.
Açdı mehrab tək bizə ağuş,
Qıldı xəm qəddin, eylədi kürnuş.
Baş əyib eylədik rükuü sücud,
Halətindən könül olur xoşnud.
Hamının öpdü əl-ayağından,
Gəh üzündən, gəhi dodağından.
Tutduq ol vəqt kim, hamı aram,
Durdu ol eylədi nəmazə qiyam.
Sübhi-sadiq olunca ol kəzzab
Söylədi:–"Ya müfəttihül-əbvab".*
Yatmadı sübh olunca mərdi-bəxil,
Gah təsbih qıldı, gah təhlil.
Qılmadı hiç mahəzər tərtib,
O gecə aç qaldı qövmi-qərib.
Oldu çün karivani-sübh əyan,
Mehr olub xani-sübhə qürseyi-nan,
Aşikar oldu çün rəğif şüa,
Sufilər mizbanı qıldı vida.
Yenə bir-bir öpüb bizi o bəxil
Qıldı təzim, eylədi təbcil.
Dedi bir sufi: – Ey fələkşövkət,
Fövci-dərvişə bu deyil hörmət.
Busə təshif ilə sən eylə əta,
Busədən acə tuşədir ula.
Xidmətimə çevirmə kəfş mana,
Başa başmağı vur, zər eylə əta.
Nan ilə mehmanı qıl ezaz,
Təbli-bihudətək nədir avaz.
Hər kəramət ki, var səxavətdir –
Ki, səxa əfzəli-ibadətdir.

---

* Ey [bağlı] qapıları açan, [bizim üçün bir yol aç]

## DƏVƏ VƏ BALASI

Azim olmuşdu karivani-ərəb,
Bir şütürbeççə çəkdi rəncü təəb.
Çün yoruldu o nazənin-rəftar,
Öz anasına eylədi izhar,
Dedi: – Ey madəri-qəviəndam,
Bir zaman yatgilən, tutaq aram.
Bu nə seyrü bu nə səyahətdir,
Nə məşəqqət, bu nə məraratdir?
Gəlmisən dağlar üstə cövlanə,
Düşmüsən Qeys tək biyabanə.
Dedi: – Ey tifli-şirxarə, məgər
İxtiyarımladır mənim bu səfər?
Olsa idim bir ixtiyar içrə,
Çəkməz idim yükü qatar içrə.
Sarbanın əlində oldu mahar,
Hər tərəf çəksə, eylərəm rəftar.
Gərçi məndən tapır bu fel südur,
Mənəm aləmdə faili-məcbur.
Gedirəm, əldə bir maharım yox,
Öz əlimdə bir ixtiyarım yox.
Kəştini sanma naxuda aparır,
Hər tərəf istəsə, xuda aparır.
Seyyida, həqdi faili-mütləq,
Etmə ləq-ləq kimi əbəs ləq-ləq.
Kimsə olmaz sənə cahanda dayaq,
Həq-təaladü qasimi-rəzzaq,
Gəlməmiş sən cahanə, ey mədum,
Ruziyi-qismətin olub məqsum.
Çəkmə ruzidən ötrü zərreyi-qəm,
Çatacaqdır sənə nə bişü nə kəm.
Leyk təhsilə eylə sən tədbir,
Şayəd olsun müvafiqi-tədbir.

## BİR ƏRƏBİN ƏLİDƏN SUALI

Bir ərəb Mürtəzadən etdi sual –
Key sipehri-ülumü bəhri-kəmal,
Əyləşə bir fəqir xəlvətdə,
Gecə-gündüz ola ibadətdə,
Xəlqdən qət eyləyə ülfət,
Bir kəsə zahir etməyə hacət,
Nə onun kəsbi var, nə dükkanı,
Bəs nə yerdən gəlir onun nanı?
Ona verdi cavab miri-əcəll,
Dedi: – Ordan gəlir ki, gəldi əcəl.

## OĞRU VƏ FƏQİR

Tutdu bir düzdi-nabəkarı əsəs,
Bağladı bir sütuna möhkəmü bəs.
Ol gecə var idi pərişanhal,
Sübhədək eyləyirdi fikrü xəyal.
Gördü ki, bir fəqir edir nalə,
Fəqrdən ol düşüb yaman halə.
Dedi oğru ona ki, ey əhməq,
Ol xəmuş, eylə şükri-nəməti-həq.
Fəqr ilə gərçi binəvasən sən,
Nə mənim kimi mübtəlasən sən.
Möhtəsib çəkməyib sütunə səni,
Salmayıb haləti-zəbunə səni.
Şükr elə, sən olan zaman bimar,
Səndən əhvalı bəd olanlar var.
Tapmasan saf, dürdə ol qane –
Ki, sənə kimsənə deyil mane.
Nə pirincin, əgər nə yağın var,
Şükr qıl sağ əlin, ayağın var.
Şükrlər qıl xudayi-mənnanə –
Ki, səni qərq edibdir ehsanə.

## MUSA VƏ ÇOBAN ƏHVALATI

Bir gün olmuşdu Həzrəti-Musa
Canibi-Turi-pakə rəhpeyma.
Nagəhan gördü bir nəfər çuban
Söyləyir: – Ya qəfurü, ya sübhan,
Hardasan, ey xudayi-ərzü səma!
Sənə qurban qoyun-quzum yekca.
Bircə gəl bu həqirü zarə qonaq,
Sənə süd-doğrama verim, qursaq.
Eyləyim zülfü kakilin şanə.
Yamayım çarığın zərifanə,
Sirkədən, bitdən eyləyim səni pak,
Başuvü qırxmağa olum dəllak.
Dedi Musa çobanə, ey əbtər,
Bu nə sözlərdü, olmusan kafər.
Məgər insandır xudayi-cahan –
Ki, gəlib ta ola sənə mehman?
Əkldən, şürbdən mübərradır,
Zatı məxfi, sifatı peydadır.
Sözlərindən sənin cahan titrər,
Nöh fələk, ərzü asiman titrər.
Ol xamuş, ey şəqavətin kanı,
Cismə mənsub qılma sübhanı.
O şəbanı Kəlim eylədi lal,
Verdi üz ol fəqirə dərdü məlal.
Gəldi çün Turə Həzrəti-Musa,
Açdı razü niyazə dəsti-dua.
Gəldi nagəh xitab Musayə –
Key kəlimülləhi-fələkpayə,
Fövci-peyğəmbərə deyildi rəva,
Sahibindən qulun edəydi cüda.
Bəndəmi eylədin cüda məndən,
Çox uzaqdır bu macəra səndən.
Arif ol, hər lisanə ol dana,
Halə bax, qalə baxma, ya Musa!

Seyyida, gərçi əbdsən şakir,
Hər lisan ilə həqqə ol zakir.
Hər lisan həq yanında zibadır,
Həqq özü hər lisanə danadır.

## HEKAYƏT

Yoxdu bir kəsdə ki, sücud ilə cud,
Yaxşıdır ki, ədəm ola o vücud.
Şərəfi-mərd cudü taətdir,
Mayeyi-fəzl bil itaətdir.
Sədi, ol köhnə bülbüli-bustan,
Öz kitabında böylə etdi bəyan –
Ki, mənə bir cavan düçar oldu,
Bir əcəb halət aşikar oldu.
O cavan sürət ilə idi rəvan,
Bir quzuydu dalınca səxt dəvan.
Mən dedim: – Ey rüunətə haris,
Rismandır bu halətə bais.
Tövqini açdı ol niku adab,
Yüyürüb sağü sola qıldı şitab.
Bəs olurdu quzu dalınca rəvan,
Dedi kim, ey səramədi-dövran,
Sanma bu meyli-risiman ilədir,
Bəlkə ehsani-bigiran ilədir.
Bəs ki məndən görübdü ehsanlar,
Lütfü bəxşayişi-firavanlar.
Gah cov, gah xəvid, gahi ab,
Etmişəm hər zaman onu sirab.
Var mənə bəs ki meyli-pünhani,
Məndən ayrılsa, san çıxar cani.
Seyyida, nəqslər təmam oldu,
Vəhşi ehsanı gördü ram oldu.
Olma heyvani-bizəbandan kəm,
Sənə lütf etdi rəbb lövhü qələm.
Səni qıldı zəmanə sultanı,
Bəxş edib neməti-firavanı.
Sənə qıldı müsəxxər əflakı,
Başuva qoydu taci-lövlakı.

Çar madərlə qıldı həft pədər,
İzdivac oldu üç yeganə pəsər.
Oldu ey rəmzi-əlləməl-Quran,
Üç məvalidin əşrəfi insan.
Səndən ötrü yarandı ərzü səma,
Şənüvə nazil oldu “Kərrəmna”*.
Qədrüvü bil ki, gör nə valasən,
Əsli-məqsudi-həq-təalasən.

## HİKMƏT

İki aqil kəs eyləməz dəva,
Eyləməz bir-birinə büğz əsla.
Çəng əhməqlə eyləməz aqil,
Əqli başında olsa gər kamil.
Onu nadan söysə vəhşətlə,
Bu onu ram edər fərasətlə.
Dostluq bil ki, tari-mu kimidir,
Büğz bir səng, ol səbu kimidir.
Gər iki dost olsa sahibdil,
Onu hifz eyləmək deyil müşkil.
Saxlayar bir tükü iki aqil,
Hər ikisi əgər deyil cahil.
hər ikisi ki, olsa tirəzəmir,
Onlara tab eyləməz zəncir.

## İTLƏ PİŞİYİN SÖHBƏTİ

Bir pişiyə it dedi: – Ey bihəya,
Evdə edirsən gecə-gündüz səfa.
Süfrə kənarında yeyirsən təam,
Kürsülər üstündə tutursan məqam,
Eylə yeyirsən gecələr aş sən,
Sübh yeyirsən yenə bozbaş sən.
Sən nə səbəb böylə əziz olmusan,
Kim eləyib hökm təmiz olmusan?

* Kəramətli etdik [Adəmi] (*ayə*)

Söylə, ağayə nə olub xidmətin,
Vacib olubdur bu qədər hörmətin?
Eyləyirəm sübhə kimi mən fəğan,
Dövlətü malə oluram pasiban.
Mən çəkirəm sübh olunca keşik,
Hərgiz itə tay deyildir pişik.
Çox gecə var ki, yatıram ac mən,
Dərd ilə bir löqməyə möhtac mən.
Getməyirəm özgə yerə nan üçün,
Səbr edirəm möhnəti-pünhan üçün.
Gərçi ağa döysə məni, qaçmaram,
Hər yetənə dərdi-dilim açmaram.
Muşqura hərgah, bularam quyruğu,
Ta ki ağanın nə ola buyruğu.
Cümlə cahan mərdümü, ey bədəməl,
Etdi vəfadə məni zərbül-məsəl.
İndi bəyan eylə mənə halını,
Ta ki bilim surəti-əhvalını,
Gör pişiyi kim, itə verdi cavab,
Söylədi: – Həqdir bu itabü xitab.
Hər nə dedin həqqdü, yoxdur xilaf,
Sözlərüvün biri deyildir kəzaf.
Leyk sənə qoy eləyim mən bəyan,
Surəti-əhvalını, ey bağrı qan.
Halüvə ol indi xəbərdar sən,
Bil nə səbəbdən belə murdarsən.
Xeyr işə mənnasən, ey bülhəvəs,
İstəməsən xeyr apara hiç kəs.
Gər gəlibən sail edə nan tələb,
Sən eləyirsən ona qəhrü qəzəb.
Damənini parə qılırsan onun,
Sən gününü qarə qılırsan onun.
Versə xanım sailə bir parça nan
Qeyzlə canın çıxar, ey bədgüman.
Cümlə bu aləm başına dar olur,
Rövşən olan dəhr sənə tar olur.
Maneyi-xeyr olma dəxi, Seyyida,
Qoy qapıdan xeyr aparsın gəda.

İt kimi tutma dəxi damanını,
Rahət elə əhli-tələb canını.
Mane olan xeyr işə bədzatdır,
Ayə ilə bicliyi isbatdır.
Həqq ona mötəl buyurub, həm zənim,
Şahidi-göftar “ütüllün zənim”.
Kimsə ki, bir xeyr işə mənna ola,
Dəyməz onun varlığı bir pula.
Çoxdu hədis ilə bu əmrə dəlil,
Abid ola cənnətə getməz bəxil.

## QARININ PİŞİYİ

Bir qarının bir pişiyi var idi,
Lağər idi, surəti-divar idi.
Çün yox idi qari evində təam,
Dərd çəkirdi o pişik sübhü şam.
Çünki yox idi o səra içrə nan,
Hiç tapılmazdı o evdə siçan,
Dolandıra muş ilə ta başını,
Tökməyə gözdən yerə qan yaşını.
Çıxmış idi damə qəzadən pişik,
Ruzi üçün çəkirdi hər yan keşik.
Bəlkə düşə bircə qaranquc ələ,
Ta yeyibən löqməni canə gələ.
Həsrət ilə pişik çəkirdi keşik,
Gördü gəlir neçə qəvi, kök pişik.
Yalvarıb ərz eylədi ol binəva
Ey sizə olsun bu bəlakeş fəda,
Siz nə səbəb böylə kökü çağsız,
Başdan ayaq quyruqsuz, yağsız,
Dişlərivüzdür necə dürri-səmin,
Yoxsa yeyirsiz gecə icli-səmin?
Mən gecələr tapmayıram bir siçan,
Həm yuxuda görməyirəm buyi-nan.
Söylədilər: – Biz gedib, ey bədniyət
Mətbəxi-xanda yeyirik aşü ət.

Bizim ilə gəl gedək ziyafətə,
Sən də yeyib aşü pulov gəl ətə.
Qarət edək yağlı qovurmaları,
Başa çəkək firnivü dolmaları.
Qoz ləpəsi, yağlı fisincanı gör,
Süfrəyə bax, neməti-əlvanı gör.
Vəqtüvə, get ol dəxi amadə sən,
Bir kef elə ömrdə dünyadə sən.
Gəldi evə, ol gecə yatdı pişik,
Sübhün açılmağına çəkdi keşik.
Qarı pişik sarıya etdi nigah,
Gördü çəkir həsrət ilə dudi-ah.
Gördü pişikdə görünür bir xəyal,
Qarı bunun vəchini etdi sual.
Açdı zəban, dedi pişik: – Ey qarı,
Kökdü pişiklər hamısı elcarı,
Bircə olan dəhrdə lağər mənəm,
Rəgləri bir rişteyi-mistər mənəm.
Damə dünən çıxmış idim seyd üçün
Müntəzir oldum bu sifət eyd üçün.
Düşmədi bir danə qaranquc ələ,
Sərçə üçün qurmuş idim bir tələ.
Olmadı əsla mənə bir quş şikar,
Ta eləyim seyd onu mən aşikar.
Həsrət ilə damda çəkirdim keşik,
Gördüm o əsnadə neçə kök pişik,
Yağ salıb cümlə bağlayıb göbək,
Hər biri yağ ilə dolan bəsti tək.
Seyqəl olub tükləri şəffaf idi,
Ayinə tək çeşmləri saf idi.
Hər biri sövlətdə necə nərrəşir,
Bığlarının hər birisi bir nəfir.
Pəncələri zurdə aslan kimi,
Hər biri bir əjdəri-qəzban kimi.
Hər birisi rəzm günü bir pələng,
Filbədən, bəbrliqa, şircəng.
Yalvarıban onları etdim səda,
Key sizə olsun dilü canım fəda!

Mən də sizin cinsinizəm aşikar,
Bəs əlimə düşməyir axır şikar.
Bir qarının xanəsidir mənzilim,
Olmayır ol xanədə həl müşkülüm.
Xaneyi-qaridə tapılmır siçan,
Gəlməyir ol evdə mənə buyi-nan.
Söylədilər lütf ilə: – Ey binəva,
Qarı evində hanı bərgü nəva?
Biz gedirik mətbəxi-xanə səhər,
Eyləyirik xanə-ara kərrü fər.
Aşü plovdan oluruq kamyab,
Yağlı fətirlər yeyirik, həm qutab.
Sən də bizimlə səhər eylə səfər,
Ta olasan biz təki sən bəxtəvər.
Fikrim odur mən də olarla səhər.
Mətbəxi-xanə eləyim ta güzər.
Bəlkə ki, ağzım çata bir ləzzətə,
Mən də gələm aşü plovdan ətə.
Bircə görüm təmi-fisincan nədir,
Mahi nədir, bərreyi-büryan nədir.
Qarı pişikdən ki, eşitdi cavab,
Açdı nəsihət dilin ol nüktəyab,
Söylədi: – Ey munisi-canım pişik,
Cismim-ara ruhi-rəvanım pişik,
Kim ki, təməkar olur – xar olur,
Möhnəti-üzmayə giriftar olur.
Künci-qənaətdədi gənci-rəvan,
Olgilən öz gəncüvə sən pasiban.
Rəsmdi kim, gənc olu viranədə,
Dürr səlamətdi bu kaşanədə.
Qane olan aləmə sultan olur,
Tame olan xak ilə yeksan olur.
Eyləmə sən mətbəxi-xanə güzər,
Qorxum odur vaqe ola bir xətər.
Qarı nə qədr etdi nəsihət ona,
Etmədi təsir bu hikmət ona.
Yatdı gecə, çıxdı səhər afitab,
Xani-fələkdə görünüb ol qutab.

Mətbəxi-sübhün dəri oldu fəraz,
Eylədi təbbaxi-qəza təbx saz.
Yatmamış idi pişiyi qarının,
Fikri var idi dili-əfkarının.
Gəldi pişiklər, onu etdi səda,
Gəldi qulağinə səda aşina.
Sıçrayıban çıxdı pişik xanədən,
Şəst ilə ol xaneyi-viranədən.
Etdi hamı mətbəxi-xanə şitab,
Düşdü yola bir neçə tiri-şəhab.
Mətbəxi-xanə var idi bir deşik,
Girdi deşikdən hamı fövci-pişik.
Girdi bacadan içəri elcarı,
Mırr ha mırro salıban hər sarı.
Çəngələrin açdı hamı qarətə,
Düşdü xələl yağə, pənirə, ətə.
Karını görmüşdü çü hökmi-qəza,
Var idi zahir xələli-ma məza.
Gəlmiş idi təngə o mətbəxnəvaz,
Etmiş idi saz neçə tir-saz,
Mətbəxə ta etsə pişiklər güzər
Eyləyələr tir ilə zirü zəbər.
Keşikçilər qoydu kəmanə oxu,
Pişiklərin qaçdı bacadan çoxu.
Tullana bilməz pişiyi qarının,
Lağər idi canı o bimarının.
Küncə sıxıldı, dedi ki, ey xuda!
Olsam əgər bu oxatandan rəha,
Tışraya çıxsam dəxi viranədən,
Bəsdi mənə mahəzəri-pirəzən.

## HİKMƏT

Kurlər hifz edəllə Quranı,
Leyk bilməzlər onda mənanı.
Oxuyur ləfzini ibarətlə,
Məddü işba ilə, qiraətlə,

Bilməyir hiç əmrü ehkamın,
Xaliqin etdiyi sərəncamın.
Adını xəlq ara qoyub arif,
Sirri-Quranə olmayıb vaqif.
Bunu Quranda həq deyibdü: himar
Məsəl üzrə ki, "yəhmilül-əsfar"*.
Oxuyur çox kəs ayeyi-Quran –
Ki, ona lənət eyləyir fürqan.
Bizə lazımdı bəs bilək məna,
Ta olaq mərdi-alimü dana.
Biz gərək kəşf edək rümuzati,
Fəhm edək ğamizati-ayati.
Hökmi-həq ləfzdən deyil müştəqq,
Hacıleylək də eyləyir ləq-ləq.
Ləfzinə qane olma, ey dana,
Bizə lazımdı ləfzdən məna.
Əcri var, sən oxu ibaratın,
Leyk idrak qıl işaratın.
Dediyin ləfzə bilgilən məna,
Olma nəsnas kimi, ey dana!
Bəıd ibaratə olma, ey aqil,
Səni mənadan etməsin qafil.
Tap səadət müqəddəmatından,
Möhkəmatü müşəbbəhatından.
Hər quşun vardı bir səyaq səsi,
Bülbülün xoş təranədir nəfəsi.
Qümriyü əndəlibü səlsəlü sar
Kəbkü teyhuvü sərçə, zağü həzar;
Cümləsi öz dililə zikr eylər,
Xaliqi-kirdigarə şükr eylər.
Cüğd hər ləhzə seyləyir həq-həq,
İstəyir həq liqasını ləqləq.
Hüdhüd eylər hədiyyə sübhanə,
Məläxi bəxş edər Süleymanə.
Budur, ey xoştəranə, zikri-xürus
"Üzkürullah" ey guruhi-nəfus.

* "Kəl-himarin yəhmilül-əsfar" – Dalına odun yüklənmiş eşşək kimi

Dürci-mənadü naleyi-dürrac,
Şərhi qamusədir onun möhtac.
Faxtə sübhü şam edər: ku, ku,
"Huvə movcud leysə illa hu"*.
Tutiyi-xoşsüxəndü ramişgər,
Hər zaman məclisə tökər şəkkər.
Hindi-mənadə zikr edər tavus,
Söyləyər: – Ya qəfurü ya ğüddus!
Ucalır hər zamanda naleyi-zağ,
Eyləyir yari-binişanı sorağ.
Cümlə olmuş həqiqətə şağil,
Seyyida, olma zikrdən qafil.

## HİNDLİ SƏLİMİN HEKAYƏSİ

Bir nəfər əhli-kənd olan hindu
Qonşusundan dilədi tənbaku.
Cibinə əl salıb o bahimmət
Bir ovuc eylədi ona şəfqət.
Tənbəki içrə olmuş idi bərat,
Səhv ilə, bir ədəd səfid manat.
O biri sübh gəldi hindi səlim**
Sahibinə pulu edə təslim.
Dedi ki, səhv olubdur, ey ağa,
Sən mənə pulu etməmişdin əta.
Dedi ki, tənbəki qılan ehsan
Pulu da bəxş edibdi, etmə güman.
Bu xitabı o etcəyin təqrir,
Əlini qoydu köksünə o fəqir,
Dedi: – Bu evdə vardır iki nəfər,
Birisi xeyr sahibi, biri şər.
Sahibi-xeyr etdi hökmi-qəvim –
Ki, pulu sahibinə qıl təslim.
Sahibi-şərr söylədi: – Ey yar,
Etmə təslim əhlinə zinhar!

---

* O [Allah] həmişə mövcuddur, ondan başqası yoxdur
** Pak, təmiz adam mənasındadır

Bu sənə ruziyi-müqəddərdir,
Lütfi-yəzdan sənə müqərrərdir.
Aparıb ver şərabə, nuş eylə,
Məst olub, kef çəkib, xüruş eylə.
Sübhədək qıldılar bu növ kəlam,
Qoymadılar məni tutam aram.
Qüvveyi-xeyr olub şərə qalib,
Rəddinə eylədi məni rağib.
Xoşu gəldi bu sözdən, ol ağa
O pulu ol fəqirə qıldı əta.
Seyyida, doğruluq elə pişə,
Doğruya yoxdu bimü əndişə.
Könlüvü pak qıl xəyanətdən,
İstə rizqin xudayi-qismətdən.

## FƏQİR VƏ ZALIM

Bir fəqirin papağını bir kəs
Qapıban qaçdı getdi karına bəs.
Gəldi o vadiyi-xəmuşanə*
Eylədi şəkvə həyyi-sübhanə.
Dedilər: – Ey fəqiri-dilsadə,
Papağın getdi zülm ilə badə,
Burda yoxdur əsər külahından,
Faidə yoxdu dudi-ahından.
Eləmə ahü nalələr, ey zar,
Otuma, get papağını axtar.
Dedi: – Hər yanə qaçsa ol əbtər,
Bilirəm, aqibət buraya gələr.
Bil ki, cayi-hesabdır bu məqam,
Yetəcək dadə qadiri-əllam.
Bil bunu, qəbrdir dəri-məhşər,
Yazılıb xubü zişt üçün dəftər.
Ruzi-məhşərdü cilvəgahi-cəlal,
Kəşf-olur onda nameyi-əmal.

---
* Qəbristan

Seyyida, qorx feli-münkərdən,
Həzər et intiqami-məhşərdən.
Özüvə zülmü eyləmə pişə,
Elə ruzi-cəzadən əndişə.

## MƏCNUNUN ƏHVALATI

Bir nəfər şəxs gördü Məcnunu
Ol əsiri-bəlavü dilxunu.
Bir qotur it alıb qucağinə,
Dəmbədəm baş qoyur ayağinə,
Gah öpür ol itin ayağından,
Gah öpür şövq ilə dodağından,
Deyir: – Ey pasibani-kuyi-həbib,
Dərdi-pünhanıma bu gündə təbib.
Ey olum bu ayağuva qurban –
Ki, dəyib kuyi-yarıma hər an!
Ey olum gözlərin nigəhbanı –
Ki, görübdür cəmali-Leylanı!
Bir nola, ey nəcibi-dövrü zaman,
Sövti-çanbəxşüvə olum qurban!
Tüklərin misli-udü ənbərdir,
Dişlərin iqdi-dürrü gövhərdir.
Sən tək ahusu yoxdu rizvanın,
Səgi-Əshabi-Kəhf qurbanın.
Dedilər: – Ey səfihü layələm,
İtə bu qədr yalvarar adəm?
Çəkdi Məcnun bir ciyərdən ah,
Övci-ərşə uçaldı dudi-siyah.
Dedi: – Çox kimsədən bu əladır –
Ki, səgi-asitani-Leyladır.
Gör ki, bir bu nə etibardədir,
Gecələr asitani-yardədir.
Belə it mən özüm olaydım kaş,
Nəqşimi it çəkəydi ol nəqqaş.
Fərqi vardır mənimlə, ey şeyda,
Mən buna səg, budur səgi-Leyla.

## MÜNƏCCİM ƏHVALATI

Var idi bir münəccimi-dana,
Nəzərində əyan nücumi-səma.
Sirri-təsiri-Zöhrəyə vaqif,
Əsəri-zu zəvanibə arif.
Nəql edirlər ki, ol hünər kanı,
Bilir idi hər əmri-pünhanı.
Bu münəccim evinə gəldi səhər,
Övrətin gördü qeyrə həmbəstər.
Çox səqət verdi, söylədi düşnam,
Qiylü-qalə yığıldı fövci-ənam.
Bildilər xəlq çün bu əhvali,
Oldular ta ki haldən hali,
Dedilər: – Ey münəccimi-rüsva,
Sən ki əsrari-çərxəsən dana,
Bəs nədən olmadın işə hali,
Bilmədin öz evində əhvali?
Öz evindən ki, səndə yoxdu xəbər
Dəxi göydən danışma, ey əbtər.
Oldu məlum ya ülül-əlbab,
Rəmzi-"küllü münəccimin kəzzab"*.
Seyyida, yoxdu etibari-nücum,
Bizə əsrari-həq deyil məlum.

---
* Bütün münəccimlər yalançıdır (*hədis*)

## OĞLUMA NƏSİHƏT

Bilmiş ol, ey nəcib fərzanə,
Ulular bəzmidir ədəbxanə.
Bilmək adabıdır sənə vacib,
Rəsmi-adabə olgilən rağib.
Biədəb olsa məclisə daxil,
Olu məlum kim, odur cahil.
Ədəbin rəsmidir cavabü xitab,
Bəlkə rəyi-mətinü qövli-səvab.
Hərəkətdən olur ədəb məlum,
Qövlü göftardən olur məfhum.
Bu rümuzi bilir ülül-əbsar,
Fikrsiz aqil eyləməz göftar.
Eyləməz, ey yeganeyi-dü səra,
Ehtiyat etməmiş əməl dana.
Bir sualə olursa ol şaiq,
Ver onun sən cavabını layiq.
Mətləbindən ziyadə vermə cavab,
Xahiş etsə deyil bu nəqsi-xitab.
Məclisə daxil olsan, ey dana,
Yuxarı başda eyləmə məva.
Sahibi-məclis eyləsə ikram,
Sənə versə yuxarı başda məqam,
Mizəbanın çox eyləsə ilhah,
Keç yuxarı, əgər varındı səlah.
Gər qolundan tutub edə ikram,
Qıl təvazölə sədri-bəzmi məqam.
Soluva, sağuva elə kürnuş,
Etmə bihudə söhbət ilə xüruş.
Sakit ol qeyri eyləsə göftar,
Danışan şəxsə eyləmə azar.
Özgə kəs gördün eyləyir söhbət,
Sakit ol, eyləmə ona diqqət.
Diqqət etsən sənə ədavət edər,
Cəhldən ol sənə şəmatət edər.
Çünki ol kəs ki, başlayıbdı xitab,
Özünü aqil eyləyibdi hesab.
Seyyida, əql əgər ola mədum,
Kimsə öz cəhlin eyləməz məlum.

## ÖYÜD

Ey oğul, həzrəti-rəsulüllah
Dedi: – "Əlkasibü həbibullah"*.
Ənbiyalər həm əhli-sənət idi;
Adəmin sənəti ziraət idi.
Oldu xəyyat Həzrəti-İdris,
Xəlqə ol elmi eylədi tədris.
Həzrəti-Nuhdur, oğul, nəccar,
Kəşti elmin o eylədi izhar.
Dəxi bəzzaz idi Xəlili-xuda,
Tikməbənd idi Yunisi-ziba.
Sibti-İmran olub Şüeybə çoban,
Oldu Davud zərgəri-dövran.
İbni-Davud sənəti zənbil,
Zəkəriyya kilimbaf idi bil.
Həzrətin pişəsi ticarət idi,
Dəxi ol şah əhli-sənət idi.
Çox zamanlar o sərvəri-kövneyn
Öz əliylə tikib, satıb nəleyn.
Ey oğul, bil ki, adəmi-bikar
Xüşk olan bir odundu, layiqi-nar.
Bunu bizdən deyibdilər əqdəm:
Sənəti olmayan deyil adəm.
Puç olub getsə dövlətin vayə,
Yenə sənətdir əldə sərmayə.
Gər ticarətçün olmasa dövlət,
Səy qıl, hasil eylə bir sənət.
Elmdir əhli-sənətin hünəri,
Elmsiz sənətin nədir səməri?
Elmsiz sənətin nə miqdari;
"Kari-buzinə nist nəccari**.

---
* Allah zəhmətkeşi sevir
** Dülgərlik meymunun işi deyil

## MİSİR ŞAHZADƏLƏRİ

Misr mülkündə var idi peyda
İki şəhzadeyi-sütudə əda.
Birisi elmə oldu bəs talib,
Birisi dövlətə olub rağib.
Birinə elmü fəzl olub hasil,
O biri dövlətə olub vasil.
Birisi əsrə oldu əllamə,
Birisi yetdi dövlətü kamə.
Biri asudə idi rahət ilə,
Birisi var idi məşəqqət ilə.
Bir gün ol əhli-sərvətü dövlət
Dedi qardaşına tapıb xəlvət;
Ey bəradər, bu nə məşəqqətdir,
Bu nə elmü bu nə riyazətdir?
Sən gedib elm eylədin təhsil,
Zahir oldu həzar cərrü səqil.
Nədir axır bu elmdən məqsud?
Atəşi-fəqrdən çəkirsən dud.
Olmuşam gör nə dövlətə vasil,
Elmdən səndə yoxdu bir hasil.
Açdı dürci-dəhanın ol fazil,
Bəhri-zəxxarü alimi-kamil.
Dedi kim, ey bəradəri-əhməq,
Mənə vacibdi şükri-neməti-həq.
Ənbiya irsinə mənəm varis,
Məndən afaqə elm olur hadis.
Mülki-Fironə sən də varissən,
Qəmü azari-xəlqə baissən.
Mən ki bir payimal olan murəm,
Şükrlər kim, nə nişi-zənburəm.

## HAMMALIN VƏQƏSİ

Bir səbət şişə bir nəfər həmmal
Aparırdı dalında malamal.
Nagəhan rast gəldi bir əşşar.
Bir dəmiri əlində əsbsüvar.

Səbətə vurdu mili ol sərməst,
Şişənin əksərini qıldı şikəst.
Dedi ondan: – Nədir bu, ey həmmal?
Dedi ki, vurmamış gərəkdi sual.
Bir də vursan, dedi, deyil bir şey,
Hər nə var idi, oldu cümləsi teyy.

## PADŞAH VƏ ƏDİB

Var idi bir ədibi-danişmənd,
Bəhri-elmü kəmalü mədəni-pənd.
Eyləyib elmü fəzl icadın,
Elmə təhris edərdi övladın.
Ona şah oğlun eylədi təslim,
Ta ona elmü fəzl edə təlim.
Dedi kim, ey ədibi-fərzanə,
Sənə təslimdir bu dürdanə.
Necə ki, oğluva edirsən cəhd,
Ona da eylə elmi-hikməti əhd.
Ta ədib etdi hökmi-şahı qəbul,
Oldu, insanı gör, zəlumü cəhul.
Neçə il çəkdi zəhmət ol dana,
Olmadı bir fərasəti peyda.
Leyk övladi-bakəmali-ədib
Hər biri fəzldən apardı nəsib.
Şah bir gün ədibə qıldı xitab,
Eylədi qeyz ilə itabə şitab –
Key müəllim, bu nə xəyanətdir?
Bu nə ixlasü nə iradətdir?
Əhdüvə hiç səndə yoxdu vəfa,
“Fə iza xaləfəl-kərimü cəfa”*.
Ərz qıldı ədib, key sultan,
Tərbiyətdir zəmanədə yeksan.
Müxtəlifdir və leyk istedad –
Ki, müqəssir deyil yəqin ustad.

---

* Kəramətli adam vədəxilaf olsa, cəfa etmiş olur (*məsəl*)

Daş-ara simü zərdü kər müzmər,
Leyk hər daşda yoxdu sim ilə zər.
Oldu dəhrə Süheyl nurəfşan,
Müxtəlif zahir oldu bəs əlvan.
Cümlə əlvan Süheyldəndir əgər,
Verdi hər cüzi-ərzə rəngi-digər.
Aldı hər çiz feyzi-mövlasın,
Eylədi zahir öz təqazasın.
Agəh ol kim, bir əmrdir müşkül –
Ki, verə şurəzarlər sünbül.
Seyyida, çəkmə zəhməti-bica,
Hər şey öz batinin edər peyda.

## LOĞMANIN VƏQƏSİ

Belə təqrir ediblər əhli-bəyan,
Həbəş əhliydi Həzrəti-Loğman.
Surəti sanki bir tutulmuş mah,
Ləb sitəbr idi, rənki-ruyi siyah.
Dedilər: – Ey güli-riyazi-ədəb,
Sənə nə hüsn əta edibdir rəbb?
Dedi: – Pərvərdigari-ərzü səma
Hüsni-batin mənə edibdir əta.
Hüsni-zahir əgərçi əhsəndir,
Leyk ondan ədəb mühəssəndir.
Hüsndür gərçi bir ətiyyeyi-rəbb,
Leyk ondan gözəldir hüsni-ədəb.

## ŞAH VƏ DEHQAN

Bir şahənşahi-asimandərbar
Etdi fəsli-şitadə əzmi-şikar.
Gecə düşdü uzaq imarətdən,
Ehtiyat eylədi mərarətdən.
Gördülər var xaneyi-dehqan,
Meyl qıldı o xanəyə soltan.

Dedilər: – Ey şəhi-büləndəxtər,
Beyti-dehqanı şah edərmi məqərr?
Şahsən, qeyrə iltica etmə,
Mənzilin xaneyi-gəda etmə.
Burda xeymə quraq, yaxaq atəş,
Dəfi-sərma qılar meyi-biğəş.
Qurdular xeymə, tutdular aram,
Mərdi-dehqanə oldu hal elam.
Bir qədər mahəzər qılıb saman,
Gətirib ərz qıldı: – Key sultan.
Gər olaydın bu bikəsə mehman,
Şənüvə yetməz idi bir nöqsan.
Qoymadılar bu qövmi-danişmənd,
Qədri-dehqan ola cahanda bülənd.
Gəldi çün padşahə xoş bu kəlam,
Köçdü, anın evində qıldı məqam.
Sübh çün yetdi növbəti-nehzət,
Verdi dehqanə nemətü xələt.
Qıldı dehqan müşayiət şahi,
Dedi: – Ey bürci-izzətin mahi,
Qədri-sultanə yetmədi nöqsan,
Oldu gər bir əkinçiyə mehman.
Leyk dehqanın oldu qədri bülənd,
İltifat etdi şahi-dövlətmənd.
Yetdi dehqan bu feyzi-üzmayə –
Ki, hüma saldı başına sayə
Bir daşı rəşki-ləli-nab etdin,
Zərrəni misli-afitab etdin.

## İSKƏNDƏRİN VƏQƏSİ

Nəql edirlər ki, bir gün İskəndər
Eylədi bir xərabə sarı güzər.
Gördü nagəh xərabədə bir pir,
Arizi rəşki-afitabi-münir.
Maili-taəti-xudayi-əlim,
Etmədi padşahə bir təzim.

Xişmnak oldu padşahi-qəyur,
Dedi: – Ey rahi-mərifətdən dur,
Nə üçün şahə etmədin təzim?
Mənəm İskəndəri-fələktəkrim.
Asiman-qədr şahi-dövranəm,
Lütfə dərya, səxavətə kanəm.
Mənəm iqlim-kirü bac-sitan,
Hökmümə tabe oldu cümlə cahan.
Dedi: – Ey şah-vacibüt-təkrim,
Sənə bir kimsə eyləsin təzim –
Ki, ola səndən ehtiyacı onun,
Dövlətindən ola rəvacı onun.
Qaneəm mən ki, künci-viranə,
Sözlərindir yanımda əfsanə.
Ki, olub indi padşah sənə.
Ey olan ol iki qulama qulam,
Nə təfaxürdür eylədin elam?
Çəkdi ol gün xəcalət İskəndər,
İltimas etdi ol fələkçakər,
Dedi: – Eylə məni-həzinə dua –
Ki, edə hirsü azı dəf xuda.
Seyyida, hirsü azdan həzər et,
Gənci-mülki-qənaətə güzər et.
Olasan gər İskəndəri-sani,
Olacaqsan zəmanədə fani.
Nə qalır mülkü malı dünyanın,
Nə şükuhü cəlalı dünyanın.

## MOLLA VƏ ÇOBAN ƏHVALATI

Bir çoban rast gəldi mollayə,
Görcəyin düşdü özgə sövdayə.
Kəsdi ol mollanın qabağını,
Qovzadı şəst ilə çomağını,
Dedi: – Ey mövtü mərk əsbabı,
Əhli-təzvirü mərdi-qullabi,

Dəli şeytan deyir ki, bir dəyənək
Mollanın zolla başına, zirək!
Dedi molla ki, ey çobani-dəğəl,
Dəli şeytan sözünə etmə əməl.
Adəmi ol çıxartdı cənnətdən,
Qıldı məhrum nazü nemətdən.
Əhli-təzvirdir o şumü ləin,
Həq buyurdu: – “Ləküm ədüvvi mübinə”*.
Tul qəflətdən ictinab eylə,
Əqlə gəl, taət et, səvab eylə!
Dedi: – Şeytan yenə deyir ki, mana
Eylə mollayə iki quzu əta.
Çün eşitdi quzu adın molla
Dedi: – Əhsən bu qövlə, namxuda!
Gah bir bax sözünə şeytanın,
Ta ki rahət ola dilü canın.
Seyyida, gərçi sən də mollasən,
Özüvü etmə böylə rüsva sən.
Olma təmma, get qənaət qıl,
Nəfsi-şeytanüvü məlamət qıl.
İmtahanxanədir sərayi-sipənc,
Bu tilismatda nihandır gənc.

## HATƏMİN MACƏRASI

Səxavət nəzminin şirin zəbanı,
Fəsahət mülkünün xoş tərcümanı,
Bu növ ilə sözü çəkmiş bəyanə –
Ki, bir il qəhtlik düşdü cahanə,
Qəzadən bir gecə ol Hatəmi-Tey
Yeməkçün axtarıb tapmadı bir şey.
Özü, oğlu, qızı, həm övrəti ac,
Haman şəb qaldılar Allahə möhtac.
Uşaqlarçun dedi Hatəm fəsanə,
Ol əfsanə olub xabə bəhanə.
Gedib xabə şərifü həm vəzii

* [Şeytan] sizin aşkar düşməninizdir (*ayə*)

Qalıb bidar özü, ancaq zəcii.
Bu oldu ol gecə məqsudi-Hatəm
Yatırsın övrətin əfsanədən həm.
Olub bərxurd övrət ol hesabə,
Özünü qoydu əmdən nuşi-xabə.
Neçə dəfə çağırdı Hatəm anı,
Sədası yox, sağın çıxmışdı canı.
Çü qadir olmadı övrət cəvabə,
Sağında Hatəm ol həm getdi xabə –
Ki, nagəh xeymə dalından bir övrət
Dedi: – Ey Hatəm, ey şahi-səxavət,
Uşaqlarım qalıbdır bu gecə ac,
Olub bir löqməyə məcmui möhtac.
Bu aclıqdan yetibdir canə afət,
Kərəm qıl, ey şəhi-mülki-səxavət.
Dedi Hatəm: – Get, ey miskinü dilgir,
Gətir ətfalüvü, ta eyləyim sir.
Bu rəmzi madiyə çün qıldı isğa,
Təbəssüm eylədi, key mərdi-dana,
Əgər bir löqməyə vardır gümanın,
Neçün ac yatdı əhli-xanimanın?
Tutum ki, gətdi ətfalın ol övrət,
Hanı sir etməyə xanəndə nemət?
Əgər var idi bir nemət xəyalın,
Neçün əfsanədən yatdı əyalın?
Durub Hatəm yerindən ol bəlakeş
Yığıb hiyzüm, mühəyya qıldı atəş.
Atın zibh eylədi, tez qıldı büryan,.
Qəbail xeylinə həm qıldı ehsan.
Dedi: – Düşmə, ey övrət, iztirabə,
Durub mehmanım ol sən də kəbabə.
Oyat ətfalüvü, ehsanə gəlsin,
Yeyib yeksər kəbabı, canə gəlsin.
Xəbərdar etməyə xəlqi o xanə,
Özü Hatəm gəzirdi xanə-xanə.
Gəlib sir etdi həm övrət əyalın,
Yedi, doldurdu ətdən dəstmalın.

Qəbail xeyli yeksər oldular şad,
Dedilər: – Xaneyi-ehsanın abad!
Tox oldu, ac qarınlar cümlə doldu,
At öldü, itlərin bayramı oldu.
Bu fikr ilə ki, nemət olmasın kəm,
O ətdən dadmadı, ac qaldı Hatəm.
Əgər var səndə həm, Seyyid, bu himmət
At öldür, ad çıxar, göstər səxavət.
Səxavətdir sifatullahi-əhsən,
Səxavətdən olursan bəhrəvər sən.
Səxavət bir diyari-xoşfəzadır,
Onun şahı Əliyyül-Mürtəzadır.
Bu üzdəndir buyurdu şahi-əkrəm:
Səxavət əhli görməzlər cəhənnəm.
Qərəz ki, zümreyi-mərdanə zinət
Səxavətdir, səxavətdir, səxavət!

## MİRCƏFƏRƏ XİTAB

Cəfər, ey ahuyi-biyabanım,
Ey biyabani-dildə ceyranım!
Ey maralım, gəvəzni-xoşnigəhim,
Bürci-dildə cəmalı mehrü məhim!
Belə yazmış bu rəmzi danalər,
Əhli-idrakü əhli-mənalər –
Ki, cahan içrə var elə işlər
Nəzərə ibtidadə xoş görünər.
Lakin axır verər nəticə yaman.
Buna şahiddir ayeyi-Quran.
Elə işlər də vardır, ey sərvər,
Sənə zahirdə çox yaman görünər,
Leyk axır verər nəticeyi-sud,
Olur ol əmr sülləmi-məqsud.
Huş ilə guş qılsan, ey güli-tər,
Bu hekayət sənə kifayət edər:

### HEKAYƏT

Var idi bir maral çox ətşan,
Gəldi bir çeşmə üstə ol heyvan.
Bu təmənna ilə ki, su içsin,
Su içib, çeşməsardən keçsin.
Çün nəzər qıldı suyə ol heyvan,
Baxıb öz əksin onda gördü əyan.
Gördü nazik ayağın, ol dilxun,
Tutulub könlü, oldu çox məhzun,
Gördü buynuzların fəxamətlə,
Xatiri şad olub, fəxarətlə –
Ki, bu əsnadə bir neçə səyyad
Düşdülər ol maral qəsdinə şad.
Binəva görcək onları qaçdı,
Leyk təqrir öz torun açdı.
Qovdu səyyadlar onu çox tul,
Olmadı leyk bir murad hüsul.
Oldular ol şikardən məyus,

Etdilər çox təəssüfü əfsus.
Gəldi nagəh qabağə bir bişə,
Çox qalın bişə idi, pür rişə.
Ovçulardan o gün qutarmağa can
Girdi ol bişə içrə ol heyvan.
İlişib buynuzu budaqlarə,
Olmadı bəs nicatına çarə.
Tutdular ovçular o heyvanı,
Düşdü dami-həlakətə canı.
Dedi ol binəvayi-xatirdağ:
Ey həqarətlə baxdığım əl-ayağ!
Sən məni xoş nicatə çatdırdın,
Ölmüş idim, həyata çatdırdın.
Ey fəxarətlə baxdığım buynuz,
Övci-çərxə buraxdığım buynuz,
Saldın axır məni həlakətə sən,
Vərteyi-möhnətü məlalətə sən.
"Hüvə xeyrün ləküm"dən etmə hiras,
"Hüvə kərhün ləkum"dən* eylə qiyas.

## ƏNVƏRİNİN ŞAİRLİYİ

Nəqldir, Ənvəri əvaili-hal
Oldu əhli-nücum, o çərxi-kəmal.
Ruzgarı keçirdi zillətlə,
Fəqrü faq ilə, min küdurətlə.
Əzqəza gördü ol sipehri-vəqar
Bir nəfər tövsənə olubdu süvar.
Sağü soldan qulamlər mövfur,
"Tərriqu" söyləyib edərlər übur.
Sordu: – Kimdir bu şəxsi-valaşan?
Dedilər: – Şairi-bədi bəyan.
Daim eylər mədayihi-Səncər,
Ona ikram edər şəhi-kişvər.

---

* İyrənc görünən şeylər bəzən sizin xeyrinizədir (*ayə*)

Ənvəri vaqif olcağın halə
Baxdı halına, çəkdi bir nalə.
Dedi: – Va qeyrəta! Bəs elmi-nücum
Olub aləmdə şerdən məzmum.
Bəs mənə vacib oldu şair olam,
Fənni-əşarü nəzmə mahir olam.
O gecə yatmadı o bipərva,
Bir gözəl nəzm eylədi inşa.
Səncərin mədh qıldı asarın,
Dedi bu mətlə ilə əşarın:
“Gər dilü dəst bəhrü kan başəd,
Dilü dəsti-xudayəgan başəd”*.
Gedibən şahə eylədi təqrir,
Çox pəsənd etdi şahi-ərş-sərir.
Şahdən tapdı malü dövlətü cah,
Axır oldu nədimi-məclisi-şah.
Çün var idi nücumdən xəbəri,
Şahə təqrir edərdi hər əsəri.

## SİÇAN VƏ BALASI

*Təmsil*

Bir ədəd bikəmal bəççeyi-muş –
Ki, hənuz olmamışdı sahibhuş,
Görməmişdi ziyayi-dünyanı,
Eyşü zövqü səfayi-dünyanı,
Bir zaman bixəbər anasından
Çıxdı tışqarı öz yuvasından.
Seyr edərdi o kuhü səhranı,
Hər tərəf eyləyib tamaşanı,
Ta ki oldu o xürdsalə əyan
Bir xürus ilə bir pişik o zaman.

---

* Əgər ürək ilə əl dəniz və mədən olsa, [o adam] Allahın əlində və qəlbində [yəni amanında, mühafizəsində] olar.

Pişiyi gördü oxşayır özünə,
Xoş göründü pişik onun gözünə.
İstədi eyləsin ona ülfət,
Leyk qıldı xürusdən vəhşət.
Qaçıban girdi öz yuvasına,
Macəranı dedi anasına,
Key olan rahəti-rəvanım ana,
Ey təni-zarıma təvanım ana,
Çıxmış idim bu gün səyahətə mən,
Leyk oldum düçar möhnətə mən.
Rast gəldim mən iki heyvanə,
Üz verib qəm məni-pərişanə.
Biri qayətdə xoşnüma idi,
Sanki məhbubi-dilrüba idi.
Bığlarında həcaməti var idi,
Biz tək əslü nəcabəti var idi.
Eylədim ülfətinə çox rəğbət,
Leyk yarından eylədim vəhşət.
Ku-kələk açdı hərzəvü pürmu,
Hər zaman eyləyirdi quqqulu-qu.
Gah qanadlarını döyürdü yerə,
Xişm edəndə dönürdü şiri-nərə.
Vardı başında şöleyi-atəş,
Ürəyim ondan eyləyirdi ğəşş.
Dedim: – Ey Tarı, ver qanad mənə,
Ver bu bədbəxtdən nicat mənə.
Qaçıb ol xəsmdən məni-qafil
Şükr oldum yuvamıza daxil.
Olmasaydı əgər o pür pərü bal,
Mənə hasil olurdu yarə vüsal.
Dedi: – Ey novrəsideyi-madər,
Rahətü nuri-dideyi-madər,
Vəhşətin biməqamü bicadır,
Ol xürusi ki, rəğbət-əfzadır –
Ki, onun yoxdu bir ziyanı bizə,
Bəlkə var rahəti-rəvanı bizə.

Sübh vəqtində tez durub bannar,
Annıyanlar işarəsin annar.
Sənə amma o xoş gələn heyvan
Düşməni-muşdir mühili-zaman.
Ey bala, ondan ehtiraz eylə,
O mühil ilə ülfət az eylə.
Cəfər, ey sərvi-bustani-pədər,
Güli-xoşətri-gülsitani-pədər,
Var elə şey ki, xoşnümadı sənə,
Leyk batində bir bəladı sənə.
Var elə şey ki, xoş gəlir gözüvə,
Leyk anın ziyanı var özüvə.
Neçə kim, "Dastani-bəççeyi-muş".
Oxusan eyləyər səni mədhuş.

## OĞLUMA NƏSİHƏT

Cəfər, ey nuri-dideyi-Seyyid,
Qönçeyi-novrəsideyi-Seyyid!
İttifaq eylə dust ilə hər an,
İttifaq ilə əmr olur asan.
Dəhrdə etmə iftiraqə həvəs,
İttifaq ilə kəslər olmuş kəs.
Vardır, ey bağİ-ömrümün şəcəri,
İttifaq etməyin gözəl səməri.
İttifaq eyləyəndə beş barmaq
Xeyli asandı bir şeyi tutmaq.
Yoxdur, ey sərvərim, tək əldə səda,
İttifaq ilədir sürurü səfa.
Edəsən guş gər bu timsali,
Səni filcümlə eyləyər hali:

### ASLAN VƏ İKİ ÖKÜZ

Bir çəragah içində iki öküz
Otlayırlardı şad gecə-gündüz.
Nagah onlara bir qəvi aslan
Eylədi həmlə səxt seyhə-günan.
Çün öküzlər görüb o əhvali,
Oldular fikri-xəsmdən hali.
Verdilər dal-dala o heyvanlar,
Qıldı buynuzlarıyla cövlanlar.
İttifaq eyləyib diliranə,
Durdu onlar müqabil aslanə.
Gördü aslan çü surəti-karı,
Bildi ki, həmləsi deyil karı.
Görüb aslan ki yox işində zəfər,
Oldu rubəh misalı hiylətgər.
Hiylə fikriylə ol qəvi-sövlət
Öküzün eylədi birin dəvət.
Dedi: – Ey gavi-xoşələf, hərgah
Olasan ol rəfiqdən ikrah,
Sənə minbəd etmərəm azar,
Olusan hər çəməndə bərxürdar.

Sənə verrəm hamı ələfzarı,
Görməsən bir dirəndə azarı.
Olusan daima pənahımda,
Dərgəhi-ərşi-iştibahımda.
O qədər vəsf edib özün satdı,
Axır ol binəvanı allatdı.
Onları bir-birindən etdi cüda,
Oldu aslanə müddəa peyda.
Onların parə qıldı əzasın.
Ey gözüm nuru, anla mənasın:
Əgər olsaydı ittifaqləri,
Gavlər görməz idi bu xətəri.
Xah rus əhli olsa, xah firəng
Vətən əhlilə olgilən yekrəng.
İttihad eylə, ittifaq eylə,
Üzüvü hər məkanda ağ eylə.

## TƏMSİL

Bir dəvə bir uzunqulaq ilə
Yol gedirlərdi çox dəmağ ilə.
Çatdılar bir çayın qırağına,
Dəydi bu eşşəyin dəmağına.
Dəvənin çünki su belindən idi,
Çağırıb ol uzunqulağı, dedi:
– Qorxma, gəl sən də, ey rəvani-tənim,
Su belimdən deyil yuxarı mənim.
Verdi eşşək cavab kim, ey yar,
Sözlərin doğrudur, yox eybü əvar.
O belindən sənin olan ənhar,
Daxil olsam mənim başımdan aşar.

## KORUN HEKAYƏSİ

Bir nəfər kur şəxsə bir bina
Tənə ilə dedi ki, ey əma,
Xəlqi-aləm hekayət eylərlər,
Bu sifət bir rəvayət eylərlər:

Hər kimi kur eyləsə yəzdan
Əvəzində edər ona ehsan.
Sənə ehsan nə eyləyib davər?
Dedi kor: – Ey əziz əhli-nəzər,
Bunu ehsan edib mənə tari
Görməyim sən kimi dilazari.

## HEKAYƏT

Omiros adlı bir həkimi-zaman
Ərzi-Yunanda olmuş idi əyan.
O həkimü ədibü şair idi,
Şer fənnində xeyli mahir idi.
Bir nəfər mərd söylədi anə –
Key hünərvər, həkimi-fərzanə.
Deyiləm gərçi mədhə mən layiq,
Həcvüvə lakin olmuşam şaiq.
Bir neçə beyt həcv qıl məzkur,
Ta olum cümlə aləmə məşhur.
Etmədi ol sözü həkim qəbul.
O təmənnadə şəxs oldu məlul.
Dedi bəs, ey ədibi-mülki-cahan,
Deyərəm xəlqə kim, həkimi-zaman
Bim edir məndən ol bədikəlam,
Eyləməz həcvə xövfdən iqdam.
Gör lətifə həkimi-fərzanə
Nə cavab eylədi həkimanə:
Dedi ki, bəs desən ki, şiri-jəyan
Qorxudan vurmadı itə dəndan,
Hiç kəs səndən eyləməz bavər,
Şir fəzlin bilirlər əhli-hünər.
Dedi ol şəxs: – Eyyühəl-fazil,
Oldu səd şükr, mətləbim hasil.
Sağ ol, ey filosofi-danişvər,
Mənə bu həcv xud kifayət edər.

## HEKAYƏT

Bir uşağın atası qürbətdən
Gəldi, şad oldu tifl behcətdən.
Kim ki, ol qapıdan edərdi güzər
Ona söylərdi tifl, key sərvər,
Müjdəganlıq gərəkdi simü zərim –
Ki, səfərdən bu gün gəlib pədərim.
Dedi bir şəxs ona ki, ey fərzənd,
Bu xəbər hamıya olurmu pəsənd?
Ananın çün gəlib səfərdən əri,
Gedibən madərindən istə zəri.

## ZƏRİFƏ

Evdə bir şəxs itirdi bir suzən,
Çıxıban axtarırdı bərzəndən.
Bildi bir şəxs çün bu əhvali,
Dedi: – Ey əqlü fəhmdən xali,
Evdə suzən itirmisən əlan,
Kuçədən axtarırsan, ey nadan.
Dedi: – Var bunda nükteyi-barik,
Kuçə rövşəndir axır, ev tarik.

## HEKAYƏT

Bir fəqirin işi düşüb ləngə,
Gəlmiş idi zəmanədən təngə.
Dedi bir şəxs ona ki pünhani,
Var bu şəhr içrə bir səxa kani.
Bağlayıbdır səxavət ilə kəmər,
Bəzlü bəxşişdi şüğlü şamü səhər.
Bilsə əhvalüvü o kani-səxa,
Sənə bişübhə nemət eylər əta.
Dedi: – Kimdir o, bilmirəm haşa,
Dedi: – Ollam dəlili-xeyr sana.
O fəqirin alıb əlin əlinə,
Bəs gətirdi o şəxs mənzilinə.
Girdi çün mənzilə o dil-məyus,

Gördü bir şəxs qəmtərirü əbus.
Dodağın sallayıb, töküb qaşın,
Zilləyibdir ayağına başın.
Çıxdı dərhal bəzmdən o fəqir,
Hacətin hiç etmədi təqrir.
Dedi ki, etmədin neçin izhar
Dərdüvü, ey fəqiri-dil-əfkar?
Dedi: – Göz dikmərəm ətasına,
Bəxş qıldım onu liqasına.
Dərdüvü söyləmə türüşruyə,
Hər yetən qəmtərirü bədxuyə.
Olusan tənəsilə fərsudə,
Sudə əlması eyləyər sudə.
İstə ruyi-güşadədən hacət,
Ta üzündən yetə sənə rahət.
Seyyida, tut qənaəti məhü sal,
Nari-duzəxdi həqqi zilli-süal.

## BƏD SƏSLİ MÜƏZZİN

Bir müəzzin fəzayi-səhradə
Uca sövt ilə gəldi fəryadə.
Sövti-məkruh ilə verirdi əzan,
Yüyürüb hər tərəf olurdu rəvan.
Durub öz sövtinə asırdı qulaq,
Eşidə ta ki sövtin ol sərsaq.
Bir nəfər şəxs gördü bu hali,
İstədi haldən ola hali,
Dedi: – Ey xoştəraneyi-dövran,
Bülbülü qümri tək edən əlhan,
Bir bəyan eylə bu nə halətdir,
Mənə kəşf eylə, bu nə hikmətdir?
Niyə bu dəştdə verirsən əzan,
Nə olursan o yan, bu yanə rəvan?
Dedi ki, xəlq edir mənə ezaz,
Məndə derlər ki, var gözəl avaz.
Qaçıram bərk azan verib hər yan,
Ta uzaqdan görüm sədamı əyan.

Ta bilim məndə varmı xoş avaz,
Ləhni-Davudə eyləyim mən naz.
Seyyida, böylədir həqiqəti-kar,
Özünə xoş gəlir sədayi-himar.
Özüvü xoştəranə etmə hesab,
Etməsin xəndə ta ülül-əlbab.

## EŞŞƏK VƏ ARILAR

Bir neçə kəndi gördü bir eşşək,
Arılar onda işləyir bişək.
Gördü bir xaneyi-müqəddəs var,
Beyti-şeşguşə içrə çox kəs var.
Padşahın hüzuruna getdi,
Şahi-yəsubdən sual etdi.
Dedi: – Bu kənddə nədir məqsud
Saz olur gündə nayü bərbətü ud?
Sizə hasil nədir bu qovğadən?
Vaqif eylə məni bu mənadən.
Dedi: – Biz səbzəyə olub çirə,
Edərik cəm kəndiyə şirə.
Dedi eşşək ki, yəni şirə nədir?
Olmusuz səbzi üzrə "çirə" nədir?
Bir qədər bal dadızdılar eşəgə,
Yedi eşşək çü balı, düşdü şəkə.
Düşdü bir fikrə eşşəgi-nadan
Ta gedib otlasın o da qalqan,
Gəlibən çəksin arı tək şirə,
Könlünü verdi fikrü tədbirə.
Yedi qalğanı, gəldi saldı peyin –
Ki, iyindən tutuldu başü beyin.
İylədi, daddı, gördü bal deyil,
Yediyi balə bu misal deyil.
Kəndiyə gəldi vurdu bir şıllaq,
Arıları dağıtdı ol sərsaq.
Gördü bir ayrı arı bu halı,
Arılardan soruşdu əhvalı,

Dedi: – Kəşf eylə, nə bəladır bu,
Nə müsibət, nə macəradır bu?
Dedi bir arı arıya: – Ari,
Biz bu yolda itirmişik ari.
Eşşəyə bal dadızmışıq qafil,
Olmuşuq fəzlü əqldən cahil.
Bu qəmü dərdə mübtəla olduq,
Sahibi-möhnətü bəla olduq.
Eşşəyə bəs dadızsa hər kəs bal,
Dağılır xanəsi onun bu misal.
Seyyida, elmi açma nadanə –
Ki, duşərsən cahanda nöqsanə.
Çəkmə kalayi-şeri bazarə,
Gövhəri ərz elə xəridarə.
Nə bilir dürr qədrini əllaf,
Yoxdu bazari-dəhrdə sərraf.

## SOLTANLA QUL ƏHVALATI

Bir qulami-əcəmlə bir soltan
Gəştiyə oldular süvar haman.
Görməmişdi qulam dəryanı,
Titrədi, etdi ahü əfğanı.
Nə qədər verdilər ona təskin,
Olmadı çarə, etdi ahü ənin.
Oldu soltanın işrəti dərhəm,
Xatiri-padşahə yetdi ələm.
Var idi kəşti içrə türfə həkim,
Dedi: – Ey sərvəri-fələk təzim,
Verəsən izn, ey sitarə-cüyuş,
Edərəm bu qulamı mən xamuş.
Dedi soltan ki, eyni-minnətdir,
Qayəti-lütfdür, kəramətdir.
Bəs buyurdu həkimi-pürmayə
Atdılar ol qulamı dəryayə.
Bir neçə qutə vurdu sudə qulam,
Gəldi kəşti tərəf o siməndam.
Tutdu sükkani-kəştini möhkəm,
Ta çıxıb kəşti üzrə qoydu qədəm.

Tapdı aram ol mələkmənzər,
Gördü ol padşahi-gərdunfər
Dedi kim, ey güzini-əhli-ədəb,
Bunun aramına nə oldu səbəb?
Dedi: – Bu görməmişdi dəryanı,
Eyləyirdi bu ahü əfğanı.
Elə kim, gördü qərq möhnətini,
Gəştinin indi bildi qiymətini.
Afiyət qədrini bilir o cavan,
Kim, ola bir bəladə əşkfəşan.

## HƏMƏDAN HAKİMİ

Gəldi bir hakimi-ülüvv-məkan,
Həmədan ölkəsində oldu əyan –
Ki, eşitmişdi ol büləndməkan
Bir nəfər şəxsi sahibi-ehsan –
Kim, o şəxsin gözəl səxavəti var,
Süfrəsi, lütfü, bəzli-dövləti var
Sahibi-bəzlü cuddir ənam,
Füqərayə müdam edir ikram.
Geydi bir köhnə sovb ol sərvər,
O səxinin yanına gəldi, məgər,
O səxi etmədi ona ikram,
Görmədi bəzlü cudü süfrə, təam.
Gəldi hakim evində tutdu qərar,
Görmədi onda lütfdən asar.
Sübh geydi libasi-zərtarı,
Caməsin etdi rəngi-gülnari.
Görcək ol şəxs eylədi pişvaz,
Əlini tutdu, qıldı çox ezaz.
Xoş səfa eylədi, dua qıldı,
Mədhlər söylədi, səna qıldı.
Dedi: – Qurban sənə bu ev, bu eşik,
Mən gərəkdir çəkəm qapında keşik.
Etdi amadə nemәti-əlvan,
Kəbkü teyhuvü bərreyi-büryan.

Gördü hakim çün ol sərəncamı
O ziyafətləri, o ikramı,
Gətirib löqmə-löqmə peyvəstə
Düzdü əlvan libasının üstə.
Dedi ev sahibi: – Nə halətdir,
Tutduğun iş xilafi-adətdir.
Dedi ki, mən dünən də gəlmiş idim,
Səni mən cud əhli bilmiş idim.
Görmədim səndə cuddan asar,
İndi gördün libasımı zərtar.
Sən mənimçün ziyafət etməmisən,
Yox, bu paltarə hörmət eyləmisən.
Bəs yesin bu qidaları bu libas,
Həqq olan sözdən eyləmə vəsvas.

## SİÇAN VƏ PİŞİK

Var idi bir şəhrdə bir bəd pişik –
Kim, yox idi bir belə mürtəd pişik.
Muşlərə zülmün edib aşikar,
Gün də edərdi neçə muşi şikar.
Gəlmiş idi təngə siçanlar hamı,
Eylədilər dəfi-qəmə əncamı.
Cəm oluban eylədilər məşvərət,
Gördülər axır bu işi məsləhət –
Kim, tapalar bir cərəsi-pürsəda,
Eyləyələr çareyi-dərdü bəla.
Bağlayalar zəngi pişik boynuna,
Zəng eləyə gürbə gələndə səda.
Gürbə gələn vəqt siçan tutmağa,
Zəngin ola ta ki səsi bərməla.
Qaçıb girə hərə öz yuvasına,
Düşməyələr ta pişik bəlasına.
Cümlə bu tədbirə dedi: – Mərhəba!
Tapdıla bir zəngi-qəvi, pürsəda,
Ərz elədi ta o zaman bir siçan:
Ey sizə qurban ola bu natəvan!

Etdiyiniz yaxşı sərəncamdır,
Kim deyəcək püxtə deyil, xamdır?
Kimdir o sizdən ki, doya canına,
Qoya qədəm ol pişiyin yanına?!
Kimdə o cürət olu, kimdir o kəs,
Ta pişiyin boynuna assın cərəs?
Qaldı o dəm matü məəttəl hamı,
Bilmədilər dəfi-qəmə əncamı.
Eyləmə, Seyyid, bu sifət fikri-xam,
Olma siçanlar kimi sən də əvam.
Fikrə düşüb etmə xəyali-məhal,
Etmə qəvi-çəng ilə fikri-cidal.

## ÖYÜD

Ey oğul, olma hiç gidyə-tələb –
Ki, gədalarda yoxdu şərmü ədəb.
Rəsmdir kim, gəda olur kahil,
Kahili küfr söyləyib aqil.
Mərdi-kahildə kim görüb qeyrət,
Abi-rudən düşər o bədtinət.
Eyləməz taəti-xudayi-cəlil,
Olu bietibar, xarü zəlil.
Olma dun-təb olan xəsisə cəlis –
Ki, xəsisin olur cəlisi xəsis.
Eyləmə hər gəda ilə ülfət,
Şəxsi-təmadən elə nifrət.
Ey oğul, tutma nanəcib ilə xu,
Türkdə bir gözəl məsəldir bu:
At yanında ki, bağladın yabu,
Rəngi bir olmasa, olur həmxu.
Fürsdə bir səramədi-dövran
Bu sözü beylə eyləyibdü bəyan:
"Xupəzir əst təbi-insani,
Babədan kəm nişin ki, bəd mani"*.
Ey oğul, bu hekayəti-ziba
Sənə bu macəranı eylər əda:

### DİLƏNÇİ TAÇİR

Nəql edirlər ki, şəhri-Nişabur
Əhdi-sabiqdə oldu çox məmur.
Bir zaman karivansəradə məgər,
Söhbət eylərdi neçə sevdagər.
Gəldi bir düxtəri-fəriştəcəmal
Açdı dəsti-niyaz, etdi süal.
Gördülər bir behişti simadır,
Sandılar yer üzündə huradır.

---

* İnsanın təbiətində xasiyyət tutmaq (götürmək) qabiliyyəti var; pislərlə az otur ki, səni də pis bilərlər.

Dedilər: – Heyf kim, bu rəşki-qəmər
Seyr edib hər tərəf süal eylər.
Yox idi bir dürüst pirəhəni,
Görünürdü təmam gül bədəni.
Hərə bir qədr etdilər ehsan,
Alıb ol düxtər oldu rahə rəvan.
Var idi bir cavan sövdagər,
Tiri-eşq etdi onu zirü zəbər.
Durdu, pünhan dalınca oldu rəvan,
Çatdı, ərz etdi, key fəriştənişan!
Səndə kim, vardır bu vəchi-həsən,
Nə üçün bəs gədalıq eylərsən?
İxtiyar eylə bir nəfər şövhər,
Bu gədalıqdan əl çək, ey gövhər.
Dedi ki, binəvaları kim alır,
Kim bizim tək fəqiri yadə salır?
Dedi: – Ey rahəti-dili-zarım,
Olaram mən sənin xəridarın.
Məndə çox mali-binəhayət var,
Sənə qurbandı hər nə dövlət var.
Dedi: – Mən bir qızam, yox əldə sərim,
Gəl gedək, bəlkə razıdır pədərim.
Pədərim versə, canə minnətdir,
Xəlqə adət, bizə nə bidətdir.
Dedi bəs, ey nigar, bismillah,
Oldular şadman rəvaneyi-rah.
Etdi səvdagəri o qız hali,
Dedi kim, bu imarəti-ali
Xanəmizdir, sən et təvəqqüfi-dər,
Mən gedim eyləyim atama xəbər.
Leyk bil, ey cəvani-şuxü zərif,
Hər nə qılsa atam sənə təklif,
Sən gərəkdir qəbul eyləyəsən,
Gər mənim ittisalım istərsən.
Daxil oldu evə o rəşki-qəmər,
Çıxdı bir afitabdən ənvər.
Geyinibdir libasi-fəğfuri,
Baği-cənnətdə yox belə huri.

Eşqi-sövdagər eylədi tüğyan.
Dedi: – Bismilləh, ey rəşid cavan.
Çün evə daxil oldu sövdagər,
Gördü bir şəxs piri-xoşmənzər,
Verdi ikram ilə o pirə səlam
Və əleykəssəlam, vəl-ikram!
Səni xoş gördük, ey cəhani-sürur!
Eylədin xanimanımız məmur.
Bu imarət, bu mülk, bu xanə
Pişkeşdir əziz mehmanə.
Gördü sövdagər ol fəsih-məqal
Tutini vəqti-nitq eylər lal.
Evinə baxdı gördü çox əsbab,
Fərşi-çinivü qaliyi-siqlab.
Fərş olundu büsati-şahanə,
Etdilər iltifat mehmanə.
Düzdülər xanə neməti-əlvan,
Kəbkü teyhuvü bərreyi-büryan.
Gəldi həm növ-növ şərbətlər,
Şəmlər asimanə şölə çəkər.
Ələ aldı kənizlər dəfü çəng,
Zöhrənin çəngi oldu rəşk ilə çəng.
Söhbəti-yarü nəğmeyi-dilkəş
Cani-sövdagərə salıb atəş.
Ələ aldı qavalı ol düxtər,
Başladı nəğməni o rəşki-qəmər.
Oxudu çəmxəm ilə bir Şüştər,
Dili-sövdagərə vurub niştər.
Oldu tavus tək durub rəqqas,
Döndü bir cənnətə o məclisi-xas
Qaldı heyran bu halə sövdagər,
Dedi: – Ey piri-övliyamənzər,
Mənə bu müşkül əmri eylə bəyan,
Qalmışam matü valehü heyran.
Səndə kim, var bu qədər dövlət
Dəxi sailliyə nədir hacət?
Xassə bu düxtəri-fəriştə cəmal
Heyfdir kim, bu gün edirdi süal.

Dedi pir: – Ey cəvani-xoşmənzər,
Guş qıl, ta verim bu halı xəbər.
Bil ki, Abbasi-dustdur adım,
Bu gədalıq mənimdir içadım.
Sənətimdir gədalıq ehyana,
Verələr dövləti-cahanı mana,
Əlimi çəkmərəm bu sənətdən,
Yaxşıdır bu cəmii hirfətdən.
Bu qədər kim, görürsən əsbabı
Hər qizanın nə növdür qabı,
Bunların mayəsi gədalıqdır,
Nə gədalıq ki, padşalıqdır.
Gər gədalıqdan olmaya bir şey –
Ki, qoyum anı süfrə yanına hey,
O gecə yatmağa yuxum gəlməz,
Ürəyim sübh olunca dincəlməz.
Gün də bu düxtəri-fəriştəüzar
Kəsmişəm ki, gətirsin üç dinar,
Gətirir övrətim dəxi o qədər.
Bizə sənət budur, eşitdin əgər.
Hünəri-düxtəri bu gün bari
Görmüsən, gör sabah məni-zari.
Bil ki, aləmdə çox hünərlər var,
Baği-dünyadə çox səmərlər var.
O gecə işrət etdilər yeksər,
Ta ki oldu qərib vəqti-səhər,
Dedi: – Dur, dəstəmazə oldu əzan,
Ol filan məscidə nəmazə rəvan.
Gör gəlib mən nə iş təmam edərəm,
Necə mən aləmi soyub gedərəm.
Oldu məsciddə müntəzir o cavan,
Nagəhan gördü kim, gəlir piran.
Gəldi, məsciddə pir qıldı nəmaz,
Dərgəhi-həqqə qıldı razü niyaz.
Durdu nagah ayağə şeyxi-kəbir,
Ucadan çəkdi naleyi-təkbir:

Keyyühənnas, ey güruhi-bəşər!
Bir fəqirəm əlilü çox müztər,
Neçə baş binəva əyalım var,
İki-üç tifli-xürdəsalım var.
Həq bilir, iki gündü kim, acıq,
Yeddimiz bir rəğifə möhtacıq.
Gərçi ruzirəsandu rəbbi-ənam,
Etmişəm mən ona təvəkküli-tam.
Leyk aləmdir, aləmi-əsbab,
Böylədir rəsm, ey ülül-əlbab.
Əhli-məscid görüb fəsahətini,
Etdilər cümlə guş söhbətini.
Dedi ol pir: – Ey güruhi-bəşər –
Ki, gəlirdim nəmazə mən bu səhər,
Tapmışam yolda bir mətai-giran,
İki xalxali-zərri-danənişan.
Tapmağımdan çox eylədim vəsvas –
Ki, qalır gərdənimdə həqqün-nas.
İstədim kim, atıb namazə gələm,
Yenə qorxdum ki, şüğli-zimmə olam.
Sər-bemöhr ol mətai mən naçar
Məscidə gətdim, ey ülül-əbsar!
Bir əminə edin onu təslim,
Rəsmini qazi eyləsin təlim.
Hər zaman çıxsa sahibi-xalxal,
Çatar öz sahibinə mali-həlal.
Ruzi möhtacı bir fəqirəm mən,
Möhnəti-fəqrə dəstgirəm mən.
Etdi xalxalı onlara təslim,
Aldı, mehr eylədi o qövmi-səlim.
Dedilər: – Mərhəba bu dindarə!
Etmədi meyl bunca dinarə.
Yerbəyerdən durub o gün hüzzar
Verdilər pirə dirhəmü dinar.
Oldu hasil o pirə sim ilə zər,
Qaldı məbhut mərdi-sövdagər.

Gəlibən evdə tutdular aram,
Dedi sövdagərə o şeyxi-hümam:
Ol ki xalxalı etdim onlara bənd,
Qızımın malıdır o, ey fərzənd.
Gəl sabah məscidə tamaşayə,
Gör hünər övrətimdə yüz payə.
Yenə fərş oldu süfreyi-yəğma,
Yenə əvvəlki məclis oldu bina.
Gördü sövdagər, ol qəmərsayə,
Eyləyibdir özünə pirayə.
Gəldi yüz işvə ilə ol xudkam,
Etdi sövdagərin sağında məqam.
Qıldılar əkl, içdilər şərbət,
Etdilər ol gün , ol gecə işrət.
Çünki sübh oldu, şeyxi-nüktəsəra
Dedi: – Dur, ey cavani-xoşsima.
Getdilər məscidə zamani-namaz,
Hərə bir yanda qıldı razü niyaz.
Məscidə ta ki, varid oldu imam,
Xəlq etdi namaz üçün iqdam.
Məscidə girdi bir nəfər övrət,
Çəkdi fəryad, saldı çox vəhşət.
Dedi: – Fəryad, ey müsəlmanlar!
Olmuşam bir yaman bəlayə düçar.
Zəni-məşşatəyəm, əlilü fəqir,
Xəlqə pirayə eylərəm məni-pir.
Qızını qonşumuz verirdi ərə,
Mənə yalvardılar beş-altı kərə,
Bir neçə parçacıq qızıl gətirim,
Qızı zinətlə məqsədə yetirim.
Mənə dövlətlilər edər hörmət,
Etibar əhliyəm, dəxi izzət.
Bir neçə qitə lazimati-tila
Almışam ariyət məni-rüsva.
Dəri-məsciddən, ey güruhi-mələk,
Mən dünən gecə ötmüşəm yügürək,

İki xalxali-zər düşüb məndən,
Bais oldur ki, eylərəm şivən.
Sahibi heç inanmayır sözümə,
Bəs ölüm fərz olub mənim özümə.
Dedi qaziki, ey əfifeyi-zar,
Qorxma, anı tapıbdı bir dindar.
Xeyli mali-həlal imiş ol mal,
De görək vəznidir neçə misqal?
Neçə qaş-daşı var o xalxalın,
De nişanın, apar həlal malın.
Dedi: – Bir cüft zərrdən xalxal,
Qaş-daşı əlli, vəzni yüz misqal.
Qırx daşı ləldir, onu yaqut.
Qaldılar xəlq valehü məbhut.
Dedilər: – Afərin bu mali-həlal
Şükrlillah ki, olmadı pamal!
Gətirib ol mətai qövmi-səlim
Etdilər ol əcuzuyə təslnm.
Yenə ol övrət eylədi fəryad,
Dedi kim, eyləyin mənə imdad.
İtirəndən bəri o xalxali
Mahəzərdən qalıb evim xali.
Qalıb evdə uşaqlarım möhtac
İki gündür susuzdular, həm aç.
Həm əlim boşdu, həm üzüm qarə,
Edin Allah rizasına çarə.
Durdular xəlq etdilər ehsan,
Çıxdı övrət evinə oldu rəvan.
Dedi pir: – Ey cəvani-nakamil,
Gəl gedək, oldu məqsədim hasil.
Getdilər evdə tutdular aram,
Dedi pir: – Ey cəvani-nikəncam,
Bu hünərlər ki, oldu məlumun,
Bilirəm mətləbini məxdumun.
Bizdə həftad növ var hünər,
Hər biri bir xəraci-Misrə dəyər.

Qızımın istəsən mübaşirətin,
Eylərəm mən bunun müxafirətin.
Səndən artıq deyil qızım, ey can,
Leyk mən böylə etmişəm peyman –
Ki, gərək bir kəsə verəm anı,
Bu gədalıqdan ola samanı.
İstəyirsən ki, yarın olsun yar,
Get, gədalıqdan eylə kəsbi-mədar.
Dedi: – Ey şeyx, məndə çox mal var,
Əhli-malə həramdır bu süal.
Tacirəm, məndə var çox dövlət,
Dövlətim həm sənindi, biminnət.
Dedi pir: – Ey cəvani-müstəhsən,
Sən gərəkdir bu fənni öyrənəsən.
Xahiş etsən vüsali-cananı,
Bu gədalıqdan eylə dərmanı.
Dedi: – Məşhur tacirəm məni-zar,
Tanıyırlar məni hamı tüccar.
Necə şərm etməyim məni-cahil –
Ki, gedim xəlq-ara olum sail?
Mənə mane olur həyavü ədəb,
Filhəqiqə bir əmrdir bu əçəb.
Dedi şeyx: – Ey cəvani-xam süxən,
Sən bu karı hənuz görməmisən.
Sözlərin həqqdir, hicabın var,
Sənə bu əmr çox gəlir düşvar.
Leyk bu əmri, ey cəvani-səlim,
Sənə çox səhl eylərəm təlim.
Ənqərib eylərəm səni irşad,
Olusan sən özün bu işdən şad,
Neçə gün qal evimdə, mehman ol,
Ruzü şəb həmcəlisi-canan ol.
Sonra karvansərayə eylə güzər,
Açıban hücrəni otur müztər.
Elə ki, yarü aşina gəldi,
Cümlə yarani-basəfa gəldi,

Özüvü göstər onlara qəmgin,
Zarü pəjmürdə, biqərarü həzin.
Dəmbədəm durma, çək ciyərdən ah,
Ah çək, asimana eylə nigah.
Səndə zahir olanda bu əhval,
Halını sərbəsər edəllə sual,
Degilən, sormayın mənim halım,
Olsa yegdir xəfadə əhvalım.
Nə deyim, gər desəm, zəban titrər,
Qüssədən ərzü asiman titrər.
Dilə gəlsə bu razi-pünhanım,
Qorxuram od tutub yana canım.
Ey cavan, damı danədən eyrən,
Karı bu karxanədən öyrən.
Saxla yadında bu lətifəni sən,
Çox zamanlar bu rəmzi işlədəsən.
Bir əcəb daru etmişəm peyda,
Yengüvü tər qılıb səpərsən ona,
Gözüvə sürtəsən əgər ani,
San gözündən açıbla dəryani.
Sənə mən bir qədər verim əlhal,
Vəqti-hacətdə eylə istemal.
Ağlayarsan çəkəndə darunu,
Gətirər mövcə rudi-Ceyhunu.
Sənə eylər rəfiqlər israr,
Bir qədər ağla, söylə, ey tüccar,
Nə yaman yerdə oldu gün axşam,
Kaş ömrüm bu gün olaydı tamam.
Neçə illərdi kim, müzarəbdən
Çəkirəm həddsiz zərərlər mən.
Bu ticarətdə düşmüşəm vayə,
Çıxıb əldən təmam sərmayə.
Zahirən el gözündə tacir idim,
Sillə ilə mən üz qızardır idim.
Açılıb indi pərdeyi-karım,
Bir ədəd nanə yoxdu dinarım,
Sümüyə lap bu gün dayandı pıçaq,

Durmayır qeyzdən başımda papaq.
Rədd qıldım xəlayiqin malın,
Sizə təqrir eylədim halın.
Neçə gündür ki, mən özüm acəm,
Bu gecə nani-xüşkə möhtacəm.
Gözüvə yengüvü çəkib ağla,
Elə ağla ki, aləmi dağla.
Çün görərlər səni bu növ ilə zar,
Hiç şək yox ki, cəm olar dinar.
Hərə bir ciz edər sənə şəfqət,
Yenə bir qədr cəm olur dövlət.
Çün eşitdi bu halı sövdagər,
Qutəvər, oldu bəhri-fikrə məgər.
Dedi şeyx: – Ey cəvani-sadəzəmir,
Sənə püskəndə etmişəm təqrir.
İstəyirsən vüsali-yarı əgər,
Yoxdu bu əmrə çareyi-digər.
Aşiq idi çün ol zəlumü cəhul,
Naəlac eyləyib o əmri qəbul.
Gəldi çün karivansərayə tərəf,
Gördü tüccarlər durub səf-səf.
Dedilər: – hardasan, nədir halın,
Şərh qıl sərgüzəştü əhvalın.
Dedi: – Var idi bir rəfiqi-qədim,
Məni mehman eylədi o kərim.
Necəsiz, sizlərə nə növdü hal?
– Lilləhül-həmd, yaxşıdır əhval.
Oldu mane o növcəvanə həya,
Şeyx təlimin açmadı əsla.
Ol gecə yarü aşinalər ilə
Yedilər, içdilər, keçindi belə.
Gecə öz hücrəsində yatdı cavan.
Sübh sənduqunu açıb hər yan,
Yüz qızıl pul götürdü, qıldı xuram,
Gəlib Abbas-şeyxə verdi salam.
Dedi: – Oldun muradına vasil,
Yüz qızıl nəqd eylədim hasil.

Əlinə şeyx çün pulu aldı,
San ilan çaldı, tez yerə saldı.
Dedi: – Ey novcəvani-xamxəyal,
Bunda bir həbbə yoxdu puli-süal.
Məndə vardır bu sirrin ecazi,
Şeyx Abbasə xoş deyil bazi.
Yetmiş ildir ki, mən bu növ ilə nan –
Yemişəm, ey zəmiri sadə cavan!
Yemərəm xəm sənin firibindən,
Get, özün küsdün öz nəsibindən!
Bilmədin ləzzəti-gədalığı sən,
Tapmadın böylə padşalığı sən.
Yoxladım, yoxdu səndə hiç hünər,
Qızıma ol kişi olur şövhər –
Ki, gədalıq onun şüarı ola,
Gidyə bəhsində iştiharı ola.
Yeri, get, ey cavan, şitab eylə,
Dəvəni görməmiş hesab eylə.
Get nəsibin ola bu rənci-səqər,
Görəsən rəncü möhnəti-bifər.
Mənəm Abbasi-dust, mərdi-gəda,
Cümlə heyrandı halıma üqəla.
Məndən öyrəndilər gədalığı xəlq,
Nə gədalıq ki, padşalığı xəlq.
Çatmayıb gərdimə mənim bir kəs,
Sən məni alladırsan, ey nakəs!
Anladı rəmzi-şeyxi həm düxtər,
Durdu yanından ol mələkmənzər.
Keçmədi çün qəbulə gətdiyi zər,
Urdu bəs dəstüpaçə sövdagər.
Dedi: – Ey şeyxi-mürşüdü kamil,
İndi qıllam muradını hasil.
Aqibət getdi taciri-əhvəl,
Eylədi göftguyi-şeyxə əməl.
Nə ki, təlim eyləmişdi ona
Cümləsin gəldi eylədi bərpa.
Olmaq üçün muradına vasil,
Gidyədən simuzər qılıb hasil,

Gətirib şeyxə eylədi təslim,
Duruban şeyxə eylədi təzim.
Baxdı simasına dedi: – Səddəq!
Tapdı səndən sərayımız rövnəq.
Üzdə sailliyin hüveydadır,
Bu o tacirliyindən əladır.
Sən ki bu əmrə eylədin iqdam,
Tərkinə yoxdu dəxi bir əncam.
Get, həlalındı düxtərim, dərhal
Həm sənindir bu mülkü dövlətü mal.
Vəsli-yarından oldu çün şadan,
Getdi malın gətirdi bazərgan.
Hər nə var xak-ara nihan elədi,
Yemədi, mali-digəran elədi.
Büxlü imsakdən, ləamətdən
Döndü halı, dolandı tinətdən.
Eylə qıldı gədalığa adət,
Şeyx Abbasə vermədi fürsət.
Daim əfsus edərdi kim, bica
Çəkmişəm xeyli zəhməti-dərya.

## ZAHİDİ-MÜSTƏCABÜDDƏVƏ

Mənzum nağıl

Bir nəfər zahidi-xocəstəliqa –
Kim, ona müstəcab olurdu dua,
Zahir oldu Ədən diyarında,
Məskən etmişdi kuhsarında.
Nanı kəşkinəvü libası xəşən,
Əl götürmüşdü mülki-dünyadən.
Hər bəla gəlsə eyləmişdi qəbul,
Olmuş idi ibadətə məşğul.
Əzqəza bir kəlaği-bimiqdar
Bir ədəd muş eyləmişdi şikar.
Zahidin çün keçirdi üstündən,
Çıxdı nagəh siçanı dəstindən.
Zahidin daməvinə düşdü siçan,
Dedi: – Tapdın nicat, ey heyvan.
Əlini çəkdi dalına zahid,
Siçanın yandı halına zahid.
Dedi: – Oldun xilas düşməndən,
Mənə gəldin dəxil oldun sən.
Səni hifz eyləmək bəlalərdən
Mənə vacibdir, ey zəifbədən.
Onu zahid götürdü bəs əlinə,
Gəldi öz etikaf-xanəsinə..
Dedi düşməndü bu fəqirə pişik,
Çəkmək olmaz buna müdam keşik,
Elə hifz eyləmək gərək anı –
Ki, pişik tutmasın o heyvanı.
Bir mürid ərz qıldı: – Key mövla,
Bir dua eylə ta ki bari-xuda
Eyləsin bu siçanı bir düxtər,
Dedi zahid: – Əcəb dedin, mən əgər
Bir dua eyləsəm, dönüb bu siçan
Olacaq düxtəri-fəriştənişan.
Çünki yoxdur mənim də övladım,
Olur övladım ol pərizadım.

Bu təmənnayə zahid etdi dua,
Müstəcab eylədi duanı xuda.
O siçan döndü oldu bir düxtər,
Hüsni-surətdə rəşki-şəmsü qəmər.
Özünə zahid eylədi övlad,
Etdi təyin bir nəfər ustad.
Ona adabi-şəri öyrətdi,
Ta ki həddi-büluğə qız yetdi.
Dedi zahid ki, ey qızım, əlhal
Görünür səndə həddi-rüştü kəmal.
Vəqtdir kim, çəkilsin, ey qəmnak,
Rişteyi-izdivacə gövhəri-pak.
Razı olsan bu kari-xeyrə əgər,
Cümleyi-kainatə eylə nəzər.
Eyləsən hər kimi qəbulü pəsənd,
O sənə şövhər olsun, ey fərzənd.
Dedi düxtər ki, ey pədər, əlan
Çün qılırsan bu növ ilə fərman
Mənə insandan olmasın şövhər,
Məni bir şəxsə ver bacarsan əgər –
Ki, onunçun ola məqami-rəfi,
Görünə onda iqtidari-bədi.
Rüfətü qüdrətü təvanadə
Olmaya misli dari-dünyadə.
Dedi zahid: – Bu vəsflər əlhəq,
Tapılır afitabdə mütləq.
Səni lazımdır afitabə verim,
Səbr qıl, sübh açılsın, ani görüm.
Dedi qız: – Ari, ey niku-üslub,
Çünki ol bir kəsə deyil məğlub.
Ver məni afitabi-tabanə,
Əqdimi qıl mənim o zişanə.
Ta ki fərmani-faliqül-əsbah
Yetişib leyli-müzlim, oldu sabah,
Şərqdən afitab oldu əyan,
Ona əhvalı zahid etdi bəyan.

Dedi: – Ey afitabi-aləmtab,
Guş qıl ərzim, ey bülənd cənab,
Bir qızım var sipehri-behcətdə, .
Tən edər ayə hüsni-surətdə.
Eyləyib şövhər ixtiyar səni,
Çün görüb sahib-iqtidar səni.
Övci-rüfətdə, sən təvanadə
Görməyib kimsə dari-dünyadə.
Oldu çün afitabə söz rövşən,
Dedi: – Ey şeyxi-pakdamən, sən
Lilləhül-həmd, mərdi-danasən,
Cümlə zərrati-kövnə binasən.
Məndə hərgah olaydı tabü təvan,
Məni etməzdi bir bulud pünhan,
Mənə peyvəstə əbr olur qalib,
Yaxşıdır əbr ola ona sahib.
Qızına zahidi-ülüvv-məkan
Gəldi, bu macəranı qıldı bəyan.
Dedi qız: – Doğru söyləyib o cənab,
Məni bəs əbrə vermək oldu səvab.
Əbrə çün macəranı qıldı bəyan,
Əbr olub tirə-rəngü qətrə-fəşan,
Dedi: – Ey piri-mənbəyi-ehsan,
Məndən artıqdı qüvveyi-baran.
Onu sən əqd eylə baranə,
Ta onu saxlasın lətifanə.
Döndü baranə pir etdi xitab,
Dedi: – Ey tər-mizacü tünd-şitab,
Ey edən hər büsatı lütf ilə təyy,
“Və minəl-mai küllü şeyin həyy”*.
Ey edən külli aləmi mövcud
Eyləyən gah nüzulü gah süud.
Mayeyi-kainatü əsli-həyat,
Sifətin həq buyurdu: – Əzbi-fürat.
Ey olan aləmə fərü ovni,
Ey qılan qərq ali-Fironi.

---

* Hər şey sudan dirilmişdir [həyat tapmışdır] (*ayə*)

Bir qızım var kəmali-lütfdə ab,
Arizi afitabi-aləmtab.
İstərəm eyləyim sənə təzvic,
Ta verim şəri-ənvərə tərvic.
Dedi baran ki, ey səfa kani,
Sən mənə bağlama bu böhtani.
Məndən artıqdı xak qüvvətdə,
Deyiləm mən o şənü şövkətdə.
Qızını xakə izdivac eylə,
Eşq bazarını rəvac eylə.
Xakə etdi xitab abidi-zar,
Dedi: – Ey çərx tək olan dəvvar,
Dolanan dövri-afitabı müdam,
Eyləyən dövrünü bir ildə təmam,
Ey qılan dörd təriq ilə hərəkət,
Yetişir səndən aləmə bərəkət.
Xilqəti-aləmə bəhin-mayə,
Sənə xurşidi-həq salıb sayə.
Səndən oldu çü xilqəti-Adəm,
Tapdı Adəmlə zib bu aləm.
Künhüvü bilsə idi divi-ləin,
Deməz idi "xələqtəhu, min tin"*.
Əgər olsaydı ərəfü əqəl,
Narı bilməzdi xakdən əfzəl.
Nəzər etdim, bu, dari-dünyadə
Yoxdu bir kimsə sən tavanadə.
Bir qızım var bəsani-hurü pəri,
Hüsnü məbhut edibdir hər bəşəri.
Belə gördüm bu gün səvabu səlah,
Sənə mən eyləyim o mahı nikah.
Dedi xak: – Ey nəticeyi-əflak,
Lilləhül-həmd, səndə var idrak,
Məndə gər olsa tabü qüdrət bəs,
Olmaram payimali-hər nakəs.
Hanı ey intixabi-ruzi-ələst,
Çar cövhərdə bir mənim tək pəst?

---

* ...onu [Adəmi] sən palçıqdan yaratmısan (*ayə*)

Bir cəmadəm ki, iqtidarım yox,
Əldə bir cüzi ixtiyarım yox.
Məndən əfzəldü rütbə ilə nəbat,
Fəzli olmuş nümüvv ilə isbat.
Qızını əqd elə nəbatə yetir,
Fəzlini cümlə kainatə yetir.
Dolanıb gəldi abidi-heyran;
Macəranı nəbatə qıldı bəyan.
Dedi: – Ey sufiyi-hərimi-səfa,
Sufiyi-saf kimi səbzqəba,
Ey olan zibi-gülşəni-cənnət,
Qədəmi-Xızr ilə tapan xüzrət,
Hər bahar eyləyən büruzü zühur,
Mayeyi-ibtihacü əsli-sürur.
Nəkhətin mislü-ənbəri-buya,
Səbzeyi-xətti-yar tək ziba.
Bir qızım var, yanağı laleyi-al,
Əqd edim mən sənə, nikah elə, al.
Çün eşitdi bu macəranı nəbat,
Dedi: – Ey zahidi-fəriştəsifat,
Olmuşam ərzəli-xəlayiq mən,
Deyiləm izdivacə layiq mən.
Ayaq altında payimal oluram,
İldə beş gün şüküftəhal oluram.
Ömrümün yox davamü payanı,
Sən deyən əmrə məndə güc hanı?
İstəsən ki, qızın ola xürrəm,
Qoyuna eylə əqdini möhkəm.
Get, o şuxü qoç ilə yar eylə,
Könlünü rəşki-novbahar eylə,
Dögümi bu fəziləti-zahir
Məni ruzi qılıb ona qadir?
Odu bir nuri-pakü fərxəndə,
Həq nəbati ona qılıb bəndə.
Yaradıb xoş onu xudayi-cahan,
Aləm ondan olubdur abadan.
Abidə gəldi xoş kəlami-nəbat,
Qıldı qəlbində niyyəti-həsənat.

Qoyunun yanına rəvan oldu,
Qəlbi surü sürur ilə doldu.
Bir çəməndə yetişdi həzrətinə,
Vasil oldu səfayi-cənnətinə.
Dedi: – Ey zibi-aləmi-imkan,
Səndə zahirdü sənəti-yəzdan.
Olmasaydın fədayi-İsmail,
Oğlunun başını kəsərdi Xəlil.
Hər cəvareh ki, səndə vardır əyan,
Olmaz əsla sifatı şərhü bəyan.
Xurişü puşişü bəni-Adəm,
Səniləndir, bilir hamı aləm.
Bərəkət səndədir həqiqətlə,
Bilmişəm mən bu rəmzi röyətlə.
Səndən az nəsli yoxdu bir heyvan,
Həm sənin kimi yox tələf olunan.
Nə qədər əksilirsən aləm-ara,
Bərəkət həq sənə verir amma.
Hamının ehtiyacı səndən var,
Nəslin əksildikcə yüz artar.
Mədhini eyləyib rəsuli-ənam,
Nursən, vəssəlam, vəl-ikram!
İstəyir könlüm, ey xocəstəsifət –
Ki, edim mən səninlə bir vəslət.
Bir qızım var yeganeyi-dövran,
Hüsnü abid-firibü sinni cavan.
Yetişib rüşt həddinə o pəri,
Vacib olmuş ona ki, olsun əri.
Baxıram kainatə mən yeksər –
Ki, tapım anə yaraşan şövhər.
Səni gördüm bu vəslətə məqbul,
Şövq ilə eylə bu məramı qəbul.
Qızımı algilən, məni qıl şad,
Könlümü eylə qüssədən azad.
Eşidib bu xitabı çünki qənəm,
Belə verdi onun cavabın o dəm:
– Ey vücudu səadəti-mütləq,

Doğru sözdür buyurduğun əlhəq,
Heyf mən binəvavü biarəm,
Daima qüssədən diləfkarəm.
Düşmənim çoxdu, cümləsi bibak,
Hamısı bimürüvvətü çalak.
Baxgilən bir o gürgi-məkkarə,
Olub ondan işıq günüm qarə.
Sürüdə olmasa o sarı köpək,
Mənə müşküldü otlamaq, gəzmək.
Bir tərəf qurd edibdi könlümü qan,
Bir tərəfdən də xud bəni-insan.
Əllərinə düşəm, yeyir ətimi,
Artırıbdır bu qüsrə möhnətimi.
İstəsən ta ki bərmurad olasan,
Ola hər müşkül işlərin asan,
Məndən əfzəldi qüvvədə qəssab,
Qızını ver ona, odur sənə bab.
Qızını mən əgər alam, ey pir,
Yenə qəssab eyləyər təzvir,
Kəsibən başımı, ətimi satar,
Qızını dul qoyar, o bədətvar.
Söylə qəssabə bu hekayəti sən,
Ona bu macəranı qıl rövşən,
Necə fərmayişi-peyəmbərdir,
Layiqi-paki-şəri-ənvərdir;
Siğeyi-əqdin eyləsin cari,
Qalmasın dildə üqdə asari.
Zahid oldu bu haldən hali,
Oldu xoş hali, xürrəm əhvali.
Gəldi, qəssabə verdi türfə səlam,
Ona qəssab eylədi ikram,
Dedi: – Ey zahidi-mələkətvar,
Mənə nisbət nə qulluğun sölə var?
Söylədi zahid: – Ey vəfa kani,
Bir qızım var ki, bu cahan cani.
Gözləri məst, qəmzəsi cadu,
Zülfü tərsadü, xalıdır hindu.

Can alır, can verir kaman qaşı,
Bədr tək on beşə yetib yaşı.
Ona vacib olub ərə getmək,
Sənə də fərzdir ki, evlənmək.
Al nikah ilə ol məhi-tamı,
Özüvə cənnət eylə əyyamı.
Dedi qəssab: – Ey həmidəşiar,
Mənim evlənməyimdü çox düşvar.
Deyiləm layiqi-təəhhül mən,
Sən gərəkdir məni bağışləyəsən.
Məndən əfzəldi farə bu karə –
Ki, qoyubdur məni o avarə.
Məni bir möhnətə edibdi düçar –
Ki, yemək-içməyimdü səmmül-far.
Məndə qoymur yağ ilə piy daim,
Nə tərazu-bağım qalır qaim.
Ona mən tapmıram dəxi çarə,
Könlümü möhnəti qılıb parə.
Məndən artıqdı zurü qüvvətdə,
O qoyubdur məni xəsarətdə.
Qızını ver ona elə kürəkən,
Ona xoşdur ki, ər ola kəsəgən,
Sözü qıldı təmam çün qəssab,
Gördü zahid ki, düz gəlib bu hesab
Cins öz cinsinə olur vasil,
Hissə qıldı bu qissədən hasil.
Bu sözə çoxdu hüccəti-qate –
Ki, olur şey əslinə race.
Cins cinsin həmişə cəzb eylər,
Yoxdu bu işdə söhbəti-digər.

# ÖYÜD

*Qitə*

Ey oğul, büxldən sən eylə həzər –
Ki, bəxilin yeri cəhənnəmdir.

Gər həlak olsa cümleyi-aləm,
Yenə söylər bəxil kim, kəmdir.

İstəməz bir kəsi ola xoşbəxt,
Öləcək görsə kimsə xürrəmdir.

Şəbpərə afitabədir düşmən –
Ki, ziyasıyla halı dərhəmdir.

Seyyida, şəbpərə xisal olma –
Ki, bu ətvar mərgi-əzəmdir.

## SİÇAN VƏ PİŞİK DASTANI

Həmd ola ol xaliqə sübhü məsa –
Kim, yetirib feyzi cahanə səfa!
Cümleyi-məxluqə verib canlər,
Hazır edib neməti-əlvanlər.
Hər nə həvadə o ki, pərvaz edər,
Pər açıban qüdrətin ibraz edər,
İki qanad ilə uçan teyrlər,
Yerdə gəzən dabbələr, qeyrilər,
İki ayağ, ya ki, ola dörd ayağ,
Badeyi-qüdrətdən içibdir əyağ.
Cümlə üməmdir olar “əmsalikum”,
Bəs oların qövlü “kəəqvalikum”.
Şirə verib sövlət ilə heybəti,
Filə verib qüdrət ilə qüvvəti.
Qılsa əgər murə icazət əyan,
Etsə əgər peşşəyə hökmün rəvan,
Qalib olur şirə bu sövlətdə mur,
Filə o qüvvətdə edər peşşə zur.
Şirə şücaətdədi naib pişik,
Çəkdi siçan dəfinə daim keşik.
Muşə təvəkkün yetirir xakdən,
Xali deyil gürbəsi idrakdən.
Hər nə ki var qüdrəti asarıdır,
Feyzinin afaq nəmudarıdır.
Zakiridir tayiri-cəvvis-səma,
Şakiridir sayiri-təhtəs-səra.
Mən də onun vəhdətinə qailəm,
Xirməni-ehsanına bir sailəm.
Etmərəm inkar məhi-ənvəri,
On iki rəxşəndə olan əxtəri.
Alinə, əshabına olsun salam!
“Qəllə və dəllə hüvə xeyrül-kəlam”*.

---

* Sözün yaxşısı az sözlə çox məna ifadə edənidir.

Var ümidim ki, xudayi-əhəd
Eyləməyə aqibəti-karı bəd.
Bari-xudaya, əhəda, sərmədа
Həqqi-rəsulil-ərəbi Əhmədа!
Sən ki özün vaqifi-əhvalsən,
Etmə öləndə dilimi lal sən.
Nəzi-rəvan vəqti dilim, ey xuda,
Kəlmeyi-tövhidüvü etsin əda.

## DASTANIN YAZILMA SƏBƏBİ

Dün birinə nəql elədim, ey filan,
İstəyirəm nəzm ola bir dastan
Gürbə ilə muş hekayətlərin,
Cəngü cədəl, məkrü ədavətlərin,
Ta ki uşaqlar ola rağib ona,
Təbi-səlimi ola cazib ona.
Tənə üzündən mənə verdi cavab,
Söylədi: – Key şairi-valanisab,
Yoxsa nəhayətdi kəlamın sənin,
Badəsi yox, xalidi camın sənin.
Türfə qəzəllər tapıb inşa elə,
Vəsfi-qəzalani-dilara elə.
Nərgisi-şəhlaləri, tövsif qıl,
Zülfi-mütərraləri tərif qıl.
Söylə nədir qaideyi-məsnəvi,
Bəsdi bizə maideyi-Movləvi.
Gər hünərin var, qəzəldən danış,
Yarə nəzər eylə, gözəldən danış.
Gürbə nədir, muş nədir, ay kişi?
Şair olanın nədir onda işi!
Gördüm onu annamayıb mətləbi,
Özgə məzaq elədi çün məşrəbi.
Əcz ilə ərz eylədim, ey sərfəraz,
Etmə mənə tənə zəbanın diraz.
Şair olan kəsdə hər əhval olur,
Bostan ara dəymiş olur, kal olur.

Dürr olan yerdə olur həm sədəf,
Kaseyi-fəğfur olur, həm xəzəf.
Gülşən ara gül də olur, xar olur,
Nur olur, aləm ara nar olur.
Yaxşı içində nola olsa yaman,
Gənc olan yerdə olur həm ilan.
Dəkkeyi-əttarədi şair hesab,
Xarü xəsək, həm olu ətrü gülab.
Etmə mənə eyb bu əhvalı sən,
Əhlimizin danişinə halisən.
Yüz çəkəsən riştəyə dürrü gühər,
Yoxdu xəridar ona bir nəfər.
Gövhərə var idi xəridar əgər,
İçdi Füzuli niyə xuni-ciyər.
Bəng nədir, badəni nəzm eylədi,
Buzeyi-dilsadəni nəzm eylədi.
Şairi-Bəğdad, o şirinxitab,
Zahid ilə rində yazıb bir kitab.
Şerdə lazımdır ola təyyibat,
Şerdü, mahım, bu deyil möcüzat.
Sehri-həlalımdı bu sözlər mənim,
Feyzi-kəmalımdı bu sözlər mənim.
Var ümidim ürəfa etsə guş,
Zeyli-kərəmlə olalar eybpuş.
Bihünər əşxas olur eybcu,
Eyb eləməz kim ki, ola nikxu.
Çeşmi-bədəndişi görüm kur ola!
Şəbpərə tək gözləri binur ola!
İstəməz aləmdə ola afitab,
Gecə sevər, gündüzü görməz səvab.
Bir hünərin gər ola, həftad eyb,
Dust görər ol hünəri, yoxdu reyb.
Eyb bilər fəzlini əhli-qərəz,
Çünki onun var ürəyində mərəz.
Zati-xəbisiyə təqaza budur,
Hikməti-xəllaqdə məna budur.

## HƏZRƏTİ-İSANIN HEKAYƏSİ

Həzrəti-İsa ilə beş-on nəfər
Bir günü bir yerdən edirdi güzər.
Gördülə bir qurd düşən it düşüb,
Cümlə qotur əndamı yeksər şişib.
Buyi-üfunət verir ol meyyitə,
Söylədilər: – Bircə baxın bu itə!
Biri dedi: – Qurd düşüb əndamına,
Biri "qotur" dedi onun namına.
Biri dedi, gör ki, nə bəd buyi var!
Zərdabı var, zəhr kimi suyi var.
Hər biri bir növ olub eybcu.
Söylədi ruhulləhi-pakizəxu:
Vəh, nə gözəl, dür kimi dəndanı var,
Dürci-sədəfdə düri-qəltanı var.
Dür var idi onda, edibdir zühur,
Çıxdı qoturdan dəxi ləfzi-qotur.
Hər nə ola kuzə ara əndərun,
Vəqti-tərəşşühdə çıxar ol birun.
Həzrəti-İsadə var idi gühər,
Sahilə dür verdi o dərya-əsər.
Gərçi sənin də hünərin vardır,
Gör gülünü, baxma ona xardır.
Olma ol əşxas kimi eybcu,
Həzrəti-İsa kimi ol nikxu.
Açma bu misgər dükanın, Seyyida,
Başla sözü, eylədi hatif nida.

## DASTANIN BAŞLANĞICI

Nəql eləyim gəl sənə bir dastan,
Farsi ilə nəzm eləyib bastan.
Türki ilə mən onu təhrir edim,
Könlüvü şad et, sənə təqrir edim.
Bircə qulaq ver belə dəvayə sən,
Eylə nəzər şurişü qövğayə sən.
Bil ki, nə sultan, nə xanın cəngidir,
Bir pişik ilə siçanın cəngidir.

## PİŞİYİN TƏRİFİ

Bircə pişik var idi Kirmandə,
Sövləti yox bəbrdə, əslandə.
Gözləri sarıydı, necə kəhrüba,
Yelgəsi şirü özü bir əjdəha.
Gərdəni ağ, boynu misali-qutan,
Bir nəfəsə sərçəni yüz min tutam.
Dırnağı Əzrailə çəngal idi,
Bığları bir burğuya timsal idi.
Ağzı yekə, quyruğu misli-ilan,
Əfi kimi xişm ilə adəm çalan,
Tülkü kimi başdan ayağ hiləgar,
Sanki tükündən tökülür zəhri-mar.
Sinəsi qaqum kimi çox ağ idi,
Qövsi-qüzeh kimi qaşı tağ idi.
Dişlərinin hər biri bir niştər,
Xəncəri-fulad kimi tiztər.
Qarnı yekə, təbl kimi pürsəda,
Xitteyi-Kirmanda necə kətxuda.
Evdə gəlinlərlə yatardı müdam,
Gündüz ağalarla yeyərdi təam.
Yayda yük üstü ona yaylaq idi,
Kürsülər altı ona qışlaq idi.
Bir bu sifət gürbə ki vəsf eylədim,
Vəsfini nəzm ilə sənə söylədim,
Girdi şərabxanəyə bir gün pişik,
Ta ki siçan tutmağa çəkdi keşik.
Pusqu üçün girdi küpün dalına,
Çəkdi əlin bığına, saqqalına.
Qurd kimi yatdı, maraq eylədi,
Hər tərəfə baxdı, soraq eylədi.
Oldu qəzadan bu qəziyyə əyan,
Çıxdı küpün üstünə ta bir siçan.
Saldı başın, xümmdən içdi şərab
Məst oluban etdi itabü xitab,

Söylədi kim, hanı o məlun pişik,
Çəkdi siçan tutmağa daim keşik?
Bircə nolaydı gələ meydanıma,
Ta ki düşəydi gözü cövlanıma!
Gürzi-giran ilə əzəydim başın,
Ta axıda qanlı gözündən yaşın.
Cəng günü Rüstəmi-dastan mənəm,
Qüvvət ilə Samü Nəriman mənəm.
Puri-Pəşəng ilə ki çəng eylərəm,
Ərseyi-cəngi ona təng eylərəm.
Şəstimə tab eyləməz Əfrasiyab,
Kimdi pişik ki ola itcə hesab?!
Hər nə ki hədyan danışırdı siçan
Cümləsini bildi pişik bigüman.
Tiz elədi şəst ilə dəndanını,
Sıçrayıban tutdu giribanını,
Qaynağına vurdu o bədəxtəri,
Həncərinə qoydu onun xəncəri.
Ağladı, yalvardı o dəmdə siçan,
Ərz elədi, key şəhi-mülki-cahan
Hər nə dedim əfv elə ki, məst idim
Bir ... idi, ağzıma gəldi yedim.
Şahi-cahansan, sənə mən nökərəm
Bəndeyi-xarəm, sənə xidmətkərəm
Bir də görünsə bu sifət bir əda
Üzr yoxundur, mənə eylə cəza.
Rəsmdi kim, eyləsə bir qul xəta,
Əfv xətasın edər axır ağa.
Dedi pişik: – Vermə mənim dalıma
Çünki bələdsən mənim əhvalıma
Çəngəlimə indi giriftarsən,
Ta ki edirsən belə rəftar sən.
Rəhm eləyib gər qoyam əldən sən!
Sən gedibən dalda söyərsən məni
Onda deyərlər hamı əhməq mənə,
Əql verib, fəhm verib həq mənə.

Düşmüş ələ sən kimi ziba şikar
Bəxt kömək oldu mənə aşikar.
Kəbk nədir, ya nədi ceyran əti?
Yoxdu siçan tək oların ləzzəti.
İndi səni eyləyərəm parə mən,
Dəfüvə saz eyləmişəm çarə mən
Ol siçana çəngini vurdu pişik,
Eylədi əndamını dəlmə-deşik.

## PİŞİYİN HİYLƏGƏRLİKLƏ TÖVBƏSİ

Çünki siçanı yedi ol hiyləgər,
Tövbə üçün məscidə etdi güzər.
Abid olub aldı ələ dəstəmaz,
Ta eləyə xaliqə razü niyaz.
Aldı ələ səbheyi-səddanəni,
Tutdu rəhi-abidi-fərzanəni,
Söylədi: – xaliqi-ərzü səma,
Çoxdu günahım, onu əfv et mana
Qan eləyib qapuva gəldim dəxil,
Əfv elə təqsirimi sən, ya cəlil!
Tövbələr olsun sənə, ey girdigar
Qılma məni ruzi-cəza şərmsar!
Bir siçan öldürmüşəm, ey padşah,
İstəyirəm tövbeyi-üzri-günah!
Feyzi əmimin mənə olsun kömək,
Paylayaram mən iki batman çörək.
Gərçi acımdan çıxa canım mənim,
Ərşə çıxa ahü fəğanım mənim,
Tövbələr olsun, yemərəm mən siçan!
Ömr elərəm xəstəciyər, bağrıqan.
Həm bu sifət tövbə edib ağladı,
Lalə kimi sinəsini dağladı.
Şüğlü onun naləvü fəryad idi,
Tülkü kimi hiylədə ustad idi.

## SİÇANLARIN İŞDƏN XƏBƏR TUTMALARI

Gördü bu keyfiyyəti ta bir siçan,
Oldu siçan fövcünə müjdərəsan.
Söylədi ki, müjdələr olsun sizə,
Bəxt olub, şükr ki, yavər bizə.
İndi pişik tazə müsəlman olub,
Eylədiyi zülmə peşiman olub.
Qüsl eləyib tazə, alıb dəstəmaz,
Abid olub xaliqə eylər niyaz.
Əhd eləyib tutmaya hərgiz siçan,
Gərçi acından verə dilxəstə can.
Məscidə, mehrabə gətirmiş pənah,
Eylədiyi zülmə olub üzrxah.
Gündüz oruc, gecə ibadət qılır,
Xaliqə sidq ilə itaət qılır.
Səbheyi-səddanə götürmüş ələ,
Məscidə övradı salıb qülqülə.
Rahi-ibadətdədi çapük qədəm,
Yetməz onun gərdinə şeyxül-hərəm.

## SİÇANLARIN PİŞİYƏ HƏDİYYƏ APARMALARI

Çünki siçanlar bu sözü etdi guş,
Getdi fərəhdən hamıdan əqlü huş.
Söylədilər bəs ona ənam edək,
Töhfeyi-layiq ona ikram edək.
Yeddi siçan eylədilər intixab,
Hər biri bir xosrovi-malikriqab.
Gər biri bir taifəyə kətxuda,
Hər biri bir kəşti üçün naxuda.
Hər birisi başə alıb bir təbəq,
Gün kimi hər yanə salırdı şəfəq.
Pişkəşü töhfeyi-əlvanlər,
Tazə fətir, yağlı olan nanlər.
Bərreyi-büryanü pənirü kəbab,
Firnivü dolmavü ciyər, həm şərab.

Misli-qulamani-dəri-padşah,
Mədhkünan, nüktəsəra, üzrxah,
Məscidə gəldi, hamısı çəkdi səf,
Gördü bunu abidi-sahibşərəf.
Eylədilər cümlə səlamü səna,
Söylədilər əcz ilə: – Ey parisa,
Gərçi bular türfə bəzaət deyil
Pişkəşi-layiqi-həzrət deyil,
Sən kərəmi-lütf ilə eylə qəbul.
Rədd eləmə bizləri xatir-məlul.
Çünki pişik gördü bu keyfiyyəti,
Nazü nəimi, o gözəl neməti,
Söylədi, key bəxti-qəra muşlər,
Ey qəmi-dünyayə olan tuşlər,
Guşeyi-taətdi məqamım mənim,
Günci-qənaətdi məqamım mənim;
Surəti-halımı o xaliq bilir,
Hər gecə göydən mənə ruzi gəlir.
Yoxdu sizin nanuvuza hacətim,
Həqq özü amadə edib qismətim.
Çox gecələr qalmış idim ac mən,
Sübhə kimi löqməyə möhtac mən.
Səbr elədim aclığa, axır xuda
Qıldı mənə rizqi-firavan əta.
Künci-ibadət nə gözəl cay imiş,
Tərki-cahan dövləti-dünya imiş.
Ol ki görə ruziyi-həq ləzzətin,
Neyləyir axır o siçanın ətin?!
Siz gedin, asudə olun sübhü şam,
Güşti-siçan gürbəyə olmuş həram.
Siz dəxi anbarləri sökməyin,
Salim olun, ruzi qəmin çəkməyin.
Mən tək edin taəti-həqqə qiyam,
Göndəri xaliq sizə göydən təam.
İndi gəlin, cümlə öpün əllərim,
Ey çəməni-nazdə sünbüllərim.

Çün bu nəsihətləri guş etdilər,
Xövfə düşüb cuşü xüruş etdilər.
Bid kimi cümləsi lərzan olub,
Hər biri bir surəti-bican olub,
Gəldilər öpsünlər onun dəstini,
Açdı siçanlara pişik şəstini.
Beş siçanı eylədi zalım şikar,
Zülmü cəfa oldu yenə aşikar.
Hər əlinə iki siçan mübtəla,
Bir siçanı ağzına aldı həla.
İki siçan qaçdı, qutardı başın,
Seyl kimi cari edib göz yaşın.

## PİŞİYİN HİYLƏSİNDƏN SİÇANLARIN XƏBƏR TUTMALARI

Muşlərə oldu əyan macəra,
Eylədilər təziyə bəzmin bina.
Beş siçanın ağladılar halına,
Növhə edib surəti-əhvalına.
Camə geyib cümləsi qətran kimi,
Zahir edib göz yaşı tufan kimi,
Hər biri torpaq sovurub başına,
Ağladı hər bir bacı qardaşına.
Açdı ağız oxşadı hər bir ana,
"Vay, qəribim!" deyib etdi nəva.
"Vay, verən canını çəngaldə!
Halı olan çox yaman əhvaldə".
"Kəndi deşən, vay, dilavər siçan!
Buğda yeyən, vay, hünərvər siçan!"
Söylədilər: – Cəm olun, ey muşlər,
Getdi dəxi taqət ilə huşlər!
Zülmün əyan etdi bu zalım bizə,
Halı yaman etdi bu zalım bizə.
Xitteyi-Kirmanə edək irtihal,
Sərvəri-muşanə edək ərzi-hal.

Söyləyək ey sərvəri-kərdunsərir,
Zülmün əyan etdi bizə bu şərir.
Bu pişiyin zülmünə yox tabımız,
Oldu tələf bir neçə əhbabımız.
Zülmü cəfasını əyan eyləyib,
Məscid ara bir neçə qan eyləyib.
Başına əmmamə qoyur, abidəm,
Tərki-cahan eyləmişəm, zahidəm.
Biz də inandıq onun ətvarına,
Tövbəsinə, virdinə, əzkarına;
Getdik ona töhfeyi-əlvan ilə,
Neməti-üzmayi-firavan ilə;
Məscid ara bir neçə qan eylədi,
Zülmünü zahir, nə nihan eylədi.
Səbheyi-səddanəsi bir dam imiş,
Məzhəbi yox, xarici-islam imiş.
Hiylə imiş cümlə namazı onun,
Xüdə imiş razü niyazı ovun.

## SİÇANLARIN PADŞAHA ŞİKAYƏTLƏRİ

Naləkünan düşdü yola muşlər,
Seyhəzənan cümlə o mədhuşlər.
Qəti-mənazil eləyib bafəğan,
Teyyi-mərahil eləyib xunçəkan.
Gördulər Kirmanda siçan şahını,
Tövf eləyib əcz ilə dərgahını,
Eylədilər ərz ki, ey padşah,
Şahi-cahan, sərvəri-aləmpənah!
Dad əlindən pişiyin, dad, dad,
Görməmişik biz bu sifət bədnihad!
Var bizim ölkədə bir bəd pişik,
Düşməz ələ bir belə mürtəd pişik.
Gahi yəhud, gah müsəlman olur,
Gah dönüb abidi-dövran olur.

Bundan əzəl ki, nə müsəlman idi,
Bir siçana qaneyi-dövran idi.
İndi bu ildən ki, müsəlman olub,
Rəğbəti çox, hirsi firavan olub.
İndi tutur bir nəfəsə beş siçan,
Görmüş idik biz belə möhnət haçan?
Qapuva gəldik bizə imdad elə,
Qəmli olan könlümüzü şad elə.
Eylə bizi çəngi-pişikdən xilas,
Çakəri-məhzik sənə, bir əbdi-xas.
Dərgəhi-iclalə gətirdik pənah,
Eylə əlac, ey şəhi-əncüm sipah!

## ŞAHIN CAVABI

Sərvəri-muşan eşidib bu sözü,
Tünd qızardı acığından gözü,
Söylədi: – Siz səbr eləyin bir zaman,
Mən edərəm cəm sipahi-giran;
Cəm edərəm ləşkəri-cərrarımı,
Təblü ələm, yavərü sərdarımı.
Bir neçə gün siz mənə mehman olun,
Töməçeşi-neməti-əlvan olun.
Aşü plovdan götürün kamlər,
Eyş qılın, nuş eləyin camlər;
Bərreyi-büryanü şərabü kəbab,
Nöqlü məzə, firniyü dolma, qutab.
Onlara lakin yemək idi həram,
Nalə edərlərdi fəğan sübhü şam.
Dərd ilə bir həftə fəğan etdilər,
Gözlərini əşk-fəşan etdilər.
Oxudular fatihə əmvat üçün,
Neçə qazan asdıla xeyrat üçün.
Qoydu olar xonçaya həlvaləri,
Paylamağa cövzü münəqqaləri.

Gəldilə qəbr üstünə əfğan ilə,
Başı açıq, dideyi-giryan ilə.
Ağladılar bir neçə gün dərd ilə,
Oxşadılar mürdələri fərd ilə.

## SİÇAN ŞAHININ QOŞUN TOPLAMASI

Şahi-siçan hökm elədi ləşkərə,
Zəhr ilə su verdi hamı xəncərə.
Verdi siçan şahı o gün buyruğu,
Nizələri guşü qılıc quyruğu.
Tupü tüfəng ilə o fövci-dilir
Cəng günü hər biri bir nərrəşir.
Cümlə pişik cənginə oldu rəvan,
Seyhəkünan, nərəzənan, xunçəkan.
Üç yüz otuz min, hamısı muş idi,
Şahi-siçan rindi-qədəhnuş idi.
Şəh dedi: – Ey tazə cavanlar, gərək
Ol pişiyə elçi əzəl göndərək.
Zirəkü kamil və süxəndan ola,
Elçi gərək əqəli-dövran ola.
Var idi bir aqilü zirək vəzir,
Fəhmü fərasətdə qəvi, binəzir.
Qoydu göz üstə əlini ol siçan,
Söylədi: – Ey sərvəri-mülki-cahan,
Əmrüvə bir bəndeyi-fərman mənəm,.
Vadiyi-eşqində verən can mənəm.
Dürci-dəhan aç, bizə göftar elə,
Ol ləbi-şirini şəkərbar elə.
Hər nə isə hökmün, əya sərfəraz,
Mən yetirim ol pişiyə biniyaz.
Şah vəzirə dedi: – Ey binəzir,
Səhl deyildir belə əmri-xətir.
Get pişiyə faş elə peyğamımı,
Eylə bəyan cümlə sərəncamımı.

Ləşkərimin kəsrətini ver xəbər,
Cümlə zirehpuşdur, əldə təbər.
Azim olub cəngə neçə pəhlivan,
Əldə hamı xəncərü gürzi-giran.
Yaxşısı oldur ki, gələ xidmətə,
Ta ki itaət edə bu dövlətə.
Yoxsa onu dəhrdə xar eylərəm,
Çeşminə dünyaları tar eylərəm.
Eyləməsə pəndimi hərgah qəbul,
Çəngimə gəlsin mənim ol bülfüzul.

## VƏZİRİN ELÇİLİYİ

Sözlərini şahın eşitcək vəzir
Düşdü yola getməyə ol binəzir,
Sibqət edib badi-səbayə dəvan,
Rahi-biyaban ilə oldu rəvan.
Teyyi-mərahil eləyib zud-zud,
Xitteyi-Kirmanə çü etdi vürud.
Gördü o təxt üstdə pişik şahını,
Barikəhü xeylini, xərkahını.
Qasidi-bidil şəhə etdi sücud,
Mədhu səna eylədi vəsfü dürud.
Ərz elədi, key şəhi-gərdunəsas,
Görməyəsən dəhrdə hərgiz həras.
Şahi-siçandan sənə bir qasidəm,
Sanma ki, mən şövkətüvə hasidəm.
Şah deyir ki, gələsən xidmətə,
Olmayasan yaği bizim dövlətə.
Şah olan kəsdə ədalət gərək,
Hali-rəiyyətdə rəfahət gərək.
Qurd qoyunla gərək etsin çəra,
Layiqi-şənin deyi bu macəra –
Kim, neçə bir muşi həlak etmisən,
Sinəmizi dərd ilə çak etmisən.

Eyləməsən gərçi itaət bizə,
Eyləyərik zəcrü siyasət sizə.
Razı deyilsən çü bu sövdayə sən,
Hazır ol indi dəxi dəvayə sən.
Ləşkəri-cərrar gəlir üstüvə,
Firqeyi-xunxar gəlir üstüvə.
Olma sözümdən, kərəm et, bidəmağ,
Yoxdu rəsulun işi "illəl bəlağ"*.

## PİŞİK ŞAHININ CAVABI

Güldü, dedi qasidə kim, ol filan
... yeyibən, batil edibdir güman!
Kimdi siçan şahı, o ağzı düşük?
Min siçana bəsdi bizim bir pişik.
Kimdi siçan kim, çıxa meydanıma,
Tab eləyə çəngəli-bürranıma?
Get degilən cənginə amadəyəm,
Sanmaya kim, acizü üftadəyəm.
Gər çıxa can peykəri-üryandan,
Çıxmaram əlbəttə bu Kirmandan.
Öpdü yeri, oldu o qasid rəvan,
Etdi pişik cəm sipahi-giran.

## PİŞİYİN QOŞUN TOPLAMASI

Yazdı Xorasanə ki, gəlsin sipah,
Ərbədəcu səfşikənü rəzmxah.
Gəldi qoşun cövşənü xiftan ilə,
Gürzi-giran, xəncəri-bürran ilə.
Düşdü yola ləşkəri-cərrarlər,
Səf dağıdan firqeyi-xunxarlər.
İki qoşun saz oluban çəkdi səf,
Zöhrə çalıb çəng, fələk vurdu dəf.

---
* "Leysə əl-ərrəsuli illəl bəlağ" - Allahın elçiləri yalnız təbliğat üçün gəlmişlər (*ayə*)

İki qoşun oldu o gün rubəru,
Xəsmfikən, qəlbşikən, kinəcu.
İki tərəfdən ucalıb banki-kus,
Hər iki şəh təxtinə etdi cülus.
Saldı siçan ərsəyə bir pəhlivan,
Oldu rəcəzxan o şirinzəban.
Söylədi kim, farisi-meydan mənəm,
Buğda yeyən, dağıdan ənban mənəm.
Neçə çuvalları mən etdim deşik,
Kimdi mənə tay ola itü pişik?
Kəştiyi-Nuh üzrə ki, divi-ləin
Çəkdi donuz dalına nagah əlin,
Asqırıban xuk, mən oldum əyan,
Kəştiyi-Nuhə elədim çox ziyan.
Kimdi bu meydanda mənə tay ola,
Hansı ləindir üzümə lay ola?
Fövci-pişikdə var idi bir cavan,
Adı onun Sarı Pişik, xoşzəban.
Gördü siçanın bu qədər lafını,
Gəldi dolandı onun ətrafını.
Qarğı atı, qamçısı bir tirə tar,
Taxta qılınc əldə, vəli abdar.
Söylədi: – Ey donquza övlad olan,
Hərzə danışma, bu ədadən utan!
Kəştiyi-Nuh üzrə ki oldun əyan,
Sən gəmini deşdin, edirdin ziyan,
Çəkdi əlin şirə çü Nuh ol zaman,
Asqırıban şir, mən oldum əyan.
Sən donuzun burnuna mənsubsən,
... yeyən oğlu, özü məyubsən!
Bil çataram şirə nəcabətdə mən,
Müştəhirəm zurü şücaətdə mən.
Həmleyi-əvvəldə siçanı o pak
Tiğ çalıb, eylədi xarü həlak.
Gəldi, mübariz tələb etdi yenə,
Söylədi ki, kimdi bərabər mənə?
Ta eləyim qanına qəltan onu,
Xakə qılım dəhrdə yeksan onu.

ORDULARIN QARŞILAŞMASI

Gördü onun zurin o qevmi-zəif,
Bildi yekayekdə deyillər hərif.
Eylədilər onlara birdən hücum,
Oldula məxlut cəhulü zəlum.
Qoydu qılıc bir-birinə ol sipah,
Gərd qopub, tirə olub ruyi-mah.
Baş tökülüb xakə çu bərgi-xəzan.
Hər tərəfə su kimi qanlar rəvan,
Bir-birinə atdıla tirü xədəng,
Qan tökülüb xakə, olub lalərəng.
Püştə əyan oldu o gün güştədən,
Bəxti-bədü taleyi-bərgəştədən.
Sındı, o gün qaçdı siçan ləşgəri,
Yarələnib əksəri durdu geri.
Çünki gecə oldu, hamı etdi xab,
Sübh tülu etdi yenə afitab.
İki qoşun oldu mühəyya yenə,
Şölə çəkib atəşi-dəva yenə.
Bir-birinə dəydi yəminü yəsar,
Meymənəvü meysərədə girü dar.
Ox atılıb hər tərəfə qıchaqıc,
Mərd ilə namərdə qılıcbaqılıc.
Vurdu pişik qəlbi-sipahə özün,
Ləşkəri-muşun o çıxartdı gözün.
Şahi-siçan eylədi fəryadlər,
Yəni, cavanlar, edin imdadlər!
Qeyrətü himmət günüdür muşlər!
Əhdü mürüvvət günüdür muşlər!
Bu pişiyin atını bir neyləyin,
Xakə yıxın, ömrünü teyy eyləyin.
Çəkdi qılıc qeyrət edib bir siçan,
Yetdi pişik şahına ol pəhlivan.
Çaldı qılıc, şahın atın peylədi,
Yağlı siçan türfə hünər eylədi.
Şəh yıxılıb, qaşdı pişiklər hamı,
Oldu siçanların o gün bayramı.

Bağladılar qollarını təng onun,
Eylədilər qətlinə ahəng onun.
Ərşə çıxıb sövti-dəfü kərrənay,
Etdilər urray, haray, ay haray!
Oldu pişik şahı bizə dəstgir,
Şiri-jəyanı elədik biz əsir.

## SİÇAN ŞAHININ PİŞİYİ EDAM ETDİRMƏSİ

Təxtə çıxıb qırmızıdon padşah,
Günbədi-əflakə ucaltdı külah.
Gəldi qabağə qolu bağlı pişik,
Könlü sınıq, sinəsi dağlı pişik.
Etdi ona şah itabü xitab,
Söylədi key müfsidü aləmxərab!
Neyləmiş idi sənə ol muşlər,
Bəxti qəra fövci-siyəhpuşlər?
Onları, zalım, elədin sən həlak,
Zərrə qədər səndə məgər yoxdu bak?!
Bilməz idin zalım olan xar olur,
Keyfəri-əmalə giriftar olur!
Bəs deyil idi sitəmi-masələf,
Həm bu qədər ləşkəri etdin tələf?!
Hiylə üçün gah qılırsan namaz,
Gah alırsan əlüvə dəstəmaz.
Zahid olub səbhə alırsan ələ,
Ta qurasan muşlər üçün tələ.
Gah qoyursan başuva əfsəri.
Gah çəkirsən bizə bu ləşkəri.
Bais olursan bu qədər qanə sən,
Asi olursan niyə sübhanə sən?
Çəkməsəm aləmdə səni darə mən,
Asi olum qadiri-qəhharə mən!
Eyləyim ol gunə səyasət sana,
Ta ki siçanlar deyələr, “mərhəba!”
Hökm elədi, dar ağacı qurdular,
Boynunu zalım pişiyin burdular.

Saldı boğazına siçanlar tənab,
Vəhşət edib, qıldı pişik iztirab.
Oldu o əsnadə bir atlı əyan,
Qıldı təvəqqe ki, əya hökmran!
Eyləmişəm dəhrdə xidmət sənə,
Gəl bunu öldürmə, bağışla mənə.
Bir də əgər etsə pişik bir günah.
Öldür onu, ey şəhi-aləmpənah!
Şah dedi: – Zalıma rəhm eyləmək.
Öylədi ki, zülm işə etmək kömək.
Qurda tərəhhüm əkər etsə çoban,
Zülm qoyunlarə edib bigüman.
Gər pişiyə rəhm eləsə bir nəfər,
Zülm siçanlara edib müxtəsər.
Çünki Hüreyrə pişiyin adıdır,
Zişt olan yad onun yadıdır.
Kim ki, Hüreyrə ola kəzzab olur,
Gərçi özü zübdeyi-əshab olur.
“Qibbənü hübbən” sözünü get oxu,
Rəddinədir onda işarə çoxu.
Anla hədisin dəxi mənasını,
Həzrəti-peyğəmbərin imasını.
Yəni ki çox gəlmə mənim yanıma
Vermə xələl məclisi-əvanıma.
Şahi-siçan etmədi ondan qəbul,
Getdi o kəs xəstəvü zarü məlul.
Söylədi cəlladə ki, çək darə sən,
Qalma təfəkkürdə, dil avarə sən!
Dardə əndamını siz oxlayın,
Bir keçən əhvalüvüzi yoxlayın.
Başüvüzə nə gətirib bu pişik,
Çəkdi siçan tutmağa daim keşik.
Heç kəsin olmadı bir cürəti,
Ta pişiyə eyləyə bu zilləti.

## SİÇAN PADŞAHININ PİŞİYİN QƏTLİNƏ QƏSDİ VƏ PİŞİYİN DARDAN QURTARMASI

Çəkdi qılıc ta ki özü padşa,
Ta eləyə başını təndən cüda,
Gördü pişik muşlərin şahını,
Bildi onun kineyi-dilxahını.
Şir kimi çökdü dizi üstünə,
Verdi təkan şəst ilə öz dəstinə.
Qırdı ipi, sıçradı əjdər kimi,
Həmlə edib muşə qəzənfər kimi.
Çox siçanı eylədi zalım həlak,
Oldu siçanlar hamısı sinəçak.
Həmlə edib Rüstəmi-dəstan kimi,
Qeyzə gəlib Samü Nəriman kimi.
Gördü siçan şahı ki dolmuş əsas,
Canı həlak olmağın etdi qiyas.
Gürzü giran əldə yetişdi pişik,
Girməyə tapmadı siçan bir deşik.
Gürzü çalıb, əzdi onun başını,
Təpdi yerə qövmünü, qardaşını.
Qaçdı siçanlar, yerə oldu nihan,
Qaldı yer üstündə pişik hökmran.
Kəsdi, siçanlar yolunu bağladı,
"Mo-mo" edib bığlarını yağladı.
Bais odur ki, pişik oldu əziz,
Xanım ona hörmət edər, həm kəniz.
Nə əkini vardı, nə dükkanı var,
Hər gecə-gün hazır olan nanı var
Aşü plov, dolma yeyər hər gecə,
Sərçə tutar, hindən aparar cücə.
Sən də pişik olsa idin, Seyyida,
Çəkməz idin ruzi üçün bir bəla.

## HEKAYƏT

Nuşirəvan əsrində bir nəfər zalım bir zəifə bir qapaz vurmuşdu. Nuşirəvan qapaz vuran şəxsin qətlinə hökm elədi. Həlak elədilər. Xəvaslardan birisi dedi ki, təəccüb elədim padşahın ədalətindən ki, bu az olan təqsirdən ötrü bir adamı həlak elədi.

Nuşirəvan buyurdu ki, qələt elədin. Mən adamı öldürməmişəm, bəlkə bir it və qurdu öldürdüm, ilanı, əqrəbi həlak elədim.

### HEKAYƏT

İskəndəri-Rumi öz sirlərindən bir sirr bir şəxsə demişdi. Tapşırmışdı ki, heç bir kəsə deməsin. Qəzadan ittifaq, ol sirrin faş olmağı İskəndərə məlum oldu. Həkim Bəlinasdan sual etdi ki, əgər bir kimsənə padşahın sirrini faş eləyə – onun cəzası nədir?

Həkim dedi ki, ey padşah, əgər sahibi-sirr istəsə ki, sirri faş olmasın, gərək ol sirri heç bir kəsə deməsin. Bir sirri ki, öz sahibi saxlaya bilməyib, bir sair şəxsə deyibdir və ondan haman sirr çıxıbdır, məzurdur.

İskəndərə həkimin hikmətamiz olan göftarı pəsəndidə gəldi.

### NUŞİRƏVAN VƏ QARI HEKAYƏSİ

Ol vaxt ki, eyvani-Nuşirəvan tamam oldu, hükəmalara buyurdu ki, mənim bu şahanə olan imarətimə diqqət gözüylə baxın. Əgər bir yerində bir eybi və nöqsanı var isə, mənə xəbər verin. Hükəmalar baxdılar. Ərz elədilər ki, Taqi-Kəsranın heç bir nöqsanı yoxdur.

Ancaq bu ali olan imarətin bir küncündə bir ev var ki, ol evdən çıxan tüstü bu ziba olan imarətin divarın qaraldır. Əgər ol evi oradan dağıtsalar, çox yaxşı olar.

Nuşirəvan dedi ki, ol ev bir qarı övrətindir. Ol vaxt ki, mən bu imarətin binasın qoydum, memarlar dedilər ki, bu qarının evi bizim evimizə xələl yetirir. Gərək bu ev buradan dağıla, tainki təmiratımıza nöqsan olmaya.

Mən bu qarının yanına adam göndərdim ki, evin satsın, ona ziyadə pul verərəm, ya gəlsin evindən əla evlər verim. Qarı mənə xəbər göndərdi ki, çünki mən bu evdə doğub törəmişəm və bu evə öyrəşmişəm, ünsiyyət tutmuşam, hamı aləmi padşahın mülkü görüb mən şad oluram. Amma padşahın gözü yoxdur ki, bu mühəqqər olan evi mənim [üçün çox görür].

Bu sözdən çox geri getdim. Ta ol vaxt bu eyvan tamam oldu, hər gün onun bacasından tüstü qalxdı, bu divarları qaraladı. Ona peyğam göndərdim ki, hər gün bu tüstünü nə üçün eləyirsən? Cavab verdi ki, özüm üçün yeməyə şey bişirirəm.

Heç dinmədim. Gecə bir məcməyi plov mürği-büryan ilə onun üçün göndərdim. Dedim ki, ey ana, hər gecə bir xonça qiza, növbənöv xüruşlarla səninçün göndərərəm, sən dəxi bu dar olan evində od yandırma ki, onun dudindən eyvanın divarı qaralır.

Cavab göndərdi ki, aləmdə bu qədər aclar və fəqirlər ola-ola ki, ürəkləri büryan və gözləri giryan olalar, mən insafmıdır ki, hər gecə mürği-büryan və neməti-əlvan yeyim?! Allah-taaladan qorxuram. Yetmiş ildir ki, mən nani-cəvinə və kəşkineyi-həlal yeyirəm, indi mürği-suzineyi-həram yeyim?! Mənim bu evimi, bir qərar qoy ki, sənin eyvanının zinətidir. Çün sənin amillərin görsələr ki, sən mənim əlimdən bu mühəqqər olan evi aldın, təsərrüf əlini rəiyyətin malına uzadarlar və bir də bu ki, sənin eyvanın çox qalmaz, axır fəna olar. Amma mənim evimin hekayəti müddətlər səfəhati-övraqi-ruzgardə mərqum və məstur olur.

Bunu ki, eşitdim, onun həmsayəliyinə razı oldum.

Və belə rəvayət edirlər ki, o qarının bir arıq inəyi var idi. Hər sabah evindən səhraya çıxarırdı, axşamlar evinə gətirirdi. Sabah-axşam o inək padşahın evinin qabağında döşənmiş olan mərmər daşları peyinli ayaqları ilə basıb gedib gəlirdi. Padşahın nökərlərindən biri dedi ki, ey qoca övrət, bu hərəkəti eləmə ki, padşahın namusunu şikəst qılırsan və əsasi-heybəti-səltənəti xarab eləyirsən.

Qarı cavab verdi ki, padşahın namusu zülmdən şikəst olar, nə ədldən və soltanın binayi-əsasi-heybəti-cəhldən xarab olar, nə əqldən. Mən bu əməli ki, eləyirəm – padşahın niknamlığından ötrü eləyirəm və onun aqibət nikfərcamlığın istəyirəm.

Əlhəq ki, ol pirəzən yaxşı deyibdir. Min ildən ziyadədir ki, keçibdir, hələ də "hekayəti-xaneyi-pirəzən və eyvani-Nuşirəvan" kitablarda məsturdur, dillərdə məzkur.

## NUŞİRƏVAN VƏ İKİ BAYQUŞ

Nuşirəvan əcəm padşahlarındandır və Kəsra dəxi onun bir adıdır. Belə rəvayət edirlər ki, Nuşirəvan əvaili-səltənətində çox zalım idi. Zülm əlini xəlayiqə açmışdı. Bir gün şikara çıxmışdı. Gördü ki, bir xərabənin divarında iki bayquş bir-birinə səda edirlər. Nuşirəvan öz

vəziri həkim Büzürgmehrdən soruşdu ki, ey həkim, görəsən bu bayquşlar nə danışırlar?

Həkimi-danişmənd forsəti-kəlamı qənimət bilib, lətifə üzündən ərz elədi ki, ey padşahi-aləm, bu bayquş o bayquşa deyir ki, qızını mənim oğluma ver.

O deyir ki, əgər mənim qızımın sədaqından ötrü yüz xərabə versən müzayiqə yoxdur.

O bayquş bunun cavabında deyir ki, qorxma, əgər Nuşirəvan bir neçə il də padşah olsa, mən sənə yüz min xərabə verrəm.

Gər məlik in əst dər in ruzigar
Mən beto viranə dəhəm səd hezar*

Nuşirəvan həkimin lətifəsindən sonra mütənəbbeh olub, qanuni-ədalətə mübaşir oldu.

## SOLTAN MAHMUDUN BAĞI

Soltan Mahmud Qəznəvi bir qitə bağ saldırmışdı ki, rövzeyi-rizvan kimi dilgüşa, firdövsi-bərin kim behcətəfza idi. Bir gün öz atası Nasirəddini-Səbüktəkini o bağa dəvət elədi. Ənva və əqsam əkl və şürbdən sonra atasından soruşdu ki, ey pədəri-mehriban, səfheyi-aləmdə bundan dilgüşa bağ olurmu?

Nasirəddövlə dedi ki, ey oğul, bu bir bağdır nəhayətdə ziba və qayətdə dilgüşa. Amma ərkani-dövlət və mülazimani-həzrətdən hər bir kəs xahiş qılsa, bu bağın mislin tərtib edə bilər. Padşahlar gərək bir elə bağ salsınlar ki, sairlər onun mislin əmələ gətirməkdən aciz qalsınlar və onun meyvələri heç bostanda əmələ gəlməsin.

Soltan ərz elədi ki, o hansı bağdır?

Cavab verdi ki, o bağ baği-tərbiyət və nihali-mədələtdir ki, hükəma və şüəralardan abad ola. Ta o bağdan bir səmərə hasil ola ki, sərd və gərm, zimistan və tabistandan məsnun və məhfuz ola.

Bu kəlam Soltan Mahmuda pəsəndidə gəldi.

---

* Zəmanənin hakimi budursa, mən sənə yüz min viranə verərəm

## HEKAYƏT

Bir şəxs Nuşirəvani-adilə müjdə gətirdi ki, Allah-taala sənin filan düşmənüvü götürdü (yəni düşmənin öldü). Nuşirəvan dedi ki, heç eşitdin ki, məni qoyacaq?

Bu hekayətin faydası budur ki, düşmənin mərginə şad olma, çünki sənin də dünyada həyatın həmişəlik deyildir.

## HEKAYƏT

*Nuşirəvan və şikar*

Şeyx Sədi "Gülüstan" kitabında nağıl edib ki, Nuşirəvani-adil üçün bir şikargahda bir seyd kabab edirlər. Kababa səpməyə duz yox idi. Bir qulam kəndə yüyürtdülər ki, duz gətirsin. Nuşirəvan qula dedi ki, duzu qiymət ilə al ki, ta töycü olmasın və kənd dağılmasın.

Dedilər ki, bu az duzdan nə xələl olacaq ki, kənd dağıla?

Nuşirəvan dedi ki, zülmün binası əvvəldən az olubdur. Hər kəs ki, gəldi – bir qədər artırdı, ta bu mərtəbəyə çatdı.

## NUŞİRƏVAN VƏ QONAQPƏRVƏR KİŞİ HEKAYƏSİ

Belə nağıl edirlər ki, Nuşirəvan əvaili-səltənətində eyşü işrətə məşğul olub, rəiyyətpərvərlik zövqündən qafil idi. Onun həmsayəliyində bir şəxs var idi. Kərəmü səxavətdə məşhur idi və mehmana müraat etməkdə, ehsan-əltafda məzkur idi. Nuşirəvan onu imtahan etmək üçün bəzirgan libası geyib onun evinə getdi. Ev sahibi onu tanımadı; amma necə ki onun öz adəti idi, onu mehman edib, ziyafəti-təmam və mahəzəri-malakəlam tərtib etdi. Bir otaqda nişimən etmişdilər ki, onun ğürfələri o kişinin öz bağına açılmışdı. Lətif olan meyvələr rəsidə olmuşdu. Nuşirəvan məclis tamam olandan sonra ki, durub gedəcəkdi, dedi ki, ey xaceyi-mehman-nəvaz, mən bir sövdagərəm, sənin səxavət və cavanmərdligüvün avazəsin məsmu etmişdim, ondan ötrü sənə zəhmət verdim. Yüz guş etdiyimdən əlasanmış. İndi xudahafiz və xaneyi-ehsanın abad, gedirəm. Buyur ki, sabah səninçün karvansaradan nə irsal edim?

Dedi: – Ey əziz olan mehman, dövlətindən cəmi əsbabi-mayəhtac mühəyyadır. Əgər sənin üçün məqdur olsa, mənə bir qədər təzə əngur göndərəsən.

Nuşirəvan dedi ki, sənin bağında üzüm çoxdur, nə səbəbə yemirsən?

Dedi ki, ey bəzirgan, bizim padşahımız bir zalım və qafil olan padşahdır, rəiyyət qəminə qalmaz. Xalqın əngur bağları yetişibdir, hələ bir kəs yəqin eləməyibdir ki, padşahın "üşr malın" aparsınlar. Hərçənd ki, sairlər mülahizə etməyib əngur tənavül edirlər, amma mən məhruməm. Ol cəhətdən ki, padşahın haqqı bu bağda var, hənuz məndən "üşr malın" almayıblar. Əgər bəndə verməmiş əngur yesəm, padşaha xəyanət eləmiş ollam. Mənim məzhəbimdə xəyanət və bidəyanətlik haramdır. Hələ ki taklərdə qora əmələ gəlir, bağın qapısın bağlayıb möhr elərəm, qoymaram ki, heç afəridə bağa daxil olsun ki, bir gilə üzüm yesin. Ta vəqta ki, padşahın əmələcatı öz üşr məxsusların aparırlar, ol vaxt mən əlimi üzümə uzadıram.

Nuşirəvan bu hekayəni guş etdi, hay-hay ilə ağladı. Dedi ki, ol padşahi-zalım və qafil mənəm. Sənin dəyanətin məni xabi-qəflətdən bidar etdi.

## NUŞİRƏVANIN VƏZİRLƏRİ HEKAYƏSİ

Güruhi-hükəma bir məsləhət xüsusunda Kəsranın məclisində göftgu edirlərdi. Və hər biri bir tədbir deyirdi. Büzürgmehr xamuş idi. Ondan sual elədilər ki, sən niyə xamuşsan?

Dedi ki, həkimlər, təbiblər misalındadır; təbib dərman verməz məgər naxoşa. Çün görürəm ki, hamı rəyi-siyasət ilə göftgu edirlər, mənim üçün ziyadə göftgu etmək füzulluqdur.

## NUŞİRƏVANIN SUALI

Bir dəfə məclisdə Nuşirəvan Büzürgmehrdən sual elədi ki, ey həkimi-rövşənrəy, dünyada nə şey yaxşıdır?

Həkim dedi ki, ölmək.

Yenə sual elədi ki, dəxi nə yaxşıdır?

Dedi ki, övrət.

Üçüncü dəfə sual elədi ki, dəxi nə yaxşıdır?

Dedi ki, ehtiyac.

Nuşirəvan qəzəbnak oldu. Dedi ki, nə səbəbə, həkimi-danişmənd?

Dedi ki, ey padşah, əgər mövt olmasaydı, validi-macidin vəfat etməz idi, sənin kimi ədalətli olan padşah sahibi-ixtiyar olmazdı. Və əgər övrət olmasaydı, sənin kimi soltani-sahibvüqar və mədələtşüar dünyaya gəlməzdi. Və əgər ehtiyac olmasaydı, bizim kimi həkimlər sənə xidmət etməzlərdi. Bəs mövt, övrət, ehtiyac – hər üçü neməti-üzmadır.

Nuşirəvana həkimin bəyanatı nəhayət xoş gəldi və ənam əta qıldı.

## HÖRMÜZ İBN NUŞİRƏVAN

Hörmüz tacidara dedilər ki, atanın vəzirlərindən nə xəta gördün ki, cümləsin zindana saldın?

Hörmüz buyurdu ki, bir xəta görmədim. Ancaq gördüm ki, mənim xövf və hərasım onlara müstövli olubdur və mənim sözümə bilmərrə etimad və etibarları yoxdur. Qorxdum ki, öz canlarının xövfündən mənim həlakıma qəsd edələr. Bəs həkimlərin qövlü ilə rəftar elədim ki, buyurublar: “Qorx o kimsənədən ki, həmişə səndən qorxur; əgərçi davada yüz ondan artıq olsan da. İlan çobanın ayağından o səbəb çalar ki, qorxur ki, çoban onun başını daş ilə əzə”. Görməmisən ki, ol vaxt ki, pişik pələngin əlində aciz qalır, öz qorxusundan pələngin gözlərin çəngalı ilə çıxardır? Və illa pələngin zoruna pişiyin zoru çatmaz.

## İSKƏNDƏR VƏ VƏZİRİ

Zülqərneyn bir gün sübhdən axşama kimi məclisi hökumətdə əyləşdi, heç bir kimsə onun hüzuruna rəfi-hacət üçün gəlmədi. Öz nayibinə dedi ki, mənim bu günüm ömrdən hesab deyil.

Nayib ərz elədi ki, ey padşahi-aləmpənah, bir gün ki söhbətdə fərağət keçə, səlamət və kəramətdə axşama gələ, əmrlər öz kamınca, xatirin fərağət, xəzan məmur və sipah məsur, – əgər padşah bu günü ömrdən hesab etməyə, bəs hansı gün ömrdən hesab olur?!

Zülqərneyn buyurdu ki, bir gün ki padşahdan bir istirahət bir məzluma yetməyə və bir məhrumun hacəti rəva olmaya – o günü necə ömrdən hesab etmək olar?!

## ÇİN PADŞAHININ İSKƏNDƏRDƏN SUALI

Çin padşahı İskəndərdən sual elədi ki, padşahlığın ləzzətin nə şeydə gördün?

İskəndər cavab verdi ki, üç şeydə: birinci – düşmənlərə qalib olmaqda; ikinci – dostları sərbülənd etməkdə; üçüncü – möhtacların hacətlərin rəva qılmaqda. Bunlardan qeyri ləzzətin etibarı yoxdur.

## PADŞAHIN HƏKİMDƏN SUALI

Padşahlardan birisi bir həkimdən sual elədi ki, tədbir əfzəldir, ya şücaət?

Həkim cavab verdi ki, şücaət şəmşir məsabəsindədir, tədbir əl misalındadır ki, əl qılınca iş buyurur və qılıncsız əl ilə iş görmək olur. Amma əl olmasa qılınc biməsrəfdir.

## NUŞİRƏVAN VƏ BÜZÜRGMEHR

Nuşirəvan Büzürgmehrdən soruşdu ki, şücaət nə şeydir?

Həkim dedi ki, şücaət qəlbin qüvvətidir.

Nuşirəvan dedi ki, nə üçün demədin ki, əlin qüvvətidir?

Həkim dedi ki, əgər qəlbdə qüvvət olmasa, əldə qüvvət qalmaz.

## QAZİ HEKAYƏSİ

Bir axmaq qazinin yanına gəlib sual elədi ki, oruc tutan şəxsə nə vaxt oruc açmaq gərək?

Qazi cavab verdi ki, nə vaxt ki, gün batar.

Dedi ki, bəlkə gün gecə yarısına kimi batmadı?

Bu hekayətdən sailin həmaqəti sabitdir.

## DƏRVİŞ VƏ QƏNİ HEKAYƏSİ

Bir dərviş bir dövlətlinin yanına gəlib dedi ki, hər ikimizin atamız Adəm və anamız Həvvadır. Bəs mən sənə qardaşam. Sənin bu qədər malın var, istəyirəm ki, mənim qardaşlıq payımı verəsən.

Xacə quluna buyurdu ki, gətir bu qardaşıma bir füls (yəni qara pul) ver.

Dərviş dedi ki, ey xacə, niyə qismətdə insaf eləmədin?

Dedi: – Xamuş ol ki, əgər sair qardaşlarımız bizim təqsimimizdən xəbərdar olub gəlsələr, sənə bir füls də vüsul olmaz.

## OĞRU HEKAYƏSİ

Bir oğru bir şəxsin libasını oğurladı. Aparıb bazarda bir dəllala verdi ki, satsın. İttifaqən o libası ondan dəxi oğurladılar. Oğru əliboş yoldaşlarının yanına gəldi.

Ondan soruşdular ki, libası neçəyə satdın?

Dedi ki, o qiymətə ki, almışdım. Yəni məndən dəxi oğurladılar.

## ÇƏPGÖZ HEKAYƏSİ

Bir əhvəldən (yəni çəp) bir nəfər şəxs soruşdu ki, bu söz doğrudur ki, deyirlər çəplər biri iki görür?

Dedi ki, bu söz məhz yalandır. Əgər bu söz doğru olsaydı, siz ki, iki nəfərsiz, gərək mən sizi dörd görəydim.

Bavücudi ki, sual verən bir nəfər idi.

## KORUN HEKAYƏSİ

Bir şəxs bir kora dedi ki, mən belə eşitmişəm ki, Allah-taala hər kəsi kor eləsə, əvəzində ona bir yaxşı şey əta elər. Aya, sənə nə mərhəmət edibdir?

Kor cavab verdi ki, Allah-taala mənə bunu əta edibdir: sənin kimi qəlbi qəsavətli, dilşikən və dilazar olan şəxsin nəhs üzünü görmürəm.

Sail sualından şərmsar oldu.

## KORUN HEKAYƏSİ

Bir nəfər əma şəbi-yeldadə səbusun abi-zülal ilə malamal edib, əlinə bir ədəd çıraq götürüb gedirdi. Bir şəxs ona tənə dilin açıb dedi ki, ey kuri-madər-zad, səninçün ki, leylü nəhar bərabərdir, bu çırağ nə lazımdır?

Dedi: – Bu çırağı əlimə özümdən ötrü götürməmişəm. Bəlkə bu mənaya rövşən etmişəm ki, sənin kimi-batini kor olanlar mənə toxunmasın və sovçam sınmasın.

## MÜƏZZİN HEKAYƏSİ

Bir nəfər bədsövt olan müəzzin bir çöldə əzan verirdi və hər yana yüyürüb öz sövtünə qulaq asırdı. Ondan bu əcibə olan haləti görüb, soruşdular: – Bu nə halətdir?

Dedi ki, xalq mənə deyir ki, sənin sövtün uzaqdan çox yaxşı gəlir. İndi bu çöldə əzan verib, hər tərəfə yüyürüb qulaq asıram ki, görüm xalq danışan sözlər doğrudur, yainki yalandır?

## YALANÇI PEYĞƏMBƏR

Bir şəxs mədyun olub xəbti-dimağ eləmişdi. Buna görə peyğəmbərlik iddəası elədi. Onu padşah ehzar edib ki, belə məsmu oldu ki, həqq-təala sənə nübüvvət əta qılıbdır.

Dedi: – Bəli.

Padşah dedi ki, peyğəmbərlər qeybdən xəbər verirlərdi, sən necəsən?

Dedi ki, mən də qeybdən xəbər bilirəm.

Padşah dedi ki, de görüm, bu halda mənim qəlbimdən nə xütur eləyir?

Dedi ki, ey padşah, bu halda sən fikr edirsən ki, guya mən yalançı peyğəmbərəm. Səhvinə istiğfar elə.

Padşah xəndan oldu və onun təqsirindən keçib, ənam və xələt verdi.

## DƏLLƏK VƏ XACƏ

Bir dəllək bir xacənin başın təraş qılırdı. Dəlləyin əli titrəyib bir cüzi onun başından məcruh elədi. Xacə fəryad elədi: – Ey usta, başımı kəsdin!

Dəllək dedi ki, sakit ol, kəsik başdan səs çıxmaz.

## PADŞAH VƏ ZƏRİF

Bir zərifdən bir günah sadir olmuşdu. Padşah hökm elədi ki, onun burnunu deşib, bir ip taxıb küçə və bazarı dolandırsınlar. Zərif ərz elədi ki, ey padşah, mənim burnumun iki deşiyi var, üçüncü deşik mənə lazım deyil. Padşah güldü və onun təqsirindən keçdi.

## ƏRƏB VƏ NAQƏ

Bir ərabinin on dəvəsi var idi. Birinə süvar olub doqquzun qabağına salıb gedirdi. Dəvələrin saydı gördü ki, doqquzdur. Amma süvar olduğun saymadı. Dedi ki, bəs dəvənin birin itirmişəm. Aşağı düşüb hər tərəfi axtardı. Bir əsər görməyib müraciət qıldı gördü ki,

dəvəsi ondur. Yenə süvar oldu. Bir qədər yol gedəndən sonra dəvələrin saydı, yenə gördü ki, doqquzdur. Yenə aşağı düşüb hər tərəfi axtardı. Bir əsər mövcud olmadı. Məavidət qıldı, gördü ki, dəvə yenə ondur. Dedi ki, bəs mən süvar olanda dəvənin biri nabud olur; yaxşı budur ki, piyada yol gedim, ta ki dəvə itməsin.

## KAR VƏ MƏRİZ

Bir nəfər kar olan şəxs bir mərizin əyadətinə gəldi. Soruşdu: – Necəsən?

Məriz dedi ki, ölürəm.

Kar elə bildi ki, deyir, yaxşıyam. Dedi ki, əlhəmdüllah.

Və yenə soruşdu ki, qiza nə yeyirsən?

Dedi ki, zəhrimar.

Kar dedi ki, nuşi-can olsun!

Soruşdu: – Təbibin kimdir?

Dedi ki, əzrail.

Elə bildi ki, deyir filan təbib. Dedi ki, qədəmi düşərli olsun!

Bu məsəl ondan qaldı ki, "karın könlündəki".

## DƏRVİŞ VƏ ZƏRİF

Bir zərif bir dərvişin evinə qonaq gəldi. O dərviş damının üstünə çox nazik ağaclar döşəmişdi. Hər saatda ağaclar üstə olan torpağın gücündən səs eləyirdi. Zərif dedi ki, ey dərviş, məni bir özgə evə apar. Qorxuram ki, bu ev uça.

Dərviş dedi ki, qorxma, bu səda ki dirəklərdən gəlir "külli şeyün səbbəhə bihəmdihi"* mövcibi ilə Allah-taalaya zikr eləyirlər.

Zərif dedi ki, qorxuram ki, zikrdən sonra səcdə eləyələr.

## İFLASA UĞRAMIŞ TACİR

Bir nəfər tacir bildir bərşikəst olmuşdu, biri bu il. Bildir şikəst olan tacir bu il şikəst olana rast gəlib soruşdu ki, keyfin necədir?

Dedi ki, bildir səninki kimi.

Dedi ki, məgər bildir mənimki necə idi?

Dedi: – Bu il mənim keyfim kimi.

---

* Hər şey ona [Allaha] zikr edir

## İSKƏNDƏR VƏ DƏLİ

İskəndər Zülqərneyn bir divanəyə dedi ki, məndən bir şey istə. Divanə dedi ki, səndən təvəqqə eləyirəm ki, bu milçəklərə hökm elə ki, məndən uzaq olsunlar. Dəxi mənə azar və əziyyət verməsinlər.

Soltan dedi ki, ey divanə, məndən bir şey təmənna qıl ki, mənim təhti-fərmanımda olsun.

Divanə dedi ki, zəif olan məxluqa ki, sənin təsəllütün yoxdur, bəs səndə nə var ki, mən səndən xahiş qılam?!

## PADŞAH VƏ VƏZİR

Bir dəfə bir padşah vəzirlərindən birinə dedi ki, ey vəzir, görəsən dünyada bir elə yer olurmu ki, orada milçək olmaya?

Vəzir dedi ki, ey padşah, adam olan yerdə milçək olur.

Bir gün padşah haman vəzirlə bir şəhərdən bəid olan səhraya şikara getmişdi. Padşah vəzirlə bir guşeyi-pünhanə çəkilib, vəzirə dedi ki, ey vəzir, xilafi-təqrir, bu sərzəmində ki, bir adam yoxdur, bəs bu milçəklər nədir?

Vəziri-dilir dedi ki, ey sahibsərir, mən demişəm ki, adam olan yerdə milçək olur. Əgər sən özüvü adam hesab eləmirsən, mən ki əlhəmdüllah, özümü adam hesab eləyirəm.

## PADŞAH VƏ ŞAİR

Bir gün bir padşah bir şairdən rəncidə olub, qətlinə hökm elədi. Buyurdu ki, cəllad gəlsin!

Şair padşahın mülazimlərinə dedi ki, siz hələ cəllad gəlincə, mənim başıma qapaz və üzümə sillə vurun.

Padşaha bu söz xoş gəlib, onun qətlindən keçdi.

## TÜLKÜ VƏ ÇAQQAL

Rubah bir şəğal ilə bir biyabanda gedirdilər Qəzadan ittifaq bunların yolları qurdların qəbristanına düşdü.

Rubah şəğalə dedi ki, əl götür, ğafirül-xətiat dərgahına ki, bu mərhumlar üçün bir xeyir-dua eləyib, tələbi-məğfirət qılaq.

Şəğal rubaha dedi ki, bu dirrəndələr ilə sənin nə aşinalığın var imiş?

Rubah dedi ki, sənin səmi-humayunuva vasil olmayıbdır ki, bunlar bizim abavü əcdadımızın rəiyyət və zəhmətkeşləri olublar?

Şəğal dedi ki, haşa və kəlla, mən bu mənaya vaqif deyiləm. Amma ziyadə arzu edərəm ki, kaş bu sibailərin biri zində və hazır olaydı, sən bu məquləni onun hüzurunda təqrir edəydin.

## AVROPALI VƏ TAMAHKAR

Firəngistanın əyanlarından bir mütəməvvil olan şəxs bir qitə dilgüşa olan bağ saldırmışdı. Haman busitansəranın tağında yazdırmışdı ki, bu bağ mutəəlliqdir ol mərdi-mücərrədə ki, dünyada heç bir şeyə tamah və ehtiyacı olmaya.

Bir gün bir tamahkar olan dövlətli bağ sahibinin hüzuruna hazır olub, nəxli-təmənnadan bu günə səməri-murad xahiş qıldı ki, bəndənin cəmi dünyadan bir zada tamahım və ehtiyacım yoxdur. Bəs bu bağı mənə mərhəmət qıl.

Sahibi-bağ dedi ki, əgər səndə tamah və ehtiyac olmasaydı, bağı məndən xahiş qılmazdın. Hüzurundan ixrac elədi.

## İSKƏNDƏR İBN FİLİPPİN HEKAYƏSİ

Bir gün İskəndər ibn Filipp ki, padşahi-Rum idi, ətrafında məcmə olan əşxasa dedi ki, mən ömrümdə heç bir saili feyzi-nəvalımdan məhrum etməmişəm. Hər nə, ki məndən xahiş qılıblar-əta etmişəm.

Bu göftarı guş edən bir şəxs ərz elədi ki, ey padşah, mənim üç dirhəm borcum var. İltimas edirəm ki, onu əda buyurasan.

İskəndər dedi ki, padşahlardan bu gunə həqir şey təvəqqe etmək biədəblikdir.

Ol şəxs dedi ki, ey məlik, bəs mənə bir məmləkət bəxş qıl.

İskəndər dedi ki, əvvəlki sualın mənim şənimə layiq deyil idi, ikinci sual sənin.

## MÜSAFİR VƏ XƏSİS

Bir şəxs səfərə gedirdi. Onun bir nəfər bəxil olan dostu var idi. Bir gün bəxil olan dostuna dedi ki, səfərə gedirəm, əngüştərini (yəni üzüyünü) mənə ver ki, hər vaxt barmağımda görsəm, yadıma düşəsən.

Bəxil dedi ki, nə vaxt ki, istərsən mən yaduva düşəm – boş qalan barmaquva bax, məni yaduva sal. Degilən ki, filan vaxtda filan dostumdan yadigarlıq üçün bir üzük istədim, amma mənə vermədi.

## SAİL VƏ LOĞMAN

Bir şəxs Loğmandan sual elədi:
– Hikməti kimdən öyrəndin?
Dedi ki, nabinalardan. Çünki korlar bir yeri görməsələr (yəni yoxlamasalar) qədəm qoymazlar. "Qəddi-mil-xürucə qəbləl vüluc"*.

## SAİL VƏ HƏKİM

Bir həkimdən sual etdilər ki, sənin qardaşın nə haldadır?
Dedi ki, vəfat elədi.
Dedilər ki, vəfatının səbəbi nə idi?
Cavab verdi ki, "qayətül-həyati mövtün və qayətül-mövti fövtün"**

## HARUN VƏ BƏHLUL

Harun-ər-Rəşid Bəhluldan sual elədi ki, mənə bir nəsihət elə, ta ona əməl edib rastkar olum.

Bəhlul dedi ki, ey xəlifə, dünyadan bir şey özünlə apara bilməzsən, məgər səvab və iqba. İndi ixtiyarın var.

## ƏFLATUN

Bir şəxs Əflatun-həkimdən sual elədi ki, çox illər cəhazda dərya səfəri qıldın. Dəryada nə əcayib gördün?
Dedi ki, hamıdan əcəb budur ki, dəryadan səlamət sahilə vüsul etdim.

## QƏZVİNLİ

Bir nəfər qəzvinlinin bir eşşəyi itmişdi. Sorağ edib car çağırırdı və dəmbədəm Allah-taalaya şükr edirdi.
Bir şəxs ona dedi ki, ey sadədil, eşşəyin itibdir, car çəkirsən, çox əla; amma şükr etməyin vəchi nədir?
Dedi ki, şükr ondan ötrü eləyirəm ki, nə əcəb ki, eşşək itəndə süvar deyildim. Yoxsa ki bu gün beş gün idi ki, özüm də itmişdim.

---

* Xariç olmanı daxil olmadan əvvəl düşün (yəni bir işə başlarkən onun aqibətini düşün sonra başla (*məsəl*).

** Həyatın sonu ölümdür, ölümün sonu heçlik.

## SAHİB-MƏNSƏB

Bir nəfər şəxs mənsəbi-vəzarətə nail oldu. Onun bir nəfər qədimi dostu var idi. Mübarəkbad üçün onun hüzuruna gəldi. Sahib-mənsəb ondan sual elədi ki, sən kimsən və nə üçün təşrif gətirmisən?

Onun dostu şərməndə oldu. Dedi ki, məni tanımırsan? Mən sənin filan dostunam, əyadət üçün sənin yanına gəlmişəm. Çünki belə eşitdim ki, sən mənsəbə çatandan sonra kor olmusan.

*FƏRD*

Mirati-dövlətin bu da bir sirri-mübhəmi:
Məsnəddə aşinaları biganə göstərir.

## ŞAİR VƏ DÖVLƏTLİ

Bir miskin şair bir təvangərin yanına gəldi. Elə yovuq oturdu ki, şair ilə təvangər arasında bir vəcəb (qarış) yer qaldı. Təvangər bu səbəbdən bərhəm oldu, qaş-qabağını töküb, üzün turşudub şairə dedi ki, sənlə eşşək arasında nə qədər yer var?

Şair dedi ki, ey xacə, bir vəcəb.

Təvangər şərmnak oldu.

## NƏQQAŞ

Bir nəfər nəqqaş bir şəhərə getdi. Orada nəqqaşlıqdan əl çəkib, təbabət ağaz qıldı. Bir müddətdən sonra onun vətənindən bir şəxs o şəhərə gəldi. Onuyla mülaqat ittifaqı düşdü. Ondan sual elədi ki, hala nə sənətə məşğulsan?

Dedi ki, təbabət eləyirəm.

Dedi ki, nə səbəbə, elmi-nəqqaşi ki bütün ülumun əfzəlidir, ondan əl çəkib, təbabət sənətinə mübaşir oldun?

Cavab verdi ki, ey rəfiqi-şəfiq, elmi-nəqqaşda hər bir şəkil ki, dərü divara nəqş eləsəm, qüsuru cümləyə məlumdur. Amma bu sənəti-tibbdə nə xəta eləsəm, torpaq onu məstur qılır.

## ŞEYX ƏTTAR

Şeyx Əttar Çingiz xanın qələbəsində əsir olmuşdu. Bir nəfər moğal istədi ki, onu öldürsün.

Bir ayrı moğal dedi ki, öldürmə, bunu mənə sat sənə min qızıl verim.

Şeyx Əttar dedi ki, satma, bundan artığa dəgərəm.

Bir ayrı moğal dedi ki öldürmə, bunu mənə sat, bir torba sənə saman verrəm.

Şeyx dedi:

– İndi sat ki, bundan artığa dəgmərəm.

Moğal qəzəbnak olub Şeyx Əttarı şəhid qıldı.

## HEKAYƏT

Bir vaxt əkabirdən birisi bir günahkarın xüsusunda xəlifeyi-Bağdad Əbu-Mənsura şəfaət elədi. Mənsur dedi ki, bu şəxsin çox böyük günahı var. Ol şəxs dedi ki, mən dəxi təvəqqe eləyirəm ki, bu böyük olan günahdan keçəsən və illa, günahi-səğirdən şəfaətsiz də keçmək olur.

Xəlifə onu bağışladı.

## HEKAYƏT

Bir padşah özünün xas olan mülazimlərinin birisinə xəlvətdə dedi ki, sənə bir sirr verim, gərəkdir heç bir kəsə deməyəsən. Mülazim əhd elədi ki, demənəm. Padşah dedi ki, mən öz qardaşımdan bədzənn olmuşam: qorxuram ki, məni öldürə. Sən gərək həmişə məni mühafizət edəsən. Və əgər ondan bir hərəkət bilsən, fürsət verməyib onu öldürəsən.

Padşahın mülazimi bu sirri onun qardaşına dedi. Şahın qardaşı mülazimdən çox rizaməndlik elədi.

Qəzadan ənqərib vaxtda padşah vəfat elədi. Padşahın qardaşı təxti-səltənətdə əyləşdi. Filhal ki, səltənətə çatdı, qardaşının haman mülazimin tələb qılıb, hökm elədi ki, başın kəsələr.

Dedi: – Ey padşah, mənim günahım nədir?

Dedi: – Sənin günahın odur ki, qardaşının xələt və ənamından bəhrəvər ola-ola, sən ki onun sirrin saxlamadın, mənim sənə heç etimadım yoxdur.

## HEKAYƏT

Bir gün bir xacə öz qulamı ilə səyahəti-bustanə getmişdi. Xacə bağdan bir xiyar dərdi, öz qulamına verdi. Qəzara haman xiyar nəhayət acıydı. Qulam o xiyarı şirin-şirin yedi. Xacə bir löqmə və xiyardan qulamın əlindən alıb öz ağzına qoydu. Gördü ki, zəhri-həlahildən bir nişanədir. Dedi ki, ey qulam, bu acılıqda xiyarı belə şirin-şirin nə üçün yeyirdin?

Qulam ərz elədi ki, ey xacə, mən bəndə sənin mübarək olan əlindən çox şirin olan şərbətlər içmişəm.

İnsafım rəva vermədi bir təlx olan xiyarı ki sənin əlindəndir, acıdır, deyib yerə atam.

Xacə qulamın ədayi-şükr-nemətin görüb ol qulamı azad elədi.

## HEKAYƏT

Harun-ər-Rəşidin bağbanı bir gün bostandan xəlifə xidmətinə üç ədəd xiyar nubar gətirdi. Bağban xəlifənin məclisində ayaq üstə durmuşdu, ənam təmənnası var idi. Xəlifə bıçağıyla xiyarları bir-bir kəsib qabıqlı-qabıqlı hər üçün yedi. Qurtarandan sonra bağbana ənam verib yola saldı.

Nədimlərindən bir nəfər ərz elədi ki, bu gün xəlifədən qəribə əhval müşahidə olundu: üç nubar olan xiyardan bir dilim bir kimsəyə vermədi. Bunda nə hikmət var idi?

Harun dedi ki, əvvəlinci xiyarı kəsib bir parça ağzıma qoydum, gördüm ki, zəhri-qatildən bir əlamətdir. O səbəbdən onu özüm yedim, qorxdum sizə ondan təarüf edim, siz bitəəmmül deyəsiz ki, nə acı xiyardır, biçarə bağban ki, ənam fikrilə nubar gətiribdir, xəcalət çəkə. Fikr elədim ki, ikinci xiyari kəsərəm, əgər şirin çıxsa, onu sizə təqsim elərəm. Ol dəxi acı çıxdı. Üçüncü xiyar olardan bədtər çıxdı. O səbəbdən sizə vermədim. Və illa, mən elə qarınqulu deyiləm.

## HEKAYƏT

Səhl ibn-Fəzl öz vəzirlik zamanında dostlarından bir nəfərə dedi ki, xalqın tərəddüdündən təngə gəlmişəm və adamların şikayətindən məlul olmuşam.

Ol dostu ona dedi ki, ey Səhl, izzət balışın dalından və [başının altından] götür, vəzirlikdən əl çək, mənə ver; dəxi heç kəs sənin yanuva gəlməz və zəhmət verməz.

## HEKAYƏT

Bir hakim qulluqdan məzul olmuşdu, cəzə-fəzə qılıb ağlayırdı. Bir şəxs ona dedi ki, heyf ki, bir sən kimi hakim xidmətdən məzul olsun.

Hakimi-məzul dedi ki, belə təsəvvür eləmə ki, mən məzul olduğum səbəbdən ağlayıram. Lavəlla, indi peşiman olmuşam ki, sahibixtiyar olan vaxtda hər kəsə ki yaxşılıq elədim, niyə ziyadə eləmədim və niyə bir kəsə yamanlıq elədim?

## HEKAYƏT

Bir padşahi-dərvişdust bir nəfər abidin ziyarətinə getdi. Ərz elədi ki, ey şeyx, mən istəyirəm ki, həccə gedim, amma ümənayi-dövlət və cəmi rəiyyətlərim razı olmurlar ki, vilayət bisahib qalsın. Mən belə eşitdim ki, sən iyirmi dəfə Məkkeyi-müəzzəməyə müşərrəf olmusan. Nə olur ki, bir həccinin savabın mənə satasan ki, mənə itaət hasil olsun, sənə dövlət.

Abid dedi ki, ey məlik, doğrudur ki, mən iyirmi beş dəfə həccə müşərrəf olmuşam. Çünki mən əvamünnas kimi şöhrət üçün və fəxr üçün getməmişəm. Mən hər dəfədə payi-piyadə getmişəm və hər bir məkanda, mənzillərdə ibadətlər eləmişəm, bəlkə Allah-taala mənim hər bir qədəmimə bir həcc və bir ömrə savabın yazıbdır. Mən bu həcclərimin cümləsini sənə sataram. Bismillah!

Padşah dedi ki, ey şeyx, mənim cümlə xəzanə və mülk və əmlakım ona baha deyildir, necə almaq olur”?

Padşah soruşdu ki, nə təriq ilə?

Abid dedi ki, ey padşah, sən bir məzlumun ədalətlə dadına yetdiyin savabı mənə ver, mən cəmi həcclərimin savabın sənə verim.

Bəs bu hekayətdən məlum olur ki, bir məzlumun dadına yetmək yüz min həccdən əfzəldir.

## HEKAYƏT

Abdulla Tahir bir gün öz oğluna dedi ki, ey nuri-dideyi-kirami, aya dövlət bizim xanədanda nə vaxta kimi qalacaq?

Oğlu cavab verdi ki, madam ki, büsati-ədlü dad və fərşi-insafü mürüvvət bu eyvana döşənəcəkdir. Zira ki, binayi-səltənət rişteyi-ədalətlə mənsub və mərbutdur.

## HEKAYƏT

Bir gün bir nəfər şəxs hakimlərdən birinə öz dərdin şikayət elədi. Ol hakim ona qulaq asmadı. Üçüncü dəfə ərz elədi, hakim qəzəbnak olub itabla ona dedi ki, get, nə vaxta kimi dərdi-sər verəcəksən?

Ol şəxs dedi ki, ey hakim, sənin başın dura-dura bəs dərdi-sərimi kimə verim?

Ol hakimə bu sözün lətifəsi xoş Gəlib, onun hacətin rəva elədi.

## HEKAYƏT

Bir gün bir padşah sübh tezdən şəhərdən çıxıb, şikara gedərkən bir nəfər bağban onun qabağına gəldi. Çiynində bel var idi. Padşahın atı ondan hürküb padşahı yıxdı. Padşah onun qətlinə hökm elədi və dedi ki, sən nə şum adam imişsən ki, mən sənə rast gəldim, atdan yıxıldım?

Ol bağban dedi ki, ey padşah, gör sən necə şumsan ki, mən sabah-sabah sənə rast gəldim, ölümə getdim.

Padşahın bu sözdən xoşu gəlib onun qətlindən keçdi.

## HEKAYƏT

Çün Hatəmi-Tai vəfat elədi, onu dəfn elədilər. Qəzara Hatəmin qəbri bir məhəldə vaqe olmuşdu ki, seldən qəbrə xələl yetişirdi. Hatəmin oğlu Ədi nam Hatəmin qəbrin açdı ki, onun nəşin seldən salamat olan məkana nəql eləsin. Gördülər Hatəmin tamam əzası tökülüb, vəlakin iki əlləri salamat qalıbdır. Xəlayiq bu hala təəccüb elədilər. Bir piri-kühənsali-cahandidə o camaatın arasında var idi. Dedi ki, təəccüb eləməyin ki, o bu əllərlə çox möhtaclara ehsanlar edibdir.

## HEKAYƏT

Günahkarlardan bir nəfər bir padşahi-ərəbin xidmətinə gəldi. O, padşahların əqrəbasından çox adamlar öldürmüşdü. Padşah ona dedi:
– Bu qədər günahın ola-ola, sən nə cürətlə mənim hüzuruma gəldin? Dedi ki, ey məlik, hərçənd mənim günahım böyükdür, amma bilirəm ki, sənin rəhmin mənim günahımdan böyükdür.

Padşaha onun sözü xoş gəlib onun günahlarından keçdi və vüzəralardan birisi ərz elədi ki, ey məlik, onun bu qədər günahı ola-ola, sən onun bir sözünə aldanıb ondan əl çəkdin.

Padşahi-ərəb dedi ki, belə deyil. Mən fikr elədim ki, əgər ondan intiqam alsam, mənim nəfsim şad olacaq; əgər əfv eləsəm, onun könlü şad olacaq və mən savaba vasil olacağam. Əfvdə bir ləzzət vardır ki, intiqamda yoxdur.

## HEKAYƏT

Həmişə Məmun xəlifə deyərdi ki, əgər xəlayiq bilsələr ki, mənim üçün əfvdə nə ləzət var, əlbəttə mənim dərgahıma günah töhfəsindən qeyri özgə töhfə gətirməzdilər.

## HEKAYƏT

İskəndər Ərəstudan soruşdu ki, filan günahkarın barəsində nə cəza gərəkdir?

Həkim cavab verdi ki, ey padşah, əgər günah olmasaydı, əfv sifəti ki fəzilətlərin əfzəlidir, bir kimsənədən zahir olmazdı. Bəs günah əfvin ayinəsidir və günahkar o sifəti-alinin zühuruna səbəbdir.

İskəndər dedi ki, əfv etmək nə vaxtda yaxşıdır?

Həkim dedi ki, zəmani-qüdrətdə.

## HEKAYƏT

Bir padşah bir düşmənə zəfər tapdı, onu əsir elədi. Ona itabla xitab elədi ki, özüvü necə görürsən?

Cavab verdi ki, Allah-taala bir şeyi dost tutur ki, o əfvdir və sən bir şeyi dost tutursan ki, o zəfərdir. Çün allah-taala sənin xahişini əmələ gətirdi, sən də Allah-taalanın xahişin əmələ gətir.

Padşahın bu sözdən xoşu gəldi, onu əfv elədi.

## HEKAYƏT

Soltan Səncərin müqərrəblərindən biri bir günah [iş] tutmuşdu. Soltan xəvaslarının biri ilə ol günahkara cəza vermək barəsində məşvərət və məsləhət qıldı. Ol şəxs dedi ki, əgər mən padşah olsaydım, onu öldürərdim.

Soltan dedi: – İndi ki, sən padşah deyilsən, gərək mənim kirdarım sənin xilafuva olsun, mən onu əfv elədim. Əgərçi günah ondan yaman görünürdü, amma əfv eləmək məndən yaxşı görünür.

*FƏRD*

Bəndələrdən nə qədər sadir ola cürmi-əzim,
Leyk əfv eyləmək ol cürmü dəxi əzəmdir.

HEKAYƏT

Harun-ər-Rəşid ki, xəlifeyi-Bağdad idi, onun əsrində bir nəfər ərabi ki, səhralarda, şurəzar olan yerlərdə nəşv-nüma tapmışdı, müddəti-ömründə bir saf olan şirin su görməmişdi. Bir gün azuqə təhsili üçün vətəndən çıxıb bir özgə diyara mütəvəcceh olmuşdu. Bir pakizə olan yerdə yağışdan cəm olmuş bir göl gördü. Bir qədər o saf sudan içdi, gördü ki, çox şirin sudur. Öz-özünə dedi ki, yəqin bu su cənnətdən bu yerə tökülübdür. Dedi: – Əcəb oldu, bu sudan töhfə apararam xəlifeyi-Bağdada, ənam və caiz allam. Belə su xəlifə görməyibdir.

Bəs ərabi o sudan tuluğun doldurub Bağdada rəvan oldu. Qəzara, iki ağac yol Bağdada qalmış, xəlifə xəvasları ilə şikara gedirkən ərabiyə rast gəldi. Ərabi xəlifənin cəlalından bildi ki, xəlifədir. Yol kənarında durub xəlifəyə dua dilin açdı. Xəlifə ondan soruşdu ki, ya əxəl-ərəb, hansı qəbilədənsən?

Cavab verdi ki, filan qəbilədən.

Dedi hara gedirsən?

Dedi ki, sənin xidmətüvə cənnət suyu gətirmişəm.

Xəlifə qulama dedi ki, bir cam o sudan doldurub mənə ver.

Çün xəlifə bir cürə o sudan içdi, gördü ki, göl suyudur, ərabinin tuluğunda qalıb dəxi ziyadə təəffün edibdir. Camı qulama verdi, buyurdu ki, bu su heyfdir, tök camdakı suyu tuluğa və bu tuluğu ərabidən alıb göndər Bağdada və tapşır ki, bu sudan bir kimsənə içməsin, tələf olmasın.

Bəs üzün tutub ərabiyə dedi ki, məndən nə xahiş qılırsan?

Ərabi dedi ki, "xəlifətül-müslümin haza maül cənnəti", səninçün cənnət suyu gətirmişəm, gərək mənə yüz qızıl pul verəsən.

Xəlifə yüz qızıl pul ona verdi. Ərabi şadman dərhal qəbiləsinə şitab qıldı.

Əyan həzrətdən sual etdilər ki, ya xəlifə, bunda nə hikmət vardı ki, cənnət suyundan bizə bir qətrə vermədin? Onu saxlamaqda mübaliğeyi-ziyadə buyurdun? Bağdada göndərdin və ərabiyə ənam edib ələl-icalə müraciətinə təkid elədin?

Xəlifə cavab verdi ki, bu ərabi ki, filan qəbilədə olur, ol sərzəmin bir şurəzar olan kəsif yerdir. Bu ərəb müddəti-ömründə bir saf və şirin və cari olan su görməyibdir, biyabanda yağışdan cəm olan suyu görüb, cənnət suyu hesab edib, mənim üçün ənam ümidi ilə töhfə gətiribdir. Mən içdim, gördüm ki, çox mütəəffin, nagüvara sudur. Sizə ki, ondan bir şürbə vermədim, qorxdum ki, içə bilməyib bir söz deyəsiz, ərabinin damağına dəyə və o ki tapşırdım ki, heç bir kəs bu suya dəyməsin, bu fikirlə onu dedim ki, ərabi xatircəm olsun ki, ol su nəhayətdə mənə xoş gəlibdir və ol ki ərabiyə ənam edib öz qəbiləsinə müraciətinə israr elədim, ondan ötrü idi ki, ərabi, məlum olur ki, Bağdadda cari olan nəhri-əzim Dəcləni görməyibdir, ta Bağdada gedib Dəcləni görüb xəcil olmasın.

## HEKAYƏT

Soltan Məlik şah Səlcuqi bir gün İsfahan şəhərinin Zindərud çayının kənarında şikara məşğul idi. Onun mülazimlərindən biri bir mərğzarda bir kök inək gördü. Tutub ol inəyi zibh elədi. Ətindən kabab bişirdi, yedi.

İnək sahibi bir nəfər əcuzə övrət idi. Məlik şahın şikardan qayıdan vaxtında Zindərudun körpüsünün üstündə atının cilovundan tutdu. Haman qulam gəlib əlindəki taziyanə ilə ol övrəti vurdu ki, ey biədəb, əldən qoy!

Padşah bildi ki, ona zülm olubdur. Qulamı mən elədi.

Ol övrət dedi ki, ey pəsəri-Arslan, əgər mənim dadıma bu Zindərud çayının körpüsündə yetməsən, puli-siratda damənüvü tutacağam. İndi hansın qəbul eləyirsən?

Soltan bu sözün məhabətindən piyada oldu, dedi ki, ey ana, o körpüdə cavab verməyə taqətim yoxdur, kim sənə zülm edibdir, bəyan elə?

Övrət dedi: – Ey məlik, həmin qulam ki, mənim başıma taziyanə vurdu, bu gün mənim bir rəs inəyimi zibh edib, kabab edibdir. Mən bir dul övrətəm, dörd baş yetim ol inəklə məişət qılırdıq.

Məlik şah buyurdu qulami-nafərmanı qətlə yetirdilər və özünün məxsusi olan vəchi-həlalından iyirmi rəs inək ol pirəzəni-məzluma əta elədilər. Pirəzən şad olub rəvan oldu və Soltan Məlik şah öz dadxahlığına səcdeyi-şükranələr qıldı.

## BALACA QARIŞQA VƏ TƏPƏ

...Hükəmayi-hind öz kitablarında mərqum ediblər ki, bir murçə bir təllin torpağını bir sair yerə nəql etməyə kəməri-himmət bağlamışdı. Bir quş gördü ki, bir zəif olan şey sürurи-təmam və vəcdi-malakəlam ilə dəstü pa çalıb bir təllin torpağını daşımağa səy və təlaş qılır. Dedi ki, zəif və nəhif əcibə olan, əmri-məhalə mürtəkib olmusan. Bu nə işdir ki, mübaşir olursan?

Murçə dilə gəlib dedi ki, mənim bir nəfər məşuqəm var, o mənə deyibdir ki, əgər mənim vüsalıma talibsən və dövləti-didarıma rağibsən, gərəkdir ki, bu təllin türabını filan yerə nəql edəsən. İndi mən səy edirəm şərti əmələ gətirəm.

Quş ona dedi ki, ey biçarə, bu arzu ki, sənin könlündədir, qüdrətindən çox bəiddir. Qolunda o tavana yoxdur ki, gümanın əmələ gələ. Murçə ümidini itirmədi. Dedi ki, mən öz səyimi elərəm, əgər muradım hasil olmasa da, dost hüzurunda üzrüm qəbuldur.

Bəs hər işdə səy eləmək lazımdır.

# LƏTİFƏ

Bir gün bir xan məclisdə dedi ki, hər kim öz övrətindən razıdırsa, ayağa dursun. Hamı qalxdılar ayağa durdular, məgər şəxsi ki, qalxmadı.

Xan dedi: – Ey şəxs, məgər sən övrətindən razısan ki, ayağa qalxmadın?

O cavab verdi ki, yox, sənə fəda olum, bu gün övrətim qıçıma belə vurubdur ki, qıçım şikəst olubdur. O səbəbdən qalxmadım.

* * *

Bir gün Şirvanın xanı Mustafa xan mərhum məclisdə bir tərəkəmədən soruşdu ki, ey şəxs, Allah neçədir?

Tərəkəmə fikir edirdi, xanın dalında duran naziri xandan məxfi beş barmağın yuxarı tutdu, yəni deginən ki, Allah beşdir.

Xan qəzəbnak olub dedi ki, ey heyvan, nə danışırsan, necə Allah beşdir?

Tərəkəmə ərz elədi ki, Allah sənin nazirüvə bəla versin, mən ona deyəcəkdim, o, beş barmağın yuxarı tutdu. Onunçün mən beş dedim. Xan, Allah ondur.

* * *

Bir gün Mustafa xan mərhum, bir şəxsdən soruşdu ki, ey şəxs, toyuğun harası yeməlidir və çox ləzzətlidir?

Ol şəxs cavab verdi ki, dərisi hər yerindən ləzzətlidir.

Xan ona xələt verdi.

Bir gün Mustafa xan mərhum, bir şəxsi-digərdən soruşdu ki, gomuş ətinin harası ləzzətlidir və yeməlidir?

Çün bu şəxs görmüşdü bir nəfər toyuğun dərisin ləzzətli dedi, xan ona xələt verdi, bu da təqlidən dedi ki, xan, gomuş ətinin hər yerindən ləzzətli gönüdür.

Xan ona qəzəb edib, məclisdən ixrac elədi.

* * *

Bir gün Şamaxıda bir nəfər şəxs bəd əzzöhr vəfat eləmişdi. Qəbristana adam göndərdilər ki, qəbir qazsın. Gurkən qəbri qazdı. Meyit sahibləri məsləhət görmədilər ki, dar ikindi vaxtı xalqa zəhmət versinlər. O gecə meyiti evdə saxladılar ki, səhər dəfn eləsinlər.

Xalq dedi ki, qəbrin ağzı açıq qalmaq yaxşı deyildir, şəhərə vəba naxoşluğu düşər, gərəkdir ki, haman qazılmış qəbirdə bir nəfər adam bu gecə yatsın, sabah meyiti dəfn edərik.

Qəzara, bir nəfər çoban qəbristan kənarında qoyunların otladırdı, çobana on manat pul verib razı elədilər ki, çoban bu gecə haman qəbrin içində uzanıb yatsın. Çoban o gecə qəbirdə yatmışdı. Yanında bir böyük dəyənəyi var idi. Şəhərdə iki nəfər lotu dedilər ki, elə bu çoban on manatı yesin getsin? Bu gecə-birimiz Münkər və birimiz Nəkir surətində gedib çobandan on manatı allıq.

Bəs hər biri bir ağ kəfən taxıb, ağacın başına əski və neftlə lopa qayırıb gəldilər çobanın üstünə. Çoban nə Münkər bilirdi, nə Nəkirdən xəbəri var idi. Gəldilər çobana dedilər ki, "mən rəbbükə"?*

Çoban dedi ki, mən ölməmişəm, mən bir nəfər diri çobanam. Mənə on manat pul veriblər ki, mən bu gecəlik bu qəbirdə yatam. Hələ ölən sabah gələcək, gedin sabah gəlin.

Lotular əlində olan lopaların silkələyib çobanı vurdular, dedilər: "mən rəbbükə?"

Çoban çox yalvardı ki, mən ölməmişəm, qulaq asmayıb çobanı lopa ilə vurdular.

Çoban qəbirdən qalxıb Münkərin kəlləsindən bir dəyənək vurdu, dərhal məğzi-səri tökülüb, həlak oldu.

O biri yoldaşı üz qoydu şəhərə qaçmağa. Çoban onu qova-qova saldı şəhərə. Meyit olan evin yanında bir xaraba hamam var idi, lotu qaçıb gizləndi ol xaraba olan hamamda. Çoban fəryad elədi ki, ay camaat, bir çıraq gətirin. Çobanın sədasına xalq cəm oldular. Gördülər haman çobandır ki, on manat alıb qəbirdə yatmışdı.

Dedilər ki, ey çoban, nə var?

Dedi ki, Münkərlə Nəkir səhv edib, məni ölən bilib, qəbristana gəlib məndən bir para sözlər xəbər alırlardı. Dedim ki, mən ölməmişəm, meyit hələ sabah gələcək. Qanmadılar, əllərində olan gürzi-atəşin ilə məni vurdular. Mən qəbirdən qalxıb Münkərin kəlləsindən bir dəyənək vurmuşam, beyni dağılıb, ölübdür. Amma

Nəkir zərbi-şəstimi görüb qaçdı. Onu qova-qova salmışam bu xarabaya. Allah xatirinə bir çıraq gətirin, əgər onu da öldürsəm, dəxi qəbirdə olanlarımız rahat yatarlar, Münkər və Nəkirin şərlərindən salamat olarlar.

---

* Allahın kimdir?

Bunlar dedilər ki, yəqin çobanı vahimə basıbdır. Çobanı bir dillə yola saldılar. Sabah qəbristana gələndə gördülər bir nəfər lotunun kəlləsi dağılıbdır. Tanıdılar. Yoldaşın dəxi bildilər ki, kim imiş və nə üçün qəbristana gediblərmiş, – hamıya məlum oldu.

* * *

Qarabağlı Talıb xan, nağıl edirlər ki, bir gün şikara getmişdi. Bir qırqovul tutmuşdu. Axşam mülazimlərinə dedi ki, siz bu qırqovulu buxarıda şişə çəkib bişirin, mən yorulmuşam, bir qədər yatım, durub yeyəcəyəm.

Talıb xan yatdı. Nökərlər qırqovulu bişirdilər, özləri yedilər. Şişi boş buxarının yanına söykədilər. İki-üç saatdan sonra Talıb xan xabiqəflətdən bidar oldu, dedi ki, gətirin qırqovulumu.

Nökərlər hamı şəhadət verdilər ki, ağa, sən qırqovulu yedin, yatdın. Talıb xan dedi ki, doğrudur; çünki ciyərim çox yanır, məlum ki, yemişəm, yatmışam. Bəs bir qədər su verin. Suyu içdi, yenə yatdı.

## NADİRƏLƏR

Cühanın bir vaxt eşşəyi itmişdi. Fəryad eləyirdi ki, hər kəs mənim eşşəyimi tapsa, iki eşşək ona müjdəganlıq verərəm.

Dedilər ki, bir itmiş eşşəkdən ötrü necə iki eşşək müjdəganlıq vermək olar?

Dedi ki, bilmirsiz ki, itmiş eşşəyi tapmaqda nə ləzzət var.

* * *

Cühanın bir vaxt eşşəyi itmişdi. And içdi ki, əgər onu tapsa, bir dinara satsın. Vəqta ki, eşşəyi tapdı, pişiyi götürüb onunla bir ipə bağladı, apardı bazara ki, satsın. Dedi ki, kimdir bu eşşəyi alsın bir dinara, pişiyi alsın yüz dinara? Vəlakin ikisini də bir yerdə satacağam, bir-birindən ayırmanam.

* * *

Cüha bir vaxt səfərə gedirdi. İki qılıncı və iki nizəsi var idi. Bir piyada ona rast gəldi. Cühanı soydu, üryan elədi. Cüha üryan və nalan şəhərə gəldi. Macəranı bəyan elədi.

Dedilər ki, səndə qılınc və nizə ola-ola, bir piyada bir dəyənəklə necə səni soydu?

Dedi: – O səbəbə ki, bir əlimdə qılınc var idi, bir əlimdə nizə tutmuşdum. Fürsət vermədi ki, nizəni ona həvalə eləyim, məni soydu. Amma elə ki, o məni soyub getdi. Bir ağac ki, ondan aralandım – onu çox söymüşəm.

* * *

Cüha əksər övqat təhsili-məişət dalınca getməzdi. Bir gün övrəti ona dedi ki, hərgah bundan sonra hər gün sübh evdən dışarı çıxmasan, axşama kimi iyirmi quruş pul gətirməsən, səni evə qoymayacağam. Bu şərtlə onu evdən çıxartdı. Cüha o gün axşamacan gəzdi, dolandı, əlinə bir şey gəlmədi.

Şəhərin kənarında bir xaraba var idi, özünü ona yetirdi. Bir guşədə məxfi oldu, qərar tutdu, dəryayi-fikrə qutəvər oldu. Bu əsnadə gördü ki, bir dərviş həmin xarabaya daxil oldu, bir tərəfdə əyləşdi. Bir az vaxtdan sonra dərviş dağarını çıxartdı. Bir çıraq yandırdı və dağardan bir qədər mum çıxartdı. O mumdan bir şəkil tərtib elədi, qabağına

qoydu, dedi ki, bu Adəmdir. Ona xitab elədi ki, ey Adəm, xudavəndi-əhədiyyət səni yaratdı və cənnətdə sənə mənzil verdi, ənvaü əqsam sənə nemətlər verdi. Buğdanı yeməkdən səni nəhy elədi. Müxalifət elədin, buğdanı yedin. Səni behiştdən çıxarıb dünyaya saldılar və biz də sənin sülbündən vücuda gəldik. Nə qədər ki, sağıq, gərək ələd-dəvam təhsili-məaş üçün məşəqqətlər çəkək; elə ki, vəfat elədik, öz üsyanımızın babətindən əzabda olaq.

Bəs dərviş əsanı götürüb, onu əsa ilə döydü və sındırdı. Yenə mumdan bir surət tərtib elədi. Onun adını Həvva qoydu, dedi ki, ya Həvva, nə səbəb sən nəimi-behiştdən göz yumdun və Adəmi buğda yeməyə təhris və tərğib elədin, ta ki buğdanı yedi?

Onu da əsa ilə sındırdı. Və yenə bir surət tərtib elədi, onun adını şeytan qoydu, dedi ki, ey məlun, sən məlaikeyi-müqərrəb cümləsindən idin. Öz həddindən təcavüz elədin və Adəmə səcdə eləmədin, ta ki səni əsfəlüs-safilinə atdılar. Dübarə həvvaya vəsvəsə verdin, onu buğdanı yeməyə vadar elədin və onun övladından dəxi əl çəkmirsən, həmişə onları yoldan çıxardırsan, iğva edirsən. Bəs əsanı onun başına vurdu, onu da sındırdı. Və habelə, mumdan yenə surətlər tərtib elədi, hər birinin adını [bir] peyğəmbər qoydu və övliya qoydu, hər birinə bir təqsir qərar verdi, onları da sındırdı.

Tainki növbəti-axırda bir surət tərtib elədi, onun adını rəbbi-əla qoydu. Bir neçə təqsirlər dəxi ona sabit elədi, itab və xitab qıldı. Çün istədi əsanı onun başına endirsin, Cüha yerindən qalxdı, dedi ki, ey dərviş, bir saat səbr elə ki, mən iyirmi quruşumu ondan alım. Əgər Allahı da öldürsən, gərək mənim iyirmi quruşumu özün verəsən. Ondan ötrü ki, əgər pulu almamış evə getsəm, övrət məni evə qoymayacaq.

Dərviş Cühanın sövtündən vəhşət edib, qorxudan hər nə ki varı idi, xarabada qoyub qaçdı.

Cüha yerindən qalxıb, dərvişin şeylərini götürüb evə gəldi. O cümlədən yüz qızıl pul o şeylərin içində var idi. Qapını döydü, övrəti qapının dalına gəldi, dedi ki, hərgah iyirmi quruşu gətirmisən, qapını açacağam və illa yox.

Cüha dedi ki, qapını aç. İyirmi quruşun əvəzində yüz qızıl gətirmişəm.

Övrət qapını açdı, gördü ki, doğru deyir. Ondan əhval-pürsan oldu ki, necə oldu ki, bu qızılları ələ gətirdin?

Dedi ki, o səbəb ki, Allahı ölümdən qurtardım, bu neməti mənə qismət elədi. Və keyfiyyəti bəyan elədi.

* * *

[Bir gün Cühaya] dedilər ki, heç şer inşa edə bilirsən?

Dedi ki, bu fənndə mənim mislü manəndim yoxdur.

Bir şer oxudu, misrai-əvvəlinin qafiyəsi zai-banöqtə idi və ikinci qafiyəsi zai-möhmələ. Əvvəli məzmum, axırı məksur.

Dedilər ki, bu nə gunə şerdir?

Dedi ki, bunun zərəri yoxdur, zai-möcəməni dəxi zai-möhmələ kimi oxuyun.

Dedilər ki, qafiyənin biri məzmumdur, biri məksur.

Dedi ki, qəribə eşşək adamlarsız! Mən deyirəm ki, nükteyi-zahirdən göz yumun, siz indi erab dalınca gəzirsiniz.

* * *

Bir gün iki axmaq yol ilə gedirlərdi. Biri dedi ki, Allah-taala mənə bir sürü qoyun verəydi, min rəs olaydı. Birisi dedi ki, Allah-taala mənə bir sürü qurd verəydi, min baş olaydı, ta ki sənin qoyunlarını yeyəydilər.

Ol qoyun istəyən qəzəbnak oldu, onu söydü və davaya, başladılar. Nagah Cüha onlara rast gəldi. Davanın səbəbini xəbər aldı. Hekayəti bəyan elədilər. İttifaqən Cühanın əlində bir bəsti bal var idi. Bəstini sərazir elədi, balı yerə tökdü. Dedi ki, mənim qanım bu bal kimi tökülsün ki, cəmi dünyada sizdən axmaq adam yoxdur.

* * *

Bir vaxt Cüha bir məscidin minarəsində əzan verirdi. Özünün kərih olan sövtündən xoşu gəlirdi. Tez minarədən düşüb, minarəyə baxırdı. Yenə çıxıb əzanın dalını deyirdi, yenə düşüb qulaq verirdi. Ona dedilər: – Niyə belə eləyirsən?

Dedi ki, istəyirəm biləm ki, sövtüm uzaqdan neçədir, yavuqdan ki, çox yaxşıdır. Və bir də görüm ki, harayacan səsim gedir.

* * *

Bir gün [Cüha] bir evə gəldi ki, təzə çörək və aş bişirmişdilər. Hər qədər ki, oturdu, onunçün təam və xörək gətirmədilər. Ayağa durdu, təzimi-təmam ila evin o tərəfinə, bu tərəfinə yüyürdü.

Dedilər bu nə əməldir?

Dedi ki, bu ev Kəbənin evinə oxşayır. Mənə vacibdir ki, onun ətrafını təvaf eləyim.

Ondan sonra durdu, evin dörd bir tərəfini dolandı və məsahət elədi, yəni ölçdü.

Dedilər ki, niyə ölçürsən?

Dedi ki, bir ev ki, təamsız ola, onu təmir eləmək asandır. İstəyirəm ki, bu evin tul və ərzini bilim və bu andazədə özümdən ötrü bir ev təmir eləyim.

* * *

Bir vaxt [Cüha] bir neçə rəfiq ilə şikara getmişdi. Bir qurd onlara rast gəldi. Qurdu şikar təsəvvür elədilər. İstədilər ki, onu tutsunlar. Qurd qaçıb, bir daşın altına girmişdi. Cühanın yoldaşı başın daşın altına apardı ki, qurdu çəkib çıxartsın. Qurd onun başını bədənindən qopardı.

Cüha gördü ki, yoldaşı başın çıxartmır. Baxdı yoldaşını başsız gördü. Fikrə piçidə oldu ki, aya, mənim yoldaşımın başı əvvəldən var idi, ya yox? Ondan sonra yoldaşlarına dedi ki, səbr eləyin ta ki mən şəhərə gedim, onun əyalından xəbər alım ki, bu kişinin başı var idi, ya yox?

Bəs şikardan gəldi yoldaşının evinin qapısına. Övrətindən xəbər aldı ki, sənin ərivün evdən çıxanda başı var idi, ya yox idi?

* * *

[Cüha] bir vaxt iddəayi-nübüvvət elədi. Dedilər ki, sənin möcüzatın nədir?

Dedi ki, hər ağacı ki, çağırsam gəlir. Dedilər ki, filan ağacı çağır, görək gəlirmi? Hər nə qədər ki, onu çağırdı, ağac əsla hərəkət eləmədi. Bəs özü ağacın yanına gəldi, dedi ki, ənbiya və övliyada kibr olmaz. Əgər o bizim yanımıza gəlməsə biz onun yanına gedərik.

* * *

Yenə bir vaxt Cüha iddəayi-vilayət elədi.

Dedilər ki, nə kəramətlə iddəayi-vilayət edirsən?

Dedi ki, o səbəbə ki, mən bilərəm, hər nə adamların xəyalından xütur eləsə, xəbər verərəm.

Dedilər ki, əgər bildin ki, bizim xəyalımızdan nə keçir?

Dedi ki, hamuvuz xəyal edirsiz ki, xudaya, görəsən Cüha öz iddəasında sadiqdir, ya kazibdir?

* * *

[Cüha] bir vaxt bir övrət aldı. Övrəti üç aydan sonra doğdu. Övrət-lər istədilər ki, ona ad qoysunlar. Cüha dedi ki, bunun adını mən özüm qoydum "Qasidi-tizqədəm".

Dedilər, ki, nə səbəbə ona belə ad qoydun?

Dedi ki, bu tifil doqquz aylıq yolu üç ayda gəlibdir, teyyi-mənazil və qəti-mərahil qılıbdır. Buna görə layiqdir ki, ona bu ad qoyulsun.

* * *

[Cüha] bir vaxt bir yük buğda dəyirmana aparırdı. Yolda dedi ki, əgər bu buğdalar hamısı tila olsaydı, nə yaxşı olardı!

Nagah buğdanın çuvalları deşildi, o buğdalar yerə dağıldı.

Dedi ki, xudavənda, buğdaları ki, tila eləmədin – heç. Dəxi nə üçün yerə dağıtdın? Sənə nə yamanlıq eləmişəm?

* * *

Deyirlər ki, bir gün Cüha yol gedirdi, yorulmuşdu. Dedi ki, xuda-vənda, bir mərkəb mənim üçün yetir ki, süvar olum, dəxi piyada yol getməyə taqətim qalmadı.

Nagah bir piyadeyi-digər yorulub yolda qalmışdı, Cühanı tutub dalına süvar oldu. Cüha nəhayətdə xişmgin olub, dedi ki, xudavənda, altmış ildir ki, Allahlıq eləyirsən, hələ də sözü annamırsan? Mən məgər belə demişdim?

* * *

[Cüha] bir vaxt bir neçə toyuq alıb, yağda toyuqları büryan elədi, bir qaba qoydu, ağzını örtdü, getdi ki, rəfiqlərin yeməyə gətirsin. Övrəti o bişmiş toyuqları götürüb bir neçə vəhşi göyərçinlər o qaba qoyub, ağzın örtdü. Elə ki Cüha qonaqları evə gətirib oturtdu, getdi ki, müsəmma olan toyuqları gətirsin, qabın ki sərpuşun götürdü, quşlar hamısı birdən uçdular, getdilər. Cüha mat və məəttəl qaldı, dedi ki, xudavənda, bərfərz ki, sən bu quşlara tərəhhüm elədin, zində ğıldın. Qüdrətindən uzaq deyildir, indi mənə de görüm ki, yağın pulunu və özgə məxarici kimdən alım, qonaqlarım nə yesin?

## TARİXİ, ƏFSANƏVİ, DİNİ VƏ COĞRAFİ ADLAR

A b b a s – İrəvanlı Məhəmmədzadə Abbas ağaya işarədir. Ləğəbi: "Fars Abbas" imiş.

A b d u l l a  T a h i r – (Əbu Abdullah bin-Tahir) – XI əsrdə xəlifə Məmun-ər-Rəşidin ağıllı vəziri olmuşdur. Dövrünün görkəmli alimi, şairi və filosofu imiş.

A b d u l l a h – Abdulla bəy Asiyə işarədir. Bax: Asi.

A d  v ə  S ə m u d – Qədim Babilistanda qaniçən hökmdarlar.

A g a h – Hacı Abbas Agah, XIX əsr Qarabağ şairi.

A ğ a c a n – S.Ə.Şirvani dövründə Şamaxıda vəkil olmuşdur.

A i ş ə – Seyid Əzim Şirvaninin kiçik qızı.

A l i-B ə n i-Ə s ə d – Mədinədə Məhəmmədə köməklik edən qəbilə.

A l i-Ə b a – Məhəmməd, Əli, Fatimə, Həsən, Hüseyndən ibarətdir. Buna "pəctəni-ali-əba" da deyilir (əba ailəsi beşliyi).

A l i-Ə t h a r – (pak övladlar) – Məhəmmədin övladına işarədir.

A s ə f  İ b n  B ə r x i y a – Süleyman peyğəmbərin vəziri. Dövrünün məşhur filosofu olmuşdur.

A s i – Abdulla bəy Asi (1839-1874) – görkəmli Azərbaycan şairlərindən olmuşdur. Qasım bəy Zakirin qız nəvəsidir. Gənc yaşlarından içkiyə alışan Abdulla özünə "Asi" (günahkar) təxəllüsünü götürmüşdür". S.Ə. Şirvaninin yaxın dostu olmuşdur. Qarabağda Mirmöhsün Nəvvabın təşkil etdiyi "Məclisi-fəramuşan" (yaxud "Məclisi-xamuşan") ədəbi məclisinin üzvü olan Asi türk və fars, dillərində əsərlər yazmışdır.

A z ə r – İslamiyyətdən əvvəl Məkkədə yaşamış məşhur bütyonan. "Azər" adlı bütün (heykəlin) müəllifi kimi məşhurdur. İbrahimxəlil peyğəmbərin atasıdır. Klassik ədəbiyyatda ona bəzən "Azəri-bütkər" də deyilir.

B a b i l – İraqdan başlayıb Bəsrə körfəzinə qədər böyük bir sahəsi olan ölkə) gəldanilərin vətəni. Bəşəriyyətin ən qədim mədəniyyət mərkəzlərindən biri idi. Babilistanın ilk hökmdarları Nəmrudilər nəsli olmuşdur. İslamın zühurundan sonra Babilistan islam dini və ərəb dilini qəbul edib tam ərəbləşmişdir.

B a d ə f ü r u ş – Sufilərin Əliyə verdikləri ləqəb.

B a ğ d a d – İraqın paytaxtı, IX-XIII əsrlərdə xilafətin mərkəzi.

B a h a r – Mirzə Nəsrullah Əbülqasım oğlu Bahar Şirvani (1835-1883) Şamaxı şəhərində, tacir ailəsində doğulmuşdur. İlk gənclik illəri doğma şəhəri Şamaxıda keçmişdir. Ərəb, fars, türk və fransız dillərini öyrənmiş, bu dillərdə şer yazmışdır. Azadməslək və ateist ruhlu şair vətənində kafər elan edildikdən sonra Tehrana köçmüş, Nəsrəddin şah Qacarın sarayında "Şairlər şahı" (Məliküş-şüəra) olmuşdur. 1878-ci ildə Tehrandan Təbrizə köçmüş, qonşusu ingilis səfiri ilə dostlaşmışdır. Səfir onun fars, türk və fransızca şeir-

lərini Londonda çap etmək adı ilə İngiltərəyə aparmışdır. Əsərlər hələlik çap edilməmişdir. 1883-cü ildə Təbrizdə vəfat etmiş, Məqbərətüş-şüəra qəbristanında, Xaqaninin qəbri yanında dəfn olunmuşdur.

B a l a s a d ı q – XIX əsrin axırı – XX əsrin əvvəllərində Bakının Suraxanı kəndində yaşayan el şairi.

B a ş ı a ç ı q – Gurcüstanda bir mahalın adı.

B e y t i-x u d a – Kəbəyə işarədir.

B e y t ü l m ü q ə d d ə s – (Yerusəlim)-Yəhudi və xaçpərəstlərin dini mərkəzi. Burada bir çox peyğəmbərin türbəsi vardır. Süleyman tərəfindən təsis olunmuşdur. Büxtünnəsr adlı bir qəddar yəhudi hökmdarı tərəfindən dağıdılmışdır. Xosrov Pərviz onu yenidən təmir etmişdir.

B e y z a v i – (Qaziyi-beyzavi) – "Təfsiri-Beyzavi" əsərinin müəllifi, fiqh və şəriət elmlərinin bilicisi kimi tanınmışdır. XIII əsrdə yaşamışdır. Qurana ərəbcə şərh yazmışdır.

B ə d r Ş i r v a n i – Dövlətşah Səmərqəndinin təzkirəsindən İran şairi Katibi Turmizinin Bədrlə görüşdüyünü öyrənirik. Bədr Şirvani təxminən XIII-XIV əsrlərdə yaşamışdır. F.Köçərliyə görə, əsrinin görkəmli şairi olmuş, "şerşünaslıqda və tənqiddə artıq dərəcədə məharəti var imiş".

B ə h l u l – "Bəhlul danəndə" və "Bəhlul divanə" ləqəbi ilə məşhur olmuş bir şəxsiyyətdir. IX əsrdə Bağdadda yaşamışdır. Dövrünün hakim təbəqəsinə qarşı üsyan əlaməti olaraq özünü dəliliyə vurmuşdur. Adı Şərqdə Molla Nəsrəddinlə yanaşı çəkilir.

B ə h m ə n – I. İran Şəmsi tarixi ilə yanvar-fevral aylarına mütabiq olan qış ayıdır; II. Firdovsinin "Şahnamə" əsərinin qəhrəmanlarından biri.

B ə l x – Əfqanıstana tabe olmuş xanlıq. Heratla Buxara arasında yerləşir. Dağlıq və ovalıqlardan ibarət bir ölkədir. Əhalisinin bir hissəsi tacik, bir hissəsi türklərdən ibarətdir. Türk və fars dillərində danışırlar.

B ə n i-A b b a s – Məhəmmədin əmisi Abbasın övladına deyilir. Bu sülalə IX əsrdən XIII əsrə qədər davam etmişdir.

B ə r ə h u t – Ərəbistanda çöl.

B ə r m ə k – IX əsr Harun-ər-Rəşid sarayında olan fəri-Bərmekin mənsub olduğu qəbilə.

B ə ş i r – (İbn-Cəzləm) – Kərbəla əsirlərini Şamdan öz vətənlərinə (Mədinəyə) aparan müşayiətçi.

B ə t h a – Mədinə şəhərinin əsil adı.

B ə t u l – Məhəmmədin qızı Fatimeyi-Zəhraya işarədir.

B i x u d – Molla ağa Bixud (1830-1892) "Beytüs- Səfa"nın fəal üzvlərindəndir. Əvvəl S.Ə.Şirvaninin dostu, sonra düşməni olmuşdur.

B i j ə n – Firdovsinin "Şahnamə" əsərinin qəhrəmanlarından biri.

B i l a l – (Bilali-Həbəşi)-Məhəmməd peyğəmbərin azançısı olmuşdur.

B u q r a t – Hippokrat; qədim yunan mütəfəkkiri.

“B u s t a n” – Sədi Şirazinin məşhur əsəri.

B u z ə r – (Əbuzər) – Məhəmmədin əshabələrindəndir.

B ü x t ü n-n ə s r – “Tövrat”ı yandıran zülmkar yəhudi hökmdarı.

B ü r a q  v ə  R ə f r ə f – Məhəmmədin merac gecəsi süvar olan miniklərin adı

B ü r c i-ə q r ə b – VIII bürc, əfsanəyə görə ay Əqrəb bürcündə olanda yerə bəla üz verər.

C a f – Babilistanda öz gözəlliyi və böyüklüyü ilə məşhur olan qəsr.

C a l u t – Davud peyğəmbər dövründə Fələstin qəhrəmanlarından biri.

C a n u s i p a r  v ə  M a h i y a r – Daranın əvvəlcə dostu, sonra qatili olan qulamlar.

C e y h u n – Amu-Dəryanın keçmiş adı.

“C ə b r ü l-M ə q a b i l” – Şeyx Bəhaəddin Amilinin cəbr kitabı.

C ə d y – X bürcün adı.

C ə f ə r i -T ə y y a r – İmam Əlinin böyük qardaşı. Rumilərlə gedən “Mötə” müharibəsində öldürülmüşdür.

C ə m ş i d – “Şahnamə” qəhrəmanlarından biri.

C ə r i r – (Əbu Həzrə) – VIII əsr Əməviyyə dövləti dövründə yaşamış istedadlı ərəb şairi. Fərəzdəqin müasiri olub onunla şerləşmişdir. Hicri 111-ci ildə 80 yaşında vəfat etmişdir.

C i d o v – Heyvanlarda əl-ayaq tutulması xəstəliyidir.

C i r c i s – Peyğəmbər olmuşdur.

C ö k k i – Atəşpərəstlər.

C ö v z a – III bürcün adı.

C ü r m i – (Məhəmmədağa Cürmi) – XIX əsr Bakı şairlərinin başçısı, Məcməüş-şüəra” ədəbi məclisinin sədri olmuşdur. S.Ə.Şirvani ilə yazışmış, onun yaxın dostu olmuşdur.

Ç ə n g – Şərq musiqi aləti.

Ç ə r x ə ç i – Keçmişdə qoşun başçısına verilən hərbi titul

Ç ə r m ə d ü l – Yer adı.

D a r a – Firdovsinin “Şahnamə” əsərinin qəhrəmanlarından biri.

D a r ü s s ə l a m – Bağdadın ikinci adı.

“D a s i t a n i-g ü r b ə və m u ş” – Fars şairi Übeyd Zakaninin məşhur əsəri. S.Ə.Şirvani həmin əsəri “Siçan-pişik dastanı” adı ilə tərcümə etmişdir.

D ə b r a n – Ayın dördüncü fazası, mənzili.

D ə c c a l – Özünü XII imam (Mehdi) elan edəcək yalançı, həm də əfsanəvi imam.

D ə c l e y i-B ə ğ d a d – Bağdadın ortasından axan çaydır.

D ə l v. XI bürcün adı.

D ə ş t i-Q ı p ç a q – Ural dağları ilə Volqa çayı arasında olan geniş ovalıq. Qıpçaqlar bu sahələrə Çingiz xan dövründə köçürülmüşlər.

D i b i l – (Əbu Əli). Hicri 246-cı ildə 98 yaşında vəfat etmişdir. Çoxlu mərsiyə və qəsidələrin müəllifidir. Yaradıcılığının əsas hissəsini həcvlər tutur. Harun-ər-Rəşid, Məmun-ər-Rəşid, Mötəsimbillaha yazdığı həcvləri məşhurdur.

D i l x u n – Mirzə Ağa Dilxun – "Məcməüş-şüəra"nın üzvlərindəndir.

D i l k ə ş – Muğam şöbəsi.

D i y a l l ı – Şirvanda kənd adı.

D u n a y – Avropanın ortasından axıb Qara dənizə tökülən çay. Bir sıra Avropa dövlətlərinin içərisindən keçdiyi üçün şair "Dunay" dedikdə Avropanı nəzərdə tutur.

D ü g a h – Muğam adı.

D ü x t ə r i-t ə r s a – Şeyx Sənanın sevgilisi Xumara işarədir.

D ü l d ü l – Əlinin atı.

E l m i-H a r u n – IX əsrdə, Harun-ər-Rəşid dövründə islamiyyətin mərkəzi Bağdadda elm, mədəniyyət və ədəbiyyatın tərəqqisinə işarədir.

Ə b a b i l v ə S i c c i l – (Quranda ayə) – Əbrəhə adlı bir nəfər islamiyyətdən əvvəl Məkkə şəhərinə fillərlə hücum etdiyi zaman, guya allahın əmri ilə Əbabil quşları dimdiklərinə sərt kəsəklər (siccil) alıb ucadan fillərin üzərinə yağdırmış və Əbrəhə məğlub olub geri çəkilmişdir.

Ə b d ü l m ə c i d – (Əbdülməcid xan Soltan Qazi)-Osmanlı səltənətinin otuz birinci soltanı Əbdülhəmidin atası, Soltan Mahmud xan Saninin oğlu. Hicri 1237-ci ildə doğulmuş, 1255-ci ildə taxta çıxmış, 1277-ci ildə ölmüşdür.

Ə b u L ə h ə b – Məhəmmədin əmisi və onun ən qəddar düşməni.

Ə b u M ə n s u r – Dövrünün görkəmli alim, filosof və şairi olmuş, 17 elmdən dərs demişdir. Hicri 429-cu ildə Əsfərayində vəfat etmişdir. Əbu Süfyan (Əbu Süfyan ibn-Hərb) – Məhəmməd və tərəfdarlarına qarşı mübarizə aparan Qüreyş qəbiləsindən bir feodal. Məkkənin fəthindən sonra Məhəmmədin tərəfinə keçmişdir. Bu müharibədə bir gözünü itirmişdir. Hicri 31-ci ildə, 88 yaşında ölmüşdür.

Ə b u b ə k r – (Məhəmməd ibn-Əbubəkr) – Məhəmməddən sonra birinci xəlifə.

Ə b u c ə h l – Məhəmmədin əleyhdarı olmuşdur.

Ə b ü l ç ə p – Muğam şöbəsi.

Ə d ə n – Yəmənin cənub sahilində və Ümman dənizinin Ədən körfəzində yerləşən qədim ticarət mərkəzlərindən biri.

Ə h i r a n, ə h i r a – Yerusəlim (Beytül-müqəddəs) yaxınlığında qəsəbə. Guya İsa burada bir korun gözlərinə şəfa vermişdir. Süleyman peyğəmbərin paytaxtı.

Ə h m ə d i-H ə n b ə l i – Sünnülərin hənbəli məzhəbinin başçısı.
Ə h m ə d i-M u x t a r – Məhəmmədin ləqəblərindən biri.
Ə h r i m ə n – Atəşpərəstlərin şər allahı.
Ə h s ə n ü l-q ə v a i d – XIX əsrin ikinci yarısında tərəqqipərvər Azərbaycan yazıçı və jurnalisti, "Əkinçi" əməkdaşlarından Əsgər ağa Gorani Adıgözəlovun ləqəbi.
Ə x s i t a n – XII əsr Gəncə hökmdarı.
Ə k b ə r v ə Ə s ğ ə r – İmam Hüseynin oğlanlarıdır. Hər ikisi Kərbəlada öldürülmüşlər.
"Ə k i n ç i" – H.Zərdabinin 1875-c ildə nəşr etdirdiyi qəzetin adı.
Ə l i f-l a m – Quranın I surəsinin başlanğıcı.
Ə l i y y i-İ m r a n – (Əli ibn-Əbu Talib) – Dördüncü xəlifə, Məhəmmədin əmisi oğlu və kürəkənidir. Hicrətdən 23 il əvvəl Məkkədə doğulmuşdur. Alim, şair və dövlət xadimi imiş. "Nəxcülbəlağə" adlı fəlsəfi əsəri və "Divani-Əmir" adlı şerlər kitabı məlumdur. Hicri 41-ci ildə Əbdürrəhman ibn-Mülcəm tərəfindən 64 yaşında, Kufə məscidində öldürülmüşdür.
Ə m ə q – (Əməqi-Buxari) – XI əsr Səlcuqilər dövründə yaşamışdır. İki bəhrdə oxunan "Yusif və Züleyxa" adlı əsəri var. Ömrünün sonlarında (təxminən yüz yaşlarında) Sultan Səncərin qızı Mahmülkün vəfatı münasibətilə mərsiyə yazıb oğlu Həmidi ilə Sultana göndərir. Bu mərsiyə dövrün şairləri tərəfindən son dərəcədə yüksək, qiymətləndirilir. Hicri 540-cı ildə Buxarada vəfat etmişdir.
Ə n ə s – B a x: Sənan ibn-Ənəs.
Ə n v ə r i – XI əsr şairi. Firdovsinin müasiri olmuşdur. Soltan Mahmud Qəznəvi sarayının şairlərindən biri olan Ənvərinin qəsidələri məşhurdur.
Ə r a f – Dini təlimə görə cənnətlə cəhənnəm arasındakı çöl.
Ə r b a b i-S ə f a – "Beytüs-Səfa" məclisinin üzvlərinə işarədir.
Ə r c a s i b – Firdovsinin "Şahnamə" əsərinin qəhrəmanlarındandır.
Ə r ə s. Araz çayı.
Ə r j ə n g i-M a n i – Maniyi-Çininin bir əsərinin adı.
Ə s ə d – Şir bürcü.
Ə s k ə r – XI imam Həsən Əskəriyə işarədir.
Ə s ğ ə r – Əbubəkrin ləqəbi.
Ə ş ə s – İslamiyyətdən əvvəl Ərəbistanda tamahkarlığı ilə tanınmış bir xəsis. Ərəb folklorunda "Əşəsi-təmma" adı ilə məşhurdur.
Ə ş k b u s – Firdovsinin "Şahnamə" əsərinin qəhrəmanlarındandır.
Ə z r ə q – (Əzrəqi-Şami) – Kərbəlada imam Həsənin oğlu Qasimi öldürən pəhlivan.
Ə z ü d ü d-D ö v l ə – (Əbu Mənsur bin-Mədud-Dövlə) – Hicri 356-cı ildə atası öldükdən sonra İraqa hakim təyin olunmuşdur. Xəlifə Taye billahın

qızı Şahzaman xanımı almışdır. Rəvayətə görə o qədər qüvvətli olmuşdur ki, hətta vəhşi heyvanları belə ram edərmiş. O, 367-ci ildə müharibədə öldürülmüşdür.

F a r u q – Xəlifə Ömərin ləqəbi.

F a z i l i-Ş i r v a n – XIX əsrdə Şirvanda öz dərin bilik və məlumatı ilə şöhrət qazanmış Seyid Əli ağa.

F ə x r i-R a z i – (Fəxrəddin Razi) – fiqh, kəlam, təfsir, ədəbiyyat, hikmət, tibb, riyazi elmlər və s. bilicisi, 85 cildlik böyük elmi əsərin müəllifi. Hicri 544-cü ildə Rey (Tehran) şəhərində doğulmuş, 606-cı ildə Heratda vəfat etmişdir.

F ə l ə k i – Əbu Nəzzam Cəlaləddin Məhəmməd Fələki Şirvani (1108-1146) Əbül-Üla Gəncəvi ədəbi məktəbinin istedadlı nümayəndələrindən biri. Dövrünün böyük münəccimi olan Fələki nücuma aid bir kitab da yazmışdır. Görkəmli bir sənətkar kimi Şirvanşahlar sarayına dəvət edilmiş, tez bir zamanda saraydan qovulub, zindana salınmışdır. Zindanda “Həbsiyyə” adlı bir əsər yazmışdır. Zindan həyatı onun səhhətini pisləşdirmiş, 38 yaşında ölmüşdür.

F ə n a – Mirzə Rəhim Fəna (1841-1929) – Görkəmli şair; Şuşada Hacı Abbas Agahın evində “Məclisi-Üns” ədəbi məclisinin təşkilatçısı. Fatima xanım Kəminəni həcv etdiyi üçün Seyid Əzim onu kəskin həcv etmişdir.

F ə r a m ə r z – “Şahnamə” əsərinin qəhrəmanlarından biri.

F ə r a t – Kərbəla səhrasından axan çay.

F ə r ə z d ə q – (Əbu Nüvas Həmmam ibn-Ğalib) – VII əsrin sonu və VIII əsrin əvvəllərində Kufədə yaşamış böyük ərəb şairi. Hicri 110-cu ildə Kufədə vəfat etmişdir. Qəsidə və mədhləri, lətifə və digər şerləri məşhurdur. Əbdül Məlik ibn-Mərvan dövründə Məkkədə Kəbəni ziyarətə gedir. Həmin gün imam Zeynalabdin va Mərvanın oğlu Hüşam da orada imiş. İmam “Həcərül-Əsvəd”ə yaxınlaşdıqda, xalq ehtiram əlaməti olaraq ona yol verir. Hüşamın adamları bu hörmətli cənabın kim olduğunu ondan soruşduqda Hüşam qəsdən cavab verir ki, tanımıram. Bunu görən Fərəzdəq bədahətən imam Zeynalabdini mədh edən bir qəsidə söyləyir. Ona görə Hüşam Fərəzdəqi həbs etdirir. İmam isə mədhin müqabilində Fərəzdəqə 12 min dirhəm pul göndərir. Fərəzdəq “Mən pul üçün mədh etmirəm” – deyir. Cavabında imam: “Biz verdiyini geri almayan bir xanədana mənsubuq” – deyə pulu qəbul etdirir.

F ə r h a d M i r z ə – Nəsrəddin şah Qacarın əmisi, məşhur “Zənbil” əsərinin. ingiliscə-farsca lüğətin müəllifi, görkəmli ədib və riyaziyyatçı.

F ə r q ə d a n – Böyük Ayı bürcü sistemində ulduz.

F ə z l i-Ə c ə m – XII əsr Azərbaycan klassiki Əfzələddin Xaqaninin ləqəbi. Ona bəzən “Həssaniəcəm” də deyilir.

F i r i d u n – “Şahnamə” əsərinin qəhrəmanlarından biri.

F o n d e l k i – (Fondelkin) – S.Ə.Şirvaninin vaxtında Şamaxıda vəkil olmuşdur.

G a v ə – Firdovsinin "Şahnamə" əsərinin qəhrəmanlarından biri.

G u r g i n – Firdovsinin "Şahnamə" əsərinin qəhrəmanlarından biri.

"G ü l ş ə n i-r a z" – Şeyx Mahmud Şəbüstərinin əsərinin adıdır.

"G ü l ü s t a n" – Sədinin məşhur əsəridir.

"G ü r b ə v ü m u ş – Məşhur fars şairi Übeyd Zakaninin əsəridir ki, S.Ə. Şirvani Azərbaycan dilinə tərcümə etmişdir.

H a c ə r – İsmayıl peyğəmbərin anası.

H a c ı Ə b d ü l h ə m i d – Məhəmməd Əfəndidən sonra Tiflisdə Zaqafqaziya müsəlmanlarının müftisi.

H a c ı Ə h ə d – XIX əsrdə yaşamış Şamaxı dövlətlilərindəndir. Şairin yaxın dostu olmuşdur.

H a c ı K a m al o ğ l u T a ğ ı – Şairin müasiri, ruhani və dünyəvi elmlərdən xəbərdar bir şəxs imiş.

H a c ı M o l l a A b d u l l a – Şahtaxtlı, görkəmli Azərbaycan şairi və dramaturqu Hüseyn Cavidin atası; şair, xanəndə və mərsiyəxan olmuşdur.

H a c ı S ə i d – bax: Səid.

H a d i – Həsən Qara Hadi, XIX əsr Qarabağ şairi.

H a r u n – Harun-ər-Rəşid (763-809)-Abbasi xəlifələrindən beşincisidir. Onun dövründə elmə, ədəbiyyata xüsusi əhəmiyyət verilmişdir. "Elmi-Haruni" ifadəsi də həmin məsələyə işarədir. "Min bir gecə" adlı məşhur ərəb nağılının qəhrəmanıdır.

H a r u t v ə M a r u t – Əfsanəvi mələk adları.

H a t ə m – (Hatəmi-Tai) – İslamiyyətdən əvvəl yaşamış və öz səxavəti ilə məşhur olmuş bir ərəb varlısı.

H ə c c a c – Əməviyyə dövlətinin ən qəddar əmirlərindən olan Həccac ibn-Yusif əs-Səqəfi hicri 41-ci ildə Məkkənin yaxınlığındakı Taif qəsəbəsində doğulmuşdur. 75-ci ildə Hicaz və İraqa vali təyin edilmişdi. İşğalçı müharibələr nəticəsində böyük bir ölkəyə sahib olan Həccac 20 illik hakimiyyəti dövründə rəvayətə görə, 120 min kişi öldürmüş, 50 min kişi həbs etmişdir. 95-ci ildə 54 yaşında ölmüşdür.

H ə c ə r ü l Ə s v ə d – Kəbə məscidindəki məşhur daşın adı. Lüğəvi mənası: qara daş.

H ə c i r – "Şahnamə" qəhrəmanlarından biri.

H ə l ə t a – Quranda "Dəhr" surəsinin (Əli haqqında) başqa adı.

H ə m ə l – I bürcün adı.

H ə n c ə r e y i-D a v u d – Davud peyğəmbərin gözəl səsi varmış. Musiqinin də əsasını guya o qoymuşdur. "Həncəreyi-Davud" (Davudun boğazı), buna işarədir.

H ə s a r – 1.muğam adı; 2.qədim Dərbənd şəhərinin məşhur hasarı.

H ə s ə n Ç ə p – S. Ə. Şirvaninin vaxtında Şamaxıda görkəmli xanəndələrdən biri.

H ə s s a n i-Ə r ə b – VII əsrdə Məkkədə yaşamış məşhur ərəb şairə Həssan ibn-Sabit. Qədim ərəb şerinin inkişafında böyük iş görüb ona yeni istiqamət verən sənətkar.

H ə z r ə t i-B i b i – VII imam, Museyi-Kazimin qızı Hökumə xatun; rəvayətə görə, qəbri Bakıda Bibi-Heybət qəbristanındadır.

H i c a z – 1.Səudiyyə Ərəbistanı; 2.Muğam adı.

H ö r m ü z – (Yaxud Hörmüzd) – İranın Sasani sülaləsinin üzvlərindən dörd nəfərin adıdır. Birinci: sülalənin üçüncü hökmdarı olub 271-ci ildə atası Şahpur ibn-Ərdəşirin taxtına oturmuş, bir il hökmranlıq sürmüşdür; ikincisi: 303-cü ildə taxta oturmuş, 311-ci ildə vəfat etmişdir. Üçüncü Hörmüz Sasanilərin 16-cısı olmuşdur. Atası Yəzdcürdün taxtına 457-ci ildə oturmuşdur. Nəhayət, dördüncü Hörmüz Nuşirəvanın oğludur. 579-590-cı illərdə hökmranlıq sürmüşdür.

H u ş ə n g – "Şahnamə" qəhrəmanlarından biri.

H u t – XII bürcün adı.

H ü l a k u – XIII əsrdə Azərbaycanda Elxanilər dövlətini təsis etmiş və özü bu dövlətin ilk hökmdarı olmuşdur (1256-1265). Marağa rəsədxanası onun dövründə tikilmişdir.

H ü m a y i – XIX əsr Qarabağ şairidir.

H ü s e y n Q a y ı b o v – XIX əsrin sonlarında Zaqafqaziya müftisi olmuşdur. S. Ə. Şirvaninin dostu və məsləkdaşıdır. Onun tərtib etdiyi müntəxəbatda Vaqif, Zakir, Seyid kimi sənətkarlarla yanaşı, divanı olmayan, az tanınan şairlərin də əsərləri toplanmışdır. Qayıbov əsərlərin bəhrini müəyyənləşdirib, hər şerin üstündə təfilələrini də yazmışdır. S. Ə. Şirvani Qayıbova həsr etdiyi qəsidəni 1876-cı ildə yazmışdır.

X a q a n – Çində və İranda hökmdar titulu.

X e y b ə r – Ərəbistanda qala. Əli bu qalanı fəth etmişdir.

X ə l i l – "Nəməkdani-şüəra" ləqəbi qazanmış Dərbənd şairi.

X ə l i l x a n ə s i – Kəbəyə işarədir.

X ə l i-R e y h a n – Ərəb əlifbası ilə xətt növü.

X ə v ə r n ə q – Hirə vilayətində məşhur bir qəsr. Bir rəvayətə görə, Neman, digər bir rəvayətə görə Yəzdcürdün əmrilə Simnar adlı memar tikmişdir. Dünyanın ən qədim və gözəl qəsrlərindən biri olan Xəvərnəq haqqında ərəb şairləri gözəl şerlər yazmışlar.

X ə z r ə c – Mədinədə Məhəmmədə kömək edən bir qəbilə.

X u d a d a d – XIX əsr Azərbaycan şairi Abdulla bəy Asinin kiçik qardaşı.

X u l l ə r – Saf şərabı ilə məşhur olan yerdir.

X u n i-O s m a n – (Dəmi-Osman, Osman qanı) – üçüncü xəlifə Osman üsyan edib onu öldürməyə gələnlərdən qorunmaq üçün Quranın vərəqlərini ətrafına düzür. Üsyançılar buna baxmayaraq onu öldürürlər. Osmanın qanı həmin vərəqlərin üstünə tökülür. Hazırda o vərəqlər Türkiyə muzeyindədir.

" X ü l a s ə" – Ağa Bağır Məclisinin fiqhə dair yazdığı "Xülasətül-əxbar" adlı əsərinə işarədir.

İ b n-X ə t t a b – III xəlifə Ömərə işarədir.

İ b n-Z i y a d – Kərbəla səhrasında Hüseynə qarşı vuruşan Kufə hökmdarı.

İ b r i d i l i – İbranilər Fələstinin qədim tayfalarındandırlar. Monoteizm (vəhdaniyyət) ideyasını ilk dəfə bu tayfa irəli sürmüşdür. Yəhudilərin dini kitabı olan "Tövrat" ibri dilində yazılmışdır.

İ d r i s – İlk dəfə məktəb bina edən peyğəmbər.

İ q l i d i s – Eramızdan əvvəl, 320-ci ildə yaşamış məşhur yunan riyaziyyatçısı Evklid.

İ l y a s – (Xızır, Xıdır İlyas)-Dini ədəbiyyatda əbədi yaşayan, ölməz peyğəmbər kimi təsvir olunur.

İ m a m i-Ə z ə m – Sünni məzhəbinin ən böyük müctəhidi imam Əbu Hənifənin ləqəbi.

İ m a m-C ə f ə r – XI imam Cəfəri Sadiq.

İ n c i l – Xaçpərəstlərin müqəddəs kitabı.

İ n c i l i-L u q a – (Lukas) – Dörd "İncil"dən birini yazan məşhur ruhani.

İ r ə m – Mövhumi cənnət bağı.

İ s f ə n d i y a r – Firdovsinin "Şahnamə" əsərinin qəhrəmanlarından biri.

İ s h ə q – İshaq, peyğəmbər.

İ z z ə t d i n – İzzətdin Şirvani, XII əsr görkəmli Azərbaycan şairi. Uzun müddət Şirvanşah Mənuçöhrün sarayında yaşamışdır. Şaha xoş gəlməyən şerlər yazdığı üçün saraydan kənar edilmişdir.

"K a v k a z" – 1846-cı ildən başlayaraq Tiflisdə rus dilində çıxan qəzet.

K e y d i-i x v a n – Qardaşların hiyləsi; qardaşlarının Yusifi aldadıb quyuya salmalarına işarədir.

K e y x o s r o v – Firdovsinin "Şahnamə" əsərinin qəhrəmanlarından biri.

K ə m i n ə – Fatimə xanım Kəminə (1840-1896) – "Məclisi-fəramuşan" ədəbi məclisinin üzvü.

K ə n a n – Suriya və Fələstinin bir hissəsi də daxil olmaqla qədim bir ölkə olmuşdur.

" K ə n z" – XV əsrdə yaşamış Məhəmməd ibn-Əbdül-xaliq Gilani tərəfindən yazılan "Kənzül- Lüğət" (lüğətlər xəzinəsi) adlı lüğət kitabı.

K ə r i m b ə y – S.Əzimin dostu Kərim bəy Şıxəlibəyov. Şamaxının prokuroru olmuşdur.

K ə s r a – Kəsrəvilər xanədanına mənsub olduğu üçün Nuşirəvana verilən addır. Hekayədə təsvir olunan bina isə onun tikdirdiyi “Taqi-Kəsra” sarayıdır.

K ə ş t i y i-N u h – Dini rəvayətə görə, guya vaxtilə dünyanı su basmış, Nuh adlı peyğəmbər böyük bir gəmi düzəltmiş, öz ümmətini tufandan xilas etmişdir.

K ə y u m ə r s – Firdovsinin “Şahnamə” əsərinin qəhrəmanlarından biri. İranın ilk hökmdarı olmuşdur.

K i r m ə g i-ş ə b t a b – Gecə işıq saçan bir qurddur ki, Süheyl ulduzunun işığından belə öz işığını itirir. (Yəni ən zəif işıq saçan).

K u d ə r z – Firdovsinin “Şahnamə” əsərinin qəhrəmanlarından biri.

Q a a n i – XIX əsr fars şairi.

Q a f i l – Ələkbər Qafil (1818-1891) – Şamaxıda “Beytüs-Səfa” ədəbi məclisinin üzvü.

Q a n u n – Musiqi aləti.

Q a r u n – Eramızdan əvvəl yaşamış varlı, xəsis və qəddar bir hökmdar olmuş, əfsanəyə görə Musanın qarğışı ilə yerə batmışdır. Musa peyğəmbərin xalası oğludur.

Q a s i m  o t a ğ ı – İmam Həsənin oğlu Qasim Kərbəla müharibəsi dövründə əmisi Hüseynin qızına nişanlanmışdı. Onun toy otağına işarədir.

Q a s i r – Mirzə İsmayıl Qasir (1805-1897) – əslən şamaxılı olub, bir müddət Lənkəranda “Fövcül-füsəha” ədəbi məclisinə başçılıq etmişdir.

Q e y s ə r – Rumda hökmdar titulu.

Q ə n b ə r – Əlinin nökəri.

Q i s s e y i-x ə r g u ş – “Kəlilə və Dimnə” kitabındakı dovşanın heka-yəsinə işarədir.

Q ö v m i-q i b t i – Qədim Misir xalqı.

Q ö v s – IX bürcün adı.

Q u b a r i – Ərəb xətt növü.

Q ü l z ü m – Dəniz deməkdir.

Q ü r r a i-s ə b ə – “Quran”ı qiraətlə oxuyan qarelər.

L a t  v ə  m ə n a t – Müsəlmanlıqdan əvvəl Məkkədə olan ən böyük butlər.

L e y l ə t ü l-q ə d r – (Qədr gecəsi) – Quran rəvayətinə görə, ilk ayənin Məhəmmədə nazil olduğu gecə.

L ə h n i-H u d i – Dəvənin yorulmaması üçün dəvəçilərin oxuduqları nəğmənin adı.

L ə m y ə z ə l – Allaha işarədir.

L ə y y a – (Lia)-Yusifin ögey anası.

L u t – Peyğəmbərlərdən biri.

M a h m u d i-x u d a – Məhəmmədə işarədir.

M a r i  Z ö h h a k – Firdovsinin "Şahnamə" əsərində təsvir edilir ki, öz qaniçənliyi ilə məşhur olan Zöhhakın çiyinlərindən ilan çıxıbmış; bu ilanların qidası insan beyni imiş. Hər gün iki gənci öldürüb beyinlərini ilanlara yedirirmişlər. Dəmirçi Gavənin də oğlunu apardıqda o, üsyan etmişdir.

M e h d i – XII imam.

M e h d i – S. Ə. Şirvaninin dostu, görkəmli musiqişünas və xanəndə.

M e y d a n – Şamaxıda məhəllə.

M ə c u n i-Z ə n c ə b i l – Xüşkbar qəbilindən bir məzədir. Qoz, şəkər və zəncəfildən ibarətdir.

M ə d i n ə – Məhəmmədin dəfn olunduğu şəhər.

M ə ə n (M ö n  i b n-Z a i d ə) – Səxavəti ilə məşhur olan bir ərəb zadəganı.

M ə h ə m m ə d  ə f ə n d i – Keçən əsrin ikinci yarısında Tiflisdə müfti vəzifəsində çalışmışdır. O, XVIII əsrin görkəmli şairi Molla Vəli Vidadinin nəvəsidir. 1867-1868-ci illərdə Şamaxıya gəlmiş, S.Ə.Şirvani ilə görüşmüşdür. Şair ona ithaf etdiyi qəsidəni təqdim etmişdir.

M ə h ə m m ə d  H ə s ə n – S.Ə.Şirvani dövründə şamaxılı Mahmud ağanın məclisinin xanəndəsi.

M ə h ə m m ə d  Q a c a r – (Ağa Məhəmməd şah Qacar) – İranda hökmranlıq sürən Qacar sülaləsinin üçüncü şahı. 14 il hökumət sürmüş, işğalçı müharibələr aparmış, 1797-ci ildə öldürülmüşdür.

M ə l i k  ş a h  S ə l c u q i – Əbülfəth Cəlaləddin Səlcuqların üçüncüsü və ən böyüyü olmuş, hicri 465-ci ildə 17 yaşında ikən, atası Alp Arslandan sonra məşhur vəzir Nizamülmülkün səyi nəticəsində taxta çıxmışdır. İşğalçı müharibələr aparıb, az zaman içərisində öz dövlətinin ərazisini genişləndirmişdir. Məlik şah həm də şair olmuşdur.

M ə n s u r – (Mənsur ibn-Həllac) – İranın Beyza şəhərindəndir. "Ənəlhəqq" (mənəm allah) şüarını yaydığı üçün xəlifə Müqtədir-Billahın əmri ilə hicri 306-cı ildə Bağdadda dara çəkilmişdir.

M ə r h ə b – Xeybər müharibəsində Əli tərəfindən öldürülmüş yəhudi pəhlivanı.

M ə r r i x – Mars planeti. Şərq şerində müharibə və qan rəmzi kimi işlədilir.

M ə r v a n – (Mərvan ibn-Həkəm) – III xəlifə Osmanın hiyləgər və xain vəziri. Xəlifənin adından saxta əmrlər verərək xalqı Osmanın üzərinə qaldırmış və nəticədə onun öldürülməsinə nail olmuşdur.

M ə s c i d i-ş a h – Gəncədəki Şah Abbas məscidinə işarədir.

M ə s i h a – İsanın ləqəbi.

M ə z h ə b i-C ə f ə r – İmam Cəfəri Sadiqin adı ilə bağlı olan dini məzhəb.

M ə z h ə b i-İ m a m i y y ə – Şiələrə işarədir.

M ə z h ə b i-İ s n a  Ə ş ə r i – Şiəlik məzhəbi.

M i n a – I: Məkkə yaxınlığında bir dağ; II: şərab şüşəsi.

M i r c ə f ə r – S.Ə.Şirvaninin oğlu, şair və müəllim olmuş, 1856-cı ildə doğulmuş, 1936-cı ildə vəfat etmişdir.

M i r o v o y s u d y a – Mülki işlərə baxan məhkəmə.

M i r z ə M ü s ə v v i r – XIX əsr Azərbaycan şairi. Bakıdakı "Məcməüş-şüəra" ədəbi məclisinin üzvlərindən biri. Eyni zamanda rəssam imiş.

M i r z ə R z a M ə f t u n – XIX əsr Azərbaycan şairi, Seyidin müasiri və dostu.

M i z a n – VII bürcün (Tərəzi bürcü) adı, ona Kiçik Ayı bürcü də deyilir.

M o l l a Ə h m ə d – XIX əsrin ikinci yarısında Qafqaz müsəlmanlarının şeyxül-islamı; XX əsr Azərbaycan yazıçısı və alimi Əli bəy Hüseynzadənin babası.

M o l l a F ə t u l l a h – (Kaşani) – Fiqhə aid bir neçə kitabın müəllifi.

M o l l a S ə d r a – (Şirazi)-Məşhur fiqh alimi.

M ö h k ə m – Burada Qurana işarədir. Quranın hökmlərinə "ayati-möhkəmat" deyilir.

M ö v l a n a – Məşhur "Məsnəvi" əsərinin müəllifi Cəlaləddin Rumiyə verilən ləqəb.

M u s a – VI imam Museyi-Kazimə işarədir.

M u s t a f a x a n – XVIII əsrdə Şirvan hakimi.

M ü ğ e y r ə – I: (İbn-Şöbə) – Müaviyə dövründə Kufənin hakimi; II: "Şahnamə" qəhrəmanlarından biri.

M ü x t ə s ə r – (Müxtəsərül-Məani) – Məşhur Şərq alimi S.Təftəzaninin "Müxtəsərül-Məani" adlı ərəbcə əsəri.

M ü n i r i – Ağa Dadaş Müniri (1862-1938) – Bakı şairlərindəndir. "Məcməüş-şuəra"nın üzvü olmuşdur.

M ü n k ə r və

M ü r t ə z a – İmam Əlinin ləqəblərindən biri.

M ü ş f i q – "Beytüs-səfa" ədəbi məclisinin üzvü.

M ü ş t a q – Əli Abbas Müştaq, "Məcməüş-şüəra ədəbi məclisinin üzvü.

M ü ş t ə r i – Yupiter planeti.

N a k a m – Sədrəddinbəyov İsmayıl bəy Nakam (1839-1906)-Şəkidə doğulmuş, orada da ölmüşdür. "Divani-bədi", "Gəncineyi-ədəb", "Leyli və Məcnun", "Fərhad və Şirin", "Xəyalati-pərişan", "Dörd əfəndi" və "Lətifənamə" adlı əsərlərin müəllifidir.

N a q e y i-S a l e h – (Salehin dəvəsi)-Qurandakı bir əhvalata işarədir.

N a q u s – Kilsələrdə çalınan böyük zəng.

N ə c ə f i-Ə ş r ə f – Bağdad yaxınlığında qəsəbə. İmam Əlinin qəbri oradadır.

N ə h v – Köhnə məktəblərdə tədris edilən ərəb qrammatikası (sintaksis).

N ə k i r – Qəbrdə guya sorğu-sual aparan mələklər.

N ə q l i – H ə m d u n ə – “Kəlilə və Dimnə” kitabındakı meymun hekayəsinə işarədir.

N ə m r u d – Dini rəvayətə görə, Babil hökmdarı Nəmrud İbrahim Xəlili mancanaq ilə tonqala atmışdır. Od yanıb qurtardıqdan sonra İbrahim Xəlil bir gülüstan içərisində görünmüşdür.

N ə s t u r – Xaçpərəstlərin Nəsturiyyə məzhəbinin banisi.

N ə v a – Muğam şöbəsi.

N i ş a b u r – İranın qədim şəhərlərindən biri. Məşhur şair və filosof Ömər Xəyyam bu şəhərdə doğulmuşdur.

N i ş a b u r u n-s a b a h ı – Nəğmə adı.

N i t q i-M ə s i h a – İsanın nitqi (nəfəsi) guya ölüləri dirildirmiş.

N o v r ə s – Mirzə Ələsgər Novrəs (1846-1918) – “Məclisi-fəramuşan”ın üzvü.

O m i r o s – Məşhur yunan şairi, qədim dünyanın ən böyük söz ustası, “İliada və Odissey” epopeyasının müəllifi Homer. Rəvayətə görə Homer kor olmuşdur. Yunan tarixçilərinin fikrincə yeni eradan min iki yüz il əvvəl Troya müharibələri dövründə yaşamışdır.

O s m a n – (Osman ibn-Əbu Abdullah Qüreyşi)-Üçüncü Xəlifə Osman hicri 24-cü ildə xilafətə oturmuş, Kufə və Bəsrə əhalisi tərəfindən 50 gün evində dustaq saxlanmışdır. Ona xəlifəlikdən istefa verməyi təklif etmişlər. Təklifi qəbul etmədiyi üçün 35-ci ildə, 82 yaşında qətl edilmişdir. Quranı tərtib etdirən Osman olmuşdur.

Ö h ö d d a ğ ı – Məkkənin yaxınlığında dağ. Öhöd müharibəsində Məhəmmədin iki dişini vurub salmışlar.

Ö m ə r – (Əbu Hifz Ömər ibn-Xəttab) – Hicrətdən 40 il əvvəl doğulmuş, 13-cü ildə xilafətə başlamış, 23-cü ildə öldürülmüşdür.

Ö m ə r S ə d – Azərbaycanı istila edən Səd ibn-Vəqqasın oğlu Ömər ibn-Səd Kərbəlada Hüseynə qarşı vuruşan qoşunun baş komandanı olmuşdur.

P a l i z b a n – Orta əsrlərdə geniş yayılmış bir nəğmə.

P ə n c g a h – Muğam adı.

“P ə r i ş a n” – XIX əsr məşhur İran şairi Qaaninin yazdığı “Kitabi-pərişan” əsərinə işarədir. Şairin müasirlərindən Hüseyn Qayıbov öz “Müntəxəbat”ında göstərir ki, S.Ə.Şirvaninin “Pərişannamə” adlı əsəri “Kitabi-pərişan”a nəzirədir. Qayıbovun göstərdiyi kitab ehtimal ki, Seyidin “Rəbiül-ətfal” əsəridir.

P ə r v i z – Sasanilərin XXII hökmdarıdır. Xosrov Pərviz Hörmüzün oğlu, Nuşirəvanın nəvəsidir. 590-cı ildə vəzir Bəhram Çubinin köməkliyi ilə

taxta oturmuşdur. Konstantinopolun imperatoru Morisin qızı Məryəmi almışdır. Şirin adlı bir qızla müaşiqəsi məşhurdur. 38 il hökumət sürdükdən sonra, 628-ci ildə oğlu Şiruyyə tərəfindən öldürülmüşdür. Nizami Gəncəvi "Xosrov və Şirin" əsərində Pərvizi bədii surət kimi göstərir.

P i r a n – "Şahnamə" qəhrəmanlarından biri.

P i r ə h ə n i-İ s m ə t – "Yusif və Züleyxa" dastanındakı bir hadisəyə işarədir.

P u ç i n – S.Ə.Şirvaninin vaxtında Şamaxıda dövlət məmuru olmuşdur.

P u l i-s i r a t – Dini təlimə görə qiyamətdə qıl kimi nazik, qılınc kimi kəskin bir körpüdür. Bütün insanlar o körpüdən keçəcəkdir. Günahkarlar keçə bilməyib cəhənnəmə yuvarlanacaqlar.

R a ğ i b – Qafar Rağib (1818-1892) – "Beytüs-Səfa" ədəbi məclisinin üzvü.

R a h i l – Yusifin doğma anası.

R a m e h – Ulduz adı.

R e y – Tehran şəhərinin keçmiş adı.

R ə h a v ə n d – Muğam şöbəsi.

R ə x ş – "Şahnamə" qəhrəmanı Rüstəmin atının adı.

R u d a b ə – "Şahnamə" qəhrəmanı Rüstəmin anası.

R u h ü l – Ə m i n – Cəbrayıla işarədir.

R u m – Qədim Vizantiyaya verilən ad. Bu imperiyanın bir hissəsi türklərin əlinə keçdikdən sonra türk dövləti və Kiçik Asiya da Rum adlanmağa başlamışdır.

R ü b a b – Musiqi aləti. Yunan əsatirində "Rəd və rəbab" adlı bir məhəbbət dastanı da məşhurdur.

R ü s t ə m – "Şahnamə"nin baş qəhrəmnı.

S a b i t – (Mirzə hadi Sabit) – "Məcməüş-şüəra"-nın ən müqtədir üzvlərindən biri.

S a d i q – XIX əsrdə Qarabağın Şuşa şəhərində məşhur tarzən və xanəndə. Tara əlavə simlər salıb onu təkmilləşdirmişdir.

S a l i k – Ağa Kərim Salik (1849-1914) – Bakıda "Məcməüş-şüəra" ədəbi məclisinin üzvü, musiqişünas.

S a r a – İshaq peyğəmbərin anası.

S a r ı t o r p a q – Keçmiş Şamaxının bir məhəlləsinin adı.

S e y y i d İ s m a i l – (Himyəri)-Görkəmli ərəb şairi, Əlinin yaxın dostu. Əli haqqında ilk qəsidəni o yazmışdır.

S e y y i d i – B a b – Babilik təriqətinin müəssisi Seyid Əli Bab.

S ə b a – (Səbayel, Şəhri-Səbayel, Gülzari-Səba və s.) – Bir çox tarixi mənbələrə görə, qədim Bakı şəhəridir. Hazırda Bayıl (Bayel) yaxınlığında dənizin içərisində Səba şəhərinin qalıqları saxlanılır.

S ə c a h – (binti Haris) – Məhəmmədin həyatının son günlərində peyğəmbərlik iddəası ilə başına dəstə toplayıb, müsəlmanlarla vuruşan cəsur bir ərəb qızı.

S ə d d i-İ s k ə n d ər – Məşhur Çin divarına işarədir.

S ə d ə r ə – Azərbaycanda kənd adı.

S ə d i-Ə k b ə r v ə S ə d i – Böyük və Kiçik ayı (şir) bürcü.

S ə f a – Məhəmməd Səfa (1851-1876) – S.Ə.Şirvaninin yaxın dostu olmuşdur. Ona bəzən Qara Məhəmməd də deyirmişlər. “Beytüs-Səfa” (Səfanın evi) ədəbi məclisi onun evində təşkil edilmişdi.

S ə h a h – X əsrdə yaşamış məşhur tacik alimi Əbunəsr İsmail Əlcövhərinin “Səhahül-Lüğə” adlı ərəb dilinə aid izahlı lüğəti.

S ə i d – “Ziya” qəzetinin naşiri Hacı Səid Ünsizadə. XIX əsrin ikinci yarısında Qafqaz müsəlmanlarının ruhani xadimlərindən biri.

S ə l m a n – Məhəmmədin yaxın adamlarından olmuşdur. Əvvəl atəşpərəst, sonra xaçpərəst olmuş, nəhayət, müsəlmanlığı qəbul etmişdir.

S ə n a n i b n-Ə n ə s – Kərbəlada imam Hüseyni öldürənlərdən biri.

S ə n t u r – Musiqi aləti.

S ə r ə t a n – Xərçəng bürcü, IV bürc.

S ə r f – Keçmişdə məktəblərdə tədris edilən ərəb qrammatikası (morfologiya).

S ə t t a r – XIX əsrdə Qafqaz və İranda məşhur xanəndə. Uzun müddət Tiflisdə yaşamışdır.

S i d d i q S i y a v u ş – “Şahnamə” əsərinin qəhrəmanlarından biri.

S i n a – Dini rəvayətə görə, Musanın allahla danışdığı dağın adı.

S i y a m ə k – “Şahnamə” əsərinin qəhrəmanlarından biri.

S ö h b a n – Məşhur ərəb fəsihi, natiq.

S ö h r a b – “Şahnamə” əsərinin qəhrəmanlarından biri.

S u l t a n i-N e y n ə v a – Neynəva (Kərbəla) səhrasında öldürülən imam Hüseynə işarədir.

S u l t a n i-S ə l u n i – Əliyə işarədir.

S u r – 11 bürcün adı.

S ü f y a n – Müaviyənin ulu babası.

S ü h a – Böyük Ayı bürcünə daxil olan ulduzlardan (yeddi qardaş) ən kiçiyinin adı.

S ü m b ü l ə – VI bürcün adı.

S ü n d ü s – Əfsanəyə görə, behiştdə möminlərin geyəcəkləri paltar.

S ü p e h r i – Mirzə Cəbrayıl Süpehri, XIX əsrdə Dərbəndin görkəmli şairlərindən biri.

S ü r ə y y a – I: Ülkər ulduzu; II: Ağa Dadaş Sürəyya (1850- 1900) -Bakıda “Məcməüş-şüəra”nın üzvü.

Ş a h x ə n d a n – XIV əsr Azərbaycan ədəbiyyatının böyük sənətkarı İmadəddin Nəsiminin qardaşıdır. Qəbri Şamaxıda öz adına olan qəbristandadır. S.Ə.Şirvani öz vəsiyyətinə görə (Mən öləndə "Şaxanda" dəfn eyləyin; Çünki onun şahidi-xəndanı var) həmin qəbristanda dəfn edilmişdir.

Ş a h X ə t a i – 1. Şah İsmayıl Xətai; 2. Muğam adıdır.

Ş a h i-B ə q ə r r ə – Əlinin ləqəblərindən biri.

Ş a h i-B ə t h a – Məhəmmədin ləqəbidir.

Ş a h i-Ə b r a r – Məhəmmədin ləqəbidir.

Ş a h i-L a f ə t a – Məhəmmədin Əli haqqında dediyi "la fəta illa Əli, la seyfə illa Zülfüqar" (Əli kimi oğul yoxdur, Zulfüqar kimi qılınc) tərifinə işarədir.

Ş a x i-B ə q ə m – Qırmızı boyaq ağacına deyilir.

Ş e y x  S a l a h – Dağıstanda Dərbənd yaxınlığında yer adıdır.

Ş e y x i – Şeyx Əhmədi-Ehsainin təsis etdiyi təriqətin adıdır.

Ş e y x i-Ş ə b ü st ə r – (Şeyx Mahmud Şəbüstəri – 1291-1324) – Görkəmli Azərbaycan şairi, alimi, filosofu və mütəfəkkiri, "Gülşəni-raz", "Səadətnamə", "Şahidnamə", "Həqqül-yəqin" (nəsr), "Miratül-mühəqqiqin" və s. əsərlərin müəllifidir. Avropada XVII əsrdən sonra "Gülşəni-raz" əsəri ilə tanınmağa başlamışdır.

Ş e y s – Adəmin oğludur.

Ş ə d d a d – (İbn-Əmləq) – Eramızdan əvvəl, Yəməndə allahlıq iddiası edən bir hökmdar olmuşdur.

Ş ə h l a n – Dağ adıdır.

Ş ə r a y i-Y ə m a n i – Parlaq bir ulduzun adıdır

"Ş ə r h i-M ü t ə v v ə l" – Təftazaninin əsəri. Uzun (böyük) olduğu üçün Şərq şerində uzun saç onunla müqayisə edillr.

Ş ü a i – (Mirzə Kərim Şüai) – Dərbənd şairi.

Ş ü m r – Kərbəlada Hüseynin başını kəsən şəxs.

Ş ü r e y h – Yəzid ibn-Müaviyə dövründə yaşamış məşhur Dəməşq qazisidir. O, Yəziddən aldığı yüksək məbləğ müqabilində imam Hüseynin qətlinə fitva vermişdir.

Şəhi-Xümmi-Qədir – Məhəmmədə işarədir.

T a l u t – Bəni-İsrailin ilk hökmdarı.

T a r x a n o v – Konstantin Tarxan-Mouravov-XIX əsrin ortalarında Qarabağda mahal rəisi vəzifəsində işləmişdir. Q.Zakirin faciəsinə səbəb olanlardan biridir.

"T a r i x i-N a d i r – ("Tarixi-Nadiri") – Nadir şahın və Mirzə Mehdi xan Astarabadinin fars dilində yazdığı əsər.

Ta h a – Quranda Əlini tərif edən surənin adı.

T ə k y ə – Şirvan mahalında yer adı.

T ə q i y e v – Bakı sərvətdarı Hacı Zeynalabdin Tağıyev.

"T i b y a n" – Türkcə yazılmış bir təfsirin adı.

"T i f l i s s k i  v e s t n i k" – S.Ə.Şirvani dövründə Tiflisdə nəşr olunan qəzet. Şairin bir neçə şeri rus dilinə tərcümə edilərək, bu qəzetdə dərc edilmişdir.

T i ğ i-D ü s ə r – Əlinin qılıncına işarədir.

T u b a – Dini rəvayətə görə, cənnətdə çox kölgəli bir ağacın adı.

Ü s u l i-k a f i" – Fiqhə aid kitabdır.

Ü v e y s i-Q ə r ə n i – (Bin-Amir) – Yəməndə öz müqəddəsliyi ilə məşhur olmuşdur. Ömrünün sonlarında müsəlmanlığı qəbul etmiş və Süffeyn haribəsində öldürülmüşdür.

Ü z z a – Kəbədə olan bütlərdən birinin adı.

V ə k i l i – M. F. Axundovun "Əkinçi" qəzetində dərc etdirdiyi naməlum məqalələrindəki gizli imzası.

V ə z i r o v – Nəcəf bəy Vəzirov (1854-1926) – məşhur Azərbaycan dramaturqu, hekayənəvisi, maarifçisi.

Y ə c u c  v ə  M ə c u c – Rəvayətə görə çapqınçılıqla məşğul olan tayfalar.

Y ə h y a – Peyğəmbərlərdən biri.

Y ə x ə s ə r – Sərin su deməkdir.

Y ə r ə q a n i – Xəstəlik adı (sarılıq).

Y ə s r i b – Məkkənin əsil adı.

Y ə z d c ü r d  p a d ş a h ı n ı n  q ı z ı – İmam Hüseynin arvadı, Əli Əkbərin anası Ümmi-Leylaya işarədir.

Y u x a v i – Musa peyğəmbərin anası.

Y u n i s – Peyğəmbərlərdən biri.

Y u s i f – Mirzə Əbdülxalıq Yusif (1853-1924) – Bakıda "Məcməüş-şüəra" ədəbi məclisinin görkəmli üzvlərindən biri.

Z a b i l – 1-ci: "Şahnamə" qəhrəmanı Rüstəmin vətəni; 2-ci: muğam adı.

Z a d e y i-m ü f t i – Müfti Hüseyn Əfəndi Qayıbova işarədir.

Z e y n ü l-İ b a d – İmam Hüseynin oğlu Zeynalabdin Kərbəlada xəstələndiyi üçün "Bimari-Kərbəla" ləqəbi ilə məşhur olmuşdur.

Z ə b u r – Davud peyğəmbərin kitabının adı.

Z ə h r a – Məhəmmədin qızı, Əlinin arvadı, Həsən və Hüseynin anası olan Fatimənin ləqəbi.

Z ə n d – "Avesta"ya işarədir.

Z ə r d ü ş t – Atəşpərəstlərin peyğəmbəri və atəşpərəstlik dininin müəssisi.

Z i n d ə r u d – (Yaxud Zayəndərud) – İranın İsfahan və Yəzd əyalətləri arasında böyük bir çaydır. Adından məlum olduğu kimi (Diri çay, Dirilik çayı)

bu çay ətrafında yaşayanların həyat mənbəyi olmuşdur. I Şah Abbas dövründə üstündən böyük körpü salınmışdır.

“Z i y a” – 1879-1880-cı illərdə Tiflisdə S.Ünsizadənin redaktorluğu ilə çap edilən qəzet. Sonralar “Ziyayi-Qafqaziyyə” adı ilə çap edilmişdir.

Z ö h h a k – Firdovsinin “Şahnamə” əsərinin qəhrəmanlarından biri.

Z ö v i – Mirzə Mahmud Zövi, “Beytüs-səfa” ədəbi məclisinin üzvü.

Z ü h ə l – Ulduz adı.

Z ü h u r i – Ağababa Zühuri (1848-1892)-Şamaxıdakı “Beytüs-səfa” məclisinin üzvü.

Z ü l c ə n a h – İmam Hüseynin atının adı.

Z ü l f ü q a r – İmam Əlinin qılıncının adı.

# KİTABDAKILAR

RƏBİÜL-ƏTFAL

